Tərtib edəni və
ön sözün müəllifi: **Zaman Əsgərli**

Redaktoru: **Bəkir Nəbiyev**

**894.361008-dc21**
**AZE**
**XIX əsr Azərbaycan şeri antologiyası**, Bakı, "Şərq-Qərb", 2005, 424 səh.

Qədim və spesifik mənəvi mədəniyyətlərin bir çoxunun öz saflığını və billurluğunu itirdiyi XIX əsr Azərbaycanın bədii mədəniyyəti tarixində ideya-estetik nailiyyətləri ilə seçilən bir mərhələdir. Klassik irsin yaşarı ənənələri zəminində inkişaf edən, eyni zamanda bədii keyfiyyətlərinə görə özünəməxsus bir hadisə olan, təzə, orijinal ədəbi forma və janrlarla zəngin XIX yüzil Azərbaycan ədəbiyyatında bununla yanaşı aparıcı yeri, qədim və orta əsrlərdə olduğu kimi, hələ ki yenə poeziya tutulur. Lakin onun yeni istiqamətdə inkişafı artıq əsrin əvvəllərində ictimai-siyasi və mədəni həyatda baş vermiş mühüm dəyişikliklər şərtləndirir.

Təqdim olunan "XIX əsr Azərbaycan şeri antologiyası"nda həmin dövrdə yaşayıb-yaratmış 60-dan artıq şairin əsərlərindən seçmələr toplanmışdır. Nümunələr tarixi-xronoloji prinsip əsasında düzülmüşdür.

**ISBN 9952-418-69-5**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## XIX ƏSR AZƏRBAYCAN POEZİYASI

Zəngin və çoxəsrlik tarixi olan Azərbaycan bədii mədəniyyətinin ideya-estetik nailiyyətlərlə seçilən mərhələlərindən biri XIX əsrdir. Yeni tarixi şəraitin inikası kimi yetişən bu ədəbiyyat klassik irsin həmişəyaşar ənənələri zəminində yaranıb inkişaf etmiş, həm xronoloji hüdudlarına, həm sosial-fəlsəfi məzmununa, həm də bədii keyliyyətlərinə görə tamam orijinal və özünəməxsus bir hadisə olmuşdur.

Əsrin ilk illərindən ictimai-siyasi həyatda baş verən əsaslı dəişikliklər, Azərbaycanın şimal hissəsinin Rusiya tərəfindən işğal olunması ölkənin mədəni həyatına, o cümlədən ədəbi-estetik fikrin inkişafına da təsir göstərdi. Azərbaycan ziyalılarının - şair və yazıçıların Qərbə, Avropaya marağı gücləndi. Bu isə öz növbəsində bədii ədəbiyyatda xəlqiliyin, həyatiliyin, sosial pafosun güclənməsinə səbəb oldu. Onun mövzu dairəsi genişləndi, ictimai-siyasi məzmunu dolğunlaşdı. Bədii təcrübədə təzə, orijinal ədəbi forma və janrlar yarandı.

XIX əsr ədəbiyyatı özündən əvvəlki və sonrakı dövrlərin ədəbiyyatından təkcə ideya-məzmun əlvanlığına görə yox, həm də həyatı bədii əksetmənin forma və üsullarına, metod, üslub keyfiyyətlərinə, bütövlükdə ideya-estetik sisteminə - poetikasına görə seçilir. Klassik ədəbi janrlar (qəzəl, qəsidə, rübai, müxəmməs) bu dövrdə güclü təkamül prosesi keçirir, bədii dil əvvəlki dövrlərdən fərqlənən yeni bir inkişaf məcrasına düşür. Nəsr, dram üslubları, publisistika meydana gəlir.

Qədim və orta əsrlərdə olduğu kimi XIX əsrdə də ədəbiyyatda başlıca yeri poeziya tuturdu. O, üç mühüm ideya-üslubi istiqamətdə davam və inkişaf edirdi: lirika, epik şeir və realist satira. Bu üç xətdən ən qüvvətlisi lirika idi. Əsrin birinci yarısında fəaliyyət göstərmiş Zakir, Bakıxanov, Vazeh, Nəbati, Heyran xanım, daha sonralar Şükuhi, Bixud, Bahar, Seyid Əzim, Natəvan, Kəminə, Nakam, Sərraf kimi şairlər öz əsərlərində insanın mənəvi dünyasının, təbii hiss və duyğularının, sevinc və həyəcanlarının təsvir və tərənnümüno geniş yer verirdilər.

Onların yaradıcılığında məhəbbət mövzusu xüsusi yer tuturdu. Nizami, Füzuli, Saib, Vaqif kimi klassik sənətkarların yaradıcılıq ənənələrini davam etdirən XIX əsr şairləri insan həyatında məhəbbətin rolunu yüksək qiymətləndirir, ona dərin fəlsəfi məna verirdilər. Həyatın ləzzətini, insan bəxtiyarlığını təmiz məhəbbətdə görən Nəbati bir qəzəlində "baisi-icadi-aləm ta ki bildim, eşq imiş" - deyə məhəbbəti hətta dünyanın, aləmin yaradıcısı hesab

edirdi. Təmiz sevgini ən qiymətli nemət sayan şair göstərirdi ki, "eşq camından içən kimsənə" qorxu bilməz, var-dövlət hərisliyindən əl çəkər, kasıblığına təəssüflənmədən, sinəsinə çəkilən dağları sikkə, qızıl sayar, dinar dalınca düşməz.[1]

M.Ş.Vazeh isə saf eşqə məkan olan könülləri xoş, təmiz sevgiyə bağlı olan fikirləri düzgün və əbədi sayır, məhəbbətin dərdini, qəmini duya bilməyən, eşqdən xali ürəkləri susuz çeşməyə bənzədirdi:

Xoş olsun ol könül, eşqə məkandır,
Var olsun ol fikir, eşqə həyandır,
Susuz çeşməyə bənzər ol ürək kim,
Nə eşqin dərdini, nə qəm duyandır.

Əsrin birinci yarısında yazıb-yaradan şairlər kimi ikinci yarısındakı sənətkarların da şeirlərində məhəbbət nəcib insani hiss, yüksək bəşəri duyğu kimi tərənnüm olunur, aşiqlər ən kamil insan hesab edilirdi. Sevgini həyat mənbəyi kimi qiymətləndirən Seyid Əzim Şirvani yazırdı:

Hər bir könüldə eşq ola şadan edər onu,
Eylər xəzan olan çəməni növbahar eşq,
Hər kəsdə yoxdur eşq, onun, bil, kamalı yox;
Kamil olan vücudlar eylər şüar eşq.
Xalxali, Şükuhi, Natəvan, Kəminə.

Bixud, Nəvvab, Raci və Sərraf da məhəbbətin təsvir və tərənnümünə xüsusi yer verir, əsərlərində təmiz ürəklə sevən aşiqin mənəvi dünyasını, könül aləmini, keçirdiyi həyəcanları, ürək çırpıntılarını, məhəbbət uğrunda çəkdiyi iztirabları, sevgilinin ayrılığından doğan kədər duyğularını və s. geniş təsvir edirdilər. Onların sevgidən bəhs edən şeirlərinin mərkəzində həyat eşqi, yaşamaq ehtirası, dünyəvi nemətlərdən zövq almaq ideyası dayanırdı.

Məhəbbət lirikasının mərkəzində üç başlıca insan surəti, lirik qəhrəman var idi: Aşiq, Sevgili və Əğyar. Bu qəhrəmanların bədii təqdimi bir çox cəhətdən ənənəvi idi. Aşiq öz məbəbbəti uğrunda yorulmadan çalışan, fədakarlıq göstərən, bütün əzablara dözən, vüsala çatmasa da sevgilisindən üz döndərməyən vəfalı, sədaqətli, bütün varlığı ilə həyata bağlı olan vüqarlı və mətanətli bir gəncdir. Bəzən sevgilisinin biganəliyindən şikayətlənməsinə baxmayaraq, o, əzmli və iradəlidir; qarşılaşdığı mancələr onu doğru yoldan çəkindirmir, əksinə, məşuqəsindən gələn dövrü cəfalar ürəyindəki eşq atəşini daha da alovlandırır, onu sevgilisinə bağlayan mənəvi telləri möhkəmləndirir:

[1] Bax: Nəbati. Əsərləri. Bakı, 1988, s.303.

Müşgüldi, mən kənara düşəm kuyi-yardan,
Dişvardır ki, ət üzəm o gülüzardan.
*(Natəvan*)

Klassik poeziyanın lirik qəhrəmanı həyat gözəlliklərindən alman zövqü axirət səadətindən üstün tutur, cənnət vədlərini mənasız hesab edirdi. Bu ideya-bədii keyfiyyət XIX əsr şerində də qorunub saxlanmışdı. Belə ki, sevgiyə münasibətdə özünü Yusif, Vamiq, Sənan, Məcnun kimi klassik məhəbbət qəhrəmanları ilə müqayisə edən XIX əsr Aşiqi də məhəbbəti dini ibadətə, dünya gözəlini şəriət ehkamlarına qarşı qoyaraq sevdiyi qızın bir telini cənnətin huri qılmanlarına dəyişmir; o, sevgilisini huri, onun yaşadığı küçəni isə behişt sayaraq, maddi dünyadakı gözəlin fikri ilə "künci-bəladə lal oturmağı" behişt mələklərinin söhbətlərinə vermir:

Künçi-bəladə fikrin ilə lal oturmağı,
Qəsri-behiştdə, söhbəti-hurayə verməręm.
*(Raci)*

Aşıq kimi Məşuqə də özünün əsas tipoloji keyfiyyətləri ilə klassik poeziyanın lirik qəhrəmanına oxşayır; o, həm zahiri. həm də daxili-əxlaqi gözəlliyi ilə aşiqini heyran edir. Bəzən biganə olub, əğyara meyl göstərməklə dostunu incitsə də, ilqarım unutmur; onun kometinalığı aşiqini sınamaq, onun dəyanət və sədaqətini yoxlamaq üçündür. Bunlarla bərabər XIX əsr şairlərinin təsvir etdiyi Məşuqə vahid ümumşərq koloritindən müəyyən qədər ayrılmış, orijinal milli xüsusiyyətlər qazanmış bir gözəldir. Günəş kimi parlaq, yaraşıqlı və dilurba olan bu gözəl səmimiyyəti, mehribanlığı, xoş ədası və rəftarı baxımından konkret bir məkanın yetirməsidir. Ayrı-ayrı şeirlərdə təsadüf olunan, "Səni də bu Üştibində, Bir mahi-taban yaradıb" (Nəbati), "Şirvanda əgər bu gözələ yar olasan" (Seyyid), "Gər yolun düşsə, səba, Ağdaşa, məndən sölə kim" (Zövi), "Cəzbeyi-şövqi-cəmalın məni Şirvanə çəkər" (Bixud) "Mənə əgərçi vətən şəhri-Şişədir, cana", "Şişeyi-dil Şişədə səngi-cəfalərdən sınıb (Növrəs), "Sən, ey məhparə, Meşkindən bu Təbrizə gələn gündən" (Dilsuz), | "Hay Xəmsənin ol soyuq suları? Bə Hidəcin ol sərin həvası?" (Hidəci) kimi misralarda göstərilən yer adları da həmin gözəlləri ümumşərq regionundan çıxararaq, xalis Azərbaycan qızları kimi səciyyələndirməyə möhkəm əsas verir.

Məhəbbət lirikasının ümumi pafosu nikbin, optimist ruhdadır. Onun qəhrəmanı bəzən məyuslaşsa da həyatdan əlini üzmür; həmişə maneələri aradan j qaldırmaq əzmi, vüsal ümidi, yara qovuşub kama çalmaq arzusu ilə yaşayır. Əlbəttə, real zəmin üzərində yaranan Aşiqin təbiətinə kədər və məyusluq yad deyil. Lakin bu kədər daimi deyil, Ötəridir; həsrət, hicran saatları qurtarıb,

vüsal anı çalarda kədər, iztirab yox olur. Hətta Natəvanın şeirlərinin birində mübtəla olanları yaşamağa çağıran nikbin aşiq həyatdan əl üzməyi, bədbinləşməvi nöqsan sayır;

Cahanı tərk eləməz, kim ki aşiqi-candır,
Həyatdan üzüb əl, eyləməz cəban tərkin.

Məhəbbət və gözəlliyin tərənnümünə həsr olunmuş qözəl və müxəmməslərdə aşiqin mənəvi aləmini açmaq, gözəlin canlı, bədii təsvirini vermək üçün şairlər, əsasən, klassik şeirdə çox işlənən bədii təsvir və ifadə vasitələrindən istifadə edirdilər. Məsələn, aşiqin məhəbbətindəki coşqunluq ümmanın təlatümünə, ahı - alova, gözlərindən axan yaş - selə, güclü yağışa, rəngi -heyvaya, yaxud payız yarpaqlarına təşbeh edilirdi. Lakin bəzən şairlərin yaradıcılığında canlı həyatdan gələn real təsvir vasitələrinə və ifadə formalarına da təsadüf olunurdu ki, bu cəhət XIX əsrdə Azərbaycan lirik şerində həyatiliyə, realizmə meylin güclәndiyini göstərirdi.

XIX əsrin lirik şerində dövrandan narazılıq, zəmanədən şikayət motivləri də geniş yayılmışdı. Şairlər həm məhəbbətə dair qəzəl və qoşmalarında, həm də rübai, müxəmməs, gəraylı, bayatı janrlarında yazdıqları başqa əsərlərində tez-tez feodal cəmiyyətinin qanun-qaydalarını, sosial bərabərsizliyi pisləyir, bəzən də şəxsiyyət azadlığını təbliğ edən humanist fikirlər irəli sürürdülər. Onların poeziyasında haqqın gücsüz, nahaqqın güclü olduğu, alimlərin cahil, cahillərin isə alim mərtəbəsində durduğu ürək ağrısı ilə göstərilirdi. Zakir və Bakıxanov, Vazeh və Nəbati, Salik və Arif cəmiyyətdа baş verən qanunsuzluqları hökumət adamlarının nadanlığı, rüşvətxorluğu, dələduzluğu ilə əlaqələndirirdilər.

Əsrin ikinci yarısında Seyid Əzim, Bahar Şirvani, Natəvan, Kominə, Bixud kimi şairlərin yaradıcılığında həyatın əzablarından, insanların vəfasızlığından giley-guzar, pərişanlıq əhvali-ruhiyyəsi, peşmançılıq duyğuları aşkar görünürdü. Sosial ziddiyyətləri, cəmiyyət üzvlərinin etibarsız və dönük olmasını çox vaxt məhəbbət hisslərinin tərənnümü fonunda əks etdirən bu şairlərin əsərlərində bəzən həyatın təzadları, ictimai kontrastlar və fəlsəfi düşüncələr açıq şəkildə əks olunurdu. Məsələn, insan qəlbinin təbii hisslərini özünəməxsus bədii sənətkarlıqla göstərən Əbülhəsən Raci yaşadığı zəmanədə vəfa, mehribanlıq, düz ilqar kimi bəşəri keyfiyyətlərin yoxluğunu birbaşa deyirdi:

İmtahan eylədim, ey dil, hamı xubanı dürüst,
Tapmadın-bircə nəfər əhdilə peymanı dürüst
Adı var mehri vəfanın özü yox, ənqə tək;
Par açıb dövr, elədin aləmi-qəmkan dürüst

XIX əsr Azərbaycan şerində dini fanatizmə qarşı etiraz motivləri, azadfikirlilik ideyaları mühüm yer tuturdu. Zahidliyə və asketizmə qarşı çıxan I şairlər real dünyanı mövhumi axirətə, həyat sevgisini ziyarətə, meyxananı məscicdə qarşı qoyur, mövhumat və cəhaləti pisləyir, insan zehnini əsarətdə saxlayan dini ehkamların yalan və əsassız olduğunu göstərirdilər. Vazeh, Bahar, Seyid Əzim, Bixud, Asi və Racinin əsərlərində islam fanatizmi, onun çürük zəhniyyəti cəmiyyəti mənəvi əsarətdə saxlayan qüvvə kimi göstərilir, ruhanilərin təbliğ etdiyi tərkidünyalığa qarşı həyatsevərlik ideyalan irəli sürülürdü.

Orta əsrlərin lirik poeziyasında olduğu kimi, XIX əsr şairlərinin də ictimai məzmunlu şeirlərində lirik qəhrəman - həyatsevər Aşiq öz yerini aqil və mütəfəkkir Arifə tərk edir və ideya mübarizələrində başlıca olaraq iki surətlə qarşılaşırdı; onlardan biri Zahid, ikincisi isə Vaiz idi.

Lirik konflikt həmişə bu surəllər arasında davam edən ideya mübarizələri üzərində qurulurdu. Nikbin həyat və gözəllik vurğunu Arifdən fərqli olaraq Zahid sürəti həmişə insana, yaşamağa zidd meylləri, ruhani əsarəti, mistikanı, tərkidünyalığı təbliğ edir: Xalqı əsarət və cəhalətdə saxlayırdı. Məhz buna görə dini-əxlaqi normalarla qənaətlənməyən, şəriət xadimlərinin insanları qəzavü qədərə, itaətə, səbr və təvəkkülə təhrik edən məhdud sxolast fikirlərinə qarşı çıxan Seyid Əzim müasirlərini həyati fəaliyyətə çağırırdı. O, dini xurafatin, şəriət mərasimlərinin bəşəriyyətə sevinc, nikbinlik yox, məyusluq və kədər gətirdiyini yaxşı bildiyi üçün insanları məscid yolundan çəkilib, zahiddən birdəfəlik uzaqlaşmağı, meyxana küncündə sakin olmağı məsləhət bilirdi:

Ey könül, məscid yolun tərk et, rəhi-meyxanə tut,
Tutma əldə zahidin tesbihini, peymanə tut.
Zahidü məscid təmənnasın çox etmə, ey könül,
Zahidi bir cüğd bil, həm məscidi viranə tul.
Girmə sən məscidlərə namərd zahidlər kimi
Seyyida, meyxanədə peymanəni mərdanə tut.

Eyni ideya-fəlsəfi fikri görkəmli Cənubi Azərbaycan şairi Məhəmməd Əmin Dilsuz da özünəxas bir bədii kəskinliklə deyirdi:

Zahidin baxma kəlamdən yekə əmmaməsinə,
Məscidi qəsb eləyib, qabili-bütxanə deyil.
Saxlayıb hiyləvü təzvir kəməndin əldə,
Sülacaq boynuna, bil, səbheyi-səddanə deyil.

XIX əsr şerində Vaiz surəti daha kəskin tənqidə məruz qalmışdır. Seyid Əzimin qəzəllərində o, yalançı, ikiüzlü, əsassız vəzləri ilə xalqı aldadan, yetim malina göz dikən bir riyakar, fırıldaqçı kimi göstərilir:

Nişimənin ki sənin huriyadır, ey vaiz,
Qəsəm ol xaliqə ki, bu riyadır, ey vaiz.
Yetim malına goz dikməyin nədir daim,
Həlali-kəsb məgər narəvadır, ey vaiz?!

Başqa bir qəzəlində şair vaizi insan yox, "aləmə fitnə salan" şər mədəni, cəhənnəm xəbərçisi, atası məlum olmayan bic uşaq adlandıraraq yazır;

Aləmə fitnə salan mədəni-şərdir vaiz,
Haşalillah deməræm mən ki, bəşərdir vaiz.
Anası daməni-mehrabə atıb qımdağın.
Eyləmə cəhl ki məchuli-pədərdir vaiz.

Xalqı aldadan yalançı ruhanilərin, xüsusilə mollaların mənəvi-əxlaqi çirkinliyini açıb ifşa etməkdə Molla Ağa Bixud və İskəndər ağa Şair daha barışmaz mövqe tuturdular. Riyakarlıqda və hiyləgərlikdə mollaları iblis və şeytanla müqayisə edən İskəndər ağa Şair şcirlərinin birində "baltanı dibindən vurub" (F.Köçərli) qəzəbini ən acı sözlərlə ifadə edirdi:

Bitəkəllüf, eşşək kimi girirsən hər evə,
Soxulursan tula tək her qapıdan, ay molla!
Sən ki Quranda özün "əlhəqqü mürr" oxumusan,
İncimə, acı olur həqqi-süxən, ay molla!
Qapacaqsan məni də it kimi bir gün bilirəm,
Qapdırır itə özün, iti vuran, ay molla!

Şəxsi və mənəvi azadlıq, işıqlı bir əxlaqi-ictimai ideal arzusu, humanizm, insanlıq fəlsəfəsi, XIX əsr şairlərinin çoxunun yaradıcılığından qırmızı xətt kimi keçir. Onların yaradıcılığında təsvir olunan bədii surətlərin dünyagörüşü, həyata münasibəti, təbliğ etdikləri ideya ilə bağlı olaraq, şeirdə bir-birinə zidd mövqedə dayanan iki poetik məkan diqqəti cəlb edirdi: Meyxana və Məscid. Bunlardan birincisi zövq əhli olan Arifin, ikincisi isə Zahid vo Vaizin dolaşdığı yerlərdir.

Poeziyada lirik konflikti kəskinləşdirən bir də ayrı-ayrı surətlərin bu məkanlara münasibəti idi. Vaiz məscidin əzəməti, axirət dünyada behişt xülyası barədə danışırdı, Zahid xalqı, camaat məscidə - ibadətə və itaətə səsləyirdi. Onların əksinə olaraq Arif meyxananı üstün tuturdu. Onun fikricə meyxana - düzlük, sədaqət, mehribanlıq və insanlığın məkanıdır; yalan, həsəd, paxıllıq və xəyanət oraya yaxın düşə bilmir. Humnist şair Ə.Raci yazırdı:

Bilmərrə, yolu canibi-meyxanəyə yoxdur,
Hər kimsənədə büxtü riyavü həsəd oldu.
Xoş halına hər kimsənə meyxanədə öldü,
Xişti-xum o şuridəyə səngi-ləhəd oldu.
Mən eyləmədim zahidi özbaşına rüsva,
Bu işdə mənə piri-muğandan mədəd oldu.
Zahidlərə ixbar eləyin: xirqeyi-Raci –
Meyxanədə rindani-xərabə nəmad oldu.

Yalan vəzləri ilə avam camaatı aldatdığına görə ikiüzlü ruhaniləri bayquş adlandıran görkəmli şair Bixud da xudbin zahiddən kənara çəkilib "rindlər yanında" etibarlı olmağı fəxarət sayırdı:

Nə qəm, ülfətimdən ar edərsə zahidi-xudbin,
Mənim də zahidi görməkcliyə, vallahi, arım var.
Məni kafər sanıb bizar isə məndan əgər zahid,
Xoşam kim, rindlər yanında qədrü etibarım var.
Məni binamlərdən sanmayın aləmdə Bixud tək,
Xərabət əhliyəm mən, rindlikdə iştihanın var.

Seyid Əzim isə meyxananı məscidə qarşı qoyur, eşq odunda yanmağı Məkkə ziyarətindən üstün tutaraq yazırdı:

Zahid, çağıma Kəbəyə meyxanədən məni,
Yüz Kəbədən səfalıdı meyxanənin biri.
Min həccdən şərafəti əfzun olur, əgər
Şəmə dolanıban yanə pərvanənin biri.

Məscidlə müqayisədə meyxanaya üstünlük verən, oradakı həyatı daha yüksək qiymətləndirən şairlərin yaradıcılığında şərabın tərənnümü də xüsusi yer tutur. Bnuun səbəbini konkret şəkildə izah edən ədəbiyyatşünas M.Quluzadə məşhur" fransız şərqşünası C.Darmsleterə istinadan yazır: "Şərq ədəbiyyatında şərab Quran əleyhinə, müqəddəsat əleyhinə, dini qanun tərəfindən əqlin təbiətinin əzilməsi əleyhinə üsyandır. Şair üçün şərab içən adam azad olmuş insanın rəmzidir"

Beləliklə, Şərq ədəbiyyatında olduğu kimi, Azərbaycan şairlərinin də şeirlərində şərab - fikir azadlığı, etiqad sərbəstliyi, dini ehkamların əsarətinə etiraz ifadəsi, şadlıq, firavanlıq və səadətin timsalı kimi göslərilir.

İçkini günah sayıb, onu insanlara qadağan edən Vaiz və Zahidin əksinə çıxaraq, Seyid Əzimin müdrik Arifi deyir:

Vaiz, demə kim zail edir əqli piyalə,
Badə yetirir mərdümi hüşyan kəmalə.
Sən özgə günah eyləmə, iç badeyi-gülfam
Ondan nə günah olsa, mənə eylə həvalə.

XIX əsr şairlərinin yaradıcılığında şərab - real həyat və dünyəvi məhəbbət rəmzi kimi tərənnüm olunur. Dini mövhumat, fanatizm və cəhalət əleyhinə bədii etirazın bir forması kimi ondan şeirdə tez-tez istifadə edilir. Onun tərkidünyalıq, dinin uydurma "abikövsər" "dirilik suyu" ilə heç bir əlaqəsi yoxdur.

Şeirdə məhəbbət, dünyavilik, zamanədən şikayət motivləri ilə yanaşı təbiət movzusu, peyzaj lirikası da müəyyən yer tuturdu. Bu dövrdə şairlərin təbiətə müraciəti, ondan bəhralənmə yolları müxtəlif idi. Çox vaxt onlar klassik poeziya ənənələrini davam etdirərək, təbiətdəki əşyaları lirik qəhrəmanların zahiri görünüşü ilə qarşılaşdırır, gözəlin üzünü - gülə, boyunu - sərvə, gözünü nərgizə, qaşlarını - qövsi-qüzehə (göy qurşağına), ağzını -qönçəyə. yanağını - laləyə bənzədirdilər. Belə müqayisələrdə insan - sevgili öz gözəlliyi və məlahəti ilə təbiət gözəlliklərindən üstün tutulur; sərt sevgilinin boyunu görəndə öz boyundan utanır, lalə qırmızılığını onun yanağından alır, bağban gözəlin ağzını görəndə bəslədiyi qönçələri yandırır, günəş nuru, ziyanı onun camalından alır və s.

Təbiət gözəllikləri insanın həyatı, mənəvi aləmi, ruhi vəziyyəti, sevgi hissləri, vüsal arzuları, sevinc və kədəri ilə əlaqələndirilir. Təbiət insanla daha da xinətlənir, güllər, çiçəklər insanla əlaqədə daha gözəl olur. İnsansız təbiətin gözəlliyi heçdir. Bu şeirlrin bir qismində aparıcı xətt ayrı-ayrı fəsillərin təsviridir. Belə şeirlərdə bahar - ürəkləri təzələyən, ruha fərəh, nikbinlik gətirən, həyatı yeniləşdirən, payız - bütün gözəllikləri uçunıb-dağıdan insan qəlbini kədarləndirən bir mövsümdür. Qış ömrün sonudur. Yay isə bədii surət kimi XIX əsr şerinclə yox dərəcəsindədir.

Lirik qəhrəmanla təbiətin qarşılıqlı münasibətlərinin bədii təqdimi də əsasən ənənəvi idi; yəni əgər insan şaddırsa, o öz istəyinə yaxınndırsa, məqsədinə nail olursa, bu zaman təbiat də cilvələnir, gözəllik göz oxşayır. Əgər qəhrəman kədərlidirsə, öz arzusuna çata bilmiş, onda təbiət də tutqundur: gülüstan solmuş, xəzan yarpaqlar tökülmüş, hər tərəf üryan qalmışdır.

Lakin bəzən bunun əksi də olur. Şairlər təbiət hadisələri ilə insanın daxili-mənəvi əhvali-ruhiyyəsini qarşılaşdırmaqla qüvvətli bədii təzad yaradırlar. Bu cəhətdən Natəvanın "Sənsiz" rədifli qəzəlləri yaxşı bir nümunədir. Bahar gəlmiş, güllər açılmışdır. Ancaq bu gözəllik şairəyə sevinc yox, hədsiz kədər və iztirab gətirir. Çünki bu gözəllik insansızdır. şairənin sevimli övladı həyatda yoxdur. Ona görə də təbiət cah-cəlala büründüyü halda, lirik qəhrəmanın qəlbi xəzan görmüs bülbül kimi nalə edir, fəryad qoparır:

Bahar əyyamıdır, açıldı güllər, ey cavan, sənsiz!
Təəccübdür, nədən divanə olmaz Natəvan sənsiz?
Güli-röymdən ayrı neylərəm mən gülistan seyrin?
Edər bülbül kimi nalə bu zarü Natəvan sənsiz.

Belə şeirlərdə bəzən təbiət hadisələri insanların maddi həyatı və dolanışığı ilə əlaqələndirilir, şairlər yağış, isti, qar, soyuq kimi təbii hadisələrin təsviri fonunda xalqın çətin, dözülməz yaşayışını əks etdirirlər.

Təbiət şeirlərində əsas bədii obraz gülüstandır. Başqa surətlərin hamısı orada movcuddur. Gulüstan - gözəllik, məhəbbət məkanıdır. Baharın nəfəsi ilk dəfə orada duyulur. Şairlər cəmiyyətdə olmayan rahatlıq və gözəlliyi çox vaxt gülüstanda, bu kiçik bağçada arayıb tapırlar. Lakin XIX əsr şerində səhra, biyaban kimi yerlərində təsvirinə təsadüf edilir. Məhəbbət qəhrəmanları istək və arzularına çata bilməyəndə çölə, biyabana qoşur, cəmiyyətdən uzaqlaşırlar.

Beləliklə, XIX əsr şairlərinin yaradıcılığında təbiət həmişə cəmiyyət həyatı və humanist ideyalarla əlaqələndirilir; poeziyada o, imanların zahiri gözəlliyini və mənəvi-əxlaqi keyfiyyətlərini dərindən səciyyələndirən bir vasitə kiıni işlənir.

* * *

XIX əsr Azərbaycan lirikası bədii məzmun, ideya-estetik ovqat baxımından zəngin olduğu qədər da keşməkeşli, enişli-yoxuşlu bir yolla inkişaf edirdi. Klassik poeziya üslubunda yazan şairlərin ictimai mənşəyi, mədrəsə təhsili alıb dini dünyagörüşə yiyələnməsi onların yaradıcılığına da müəyyən təsir göstərirdi. Bu şairlər bir tərəfdən dünyəvi məhəbbəti tərənnüm edir, fanatizmə və yalançı ruhaniliyə qarşı çıxaraq, elm və mədəniyyəti tərifləyir, məscidi "bayquş yuvası" adlandıraraq, arif adamları oradan uzaqlaşmağa çağırır, ikinci tərəfdən isə dini mərasimlərdə oxunan mərsiyə, növhə, sinəzən və mədhanələr yazırdılar. Özü də bu hal XIX əsr şairlərinin, demək olar, əksəriyyətinə xas olan bir xüsusiyyət idi. Hətta mövcud dini təəssübkeşliyi pisləyib, vaiz və zahidləri riyakar, ikiüzlü adlandıran Əbülhəsən Raci. "Künci-meyxanəni məskən edib hər şamü səhər, Vermə, Dilsuz, əlini zahidü molla əlinə" - deyə xərabati şeirlər yazan Məhəmmədəmin Dilsuz, habelə "Allaha rüşvət", "Köpəyə ehsan", "Yerdəkilərin göyə şikayətə getmələri" kimi satirik əsərlərin müəllifi olan Seyid Əzim Şirvani də dini mədhnamə. mərsiyə və sinəzənlər yazmış, bu əsərlər camaat arasında geniş yayılmışdır.

Əlbəttə, bu təsadüfi deyildi. Onun obyektiv səbəbləri vardı. Bu səbəblərin birincisi tarixi-ictimai şəriətlə bağlı idi. Ölkənin müəyyən yerlərində, xüsusilə cənub rayonlarında feodal idarə üsulunun, orta əsr qaydalarının, dini

fanatizmin və movhumi görüşlərin hələ qüvvətli olması, İran dövlətinin Osmanlı imperiyasına qarşı apardığı rəqabətli mübarizələrlə əlaqədar sünni-şiiə münasibətlərinin kəskinləşməsi bədii ədəbiyyatda dini keçmişə marağı artırmışdı.

XIX əsrdə mərsiyə ədəbiyyatının geniş yayılmasına səbəb olan mühüm ictimai amilləridən biri də "çarizmin ucqarlarda apardığı müstəmləkəçilik siyasəti" və bununla əlaqədar olaraq, hökumətin "sünni-şiə ziddiyyətlərini kəskinləşdirməyə çalışması, Tiflisdə müsəlman uşaqları üçün ayrı-ayrılıqda şiə və sünni məktəbləri açması" idi[1]. İkinci tərəfdən, bu, Azərbaycanda geniş ədəbi-ictimai hərəkat səviyysinə qalxan maarifçiliyin yeni bədii-estetik çalarlar qazanması, dindarlaşması ilə əlaqədar idi. Məlumdur ki, XIX əsrin 80-90-cı illərində Azərbaycan maarifçiləri sosial-mədəni həyatda nəyin necə olduğunu qiymətləndirmək üçün Ağılla yanaşı Allaha da əsaslanırlar. Onlar "dini fanatizmə qarşı mübarizədə dinin özünün ən müqəddəs silahı ilə -Quranla da silahlanırlar"[2]. Əxlaqi təmizlik, mənəvi ucalıq uğrunda mübarizə yollarından biri də "saf islama" qayıtmaq arzusu və cəhdi olur. Məhz "saf din". "təmiz şəriət" ideyasının tələbi ilə klassik poeziyanın lirik qəhrəmanı dini keçmişə müraciət edərək islam müqəddəslərinin igidliyi, ədalətli mübarizədə şərəfli ölümü, haqq yolunda səhidliyi barədə mərsiyə və növhə oxuyur.

Nəhayət, XIX əsr Azərbaycan şerində mərsiyənin intişarı, dini motivlərin geniş vüsət alması bir də ədəbi gedişatın, mədəni-tarixi prosesin səciyyəsi, sənətkarların özlərinin ədəbi-ictimai mühitdə tanınmaq arzuları ilə bağlı idi. Belə ki, məhəbbət mövzusunda yazılan qəzəllər yalnız toy və bu kimi şadlıq məclislərində oxunduğundan onların müəllifləri də belə məhdud yerlərdə tanınırdı. Həm də toy məclisləri uzun çəkmir, ən yaxşı halda üç gün davam edirdi. Halbuki məhərrəmliklə bağlı təziyə və təkyə məclisləri hər ilin müəyyən vaxtlarında günlərlə, hətta həftələrlə və aylarla, özü də bir eldə, bir obada yox, bütün şiə-müsəlman ölkələrində davam edirdi. Şübhəsiz, bu cür məclislərdə oxunan şeirlər öz müəllifini daha çox tanıdırdı. Bu cəhəti xüsusi nəzərə çatdıran ədəbiyyatşünas F.Köçərli yazır: "Beş-on sənə bundan əqdəm artıq hörmət və şöhrətdə olan ancaq İmam Hüseyn müsibətinə dair növhə və mərsiyə yazan şairlər idi ki, onların kəlamı məscidlərdə, təkyələrdə oxunurdu və onlar öz kəlamlarını eşidib, xalqın tərifü tövsifi ilə sərəfraz olurdular ve növhə yazmağa dəxi də artıq şövqmənd olub, bütün vaxtlarını və qüvveyi-şedyyələrini bu yolda sərf edirdilər"[3].

Təsadüfi deyildir ki, İranda Nəsrəddin şahin (1848-1896) hakimiyyəti illərində "məhərrəmlik təziyədarlığına böyük əhəmiyyət verildiyi üçün

[1] Azərbaycan ədəbiyyatı tarixi. II cıld. Bakı, 1960, s. 167-168.

[2] Yaşar Qarayev . Realiz: sənət və həqiqət. Bakı. 1980, S. 129.

[3] Firidun bəy Köçərli. Azərbaycan ədəbiyyatı. II cild, Bakı, 1981, s.326.

Molla Məhəmmədbağır Məclisinin, Qumri, Dəxil, Raci və başqa mərsiyə şairlərinin fanatizm yayan əsərləri tez-tez çap olunub yayılırdı[1]". Belə kitab-lardan, məsələn, Qumrinin "Kənzül-məsaib" əsəri mətbuat səhifələrində "Məcmueyi-mötəbər", ədiblərin rəğbətlə qarşıladığı kitab kimi qiymətləndirilir, onun müəllifi xoş sözlərlə alqışlanırdı[2]. Buna görə də Mirzə Məhəmməd Tağı Qumri (1819-1891), Mirzə Kərim Şüai (?-1894), Mirzə Cəbrail Süpehri (?-1902), Mirzə Həsib Qüdsi (1873-1908) kimi şairlər müasirlərinin çoxundan ayrılaraq, öz yaradıcılıqlarında növhə və sinəzənlərə daha çox yer vermiş, xüsusi mərsiyə şeri, ruhani poeziya yaratmışlar. Bu şeir dini ədəbiyyat deyildi. Onun məzmununda, daxili mayasında həyatilik, tarixilik var idi. Şairlər hicri tarixin 61-ci il məhərrəm ayının 10-da (miladi 680-ci ilin oktyabr ayı) baş vermiş Kərbəla müsibətlərini qələmə alsalar da bu hadisələri hələ mövhumiləşdirmir, ondan tarixi əhvalat kimi danışırdılar. Bu şeirlərdə Məhəmməd peyğəmbər (570-632), onun əmisi oğlu və kürəkəni Əli ibn Əbu Talib (598-661) təriflənir, İmamların ölümü, ədalət, haqq uğrunda şəhidlik kimi mənalandırılır, tərənnüm olunurdu.

Tarixi-dini şeirlər təkcə məsciddə oxunmurdu. O, xalqın məişətinə daxil olmuşdu; yas məclislərində, ölü yerlərində oxunan belə şeirlər dinləyicilərin qəlbini riqqətə gətirir, hisslərini və duyğularını kövrəkləşdirirdi. Dinləyicilər məğlub olanın şəhidliyinə, onun dəstəsinin əsir düşməsinə təəssüflənir, göz yaşı axıdırdılar. Lakin mərsiyə şeri oxucularda bədbin əhvali-ruhiyyə yaratmır, əksinə, oxucunu mənəvi təmizliyə, əxlaqi saflığa çağırırdı. Yezidin imamlara etdiyi zülmü gözləri qarşısında[3]canlandıran oxucu, yaxud dinləyici daxilən bu ədalətsizliyə qarşı çıxır, qəddarlığa və zalımlığa nifrin yağdırır, lənət oxuyur, hətta zülm və ədalətsizliyə qarşı etiraz və mübarizə ruhunda səfərbər olunurdu.

Bədii kökləri və estetik təbiəti etibarilə də mərsiyə Azərbaycan ictimai gerçəkliyinə və ədəbi fikrinə yad deyildi. Məlumdur ki, ölən qəhrəmana, həyatdan köçmüş əziz bir adama sevgi, məhəbbət ifadə edən yanıqlı nəğmələri daha təsirli şəkildə ifadə edən xüsusi adamlar da olmuşdur. Rus ədəbiyyatında elegiyanın köklərini araşdıran ədəbiyyatşünas L.Q.Frizman yazır: "Rus elegiyasının mühüm mənbəyi - folklor, o cümlədən xalq ailə-məişət və məhəbbət lirikası, oxşama və ağılar olmuşdur"[4].

Bu fikri Azərbaycan ədəbiyyatına da aid etmək olar; yəni Azərbaycan mərsiyəsi öz mayasını Azərbaycan xalq ədəbiyyatından, ailə-məişət nəğmələrindən, oxşama və ağılardan götürmüşdür. Sonralar bu janrın yaxşı nümunələrini

---

[1] Azərbaycan ədəbiyyatı tarixi. 11 cild, s.167

[2] Bax: "Ziyayi-Qafqaziyyə". 1881, 12 dekabr.

[3] Həsi Abdullayev. İslamın məhərrəmlik mərasimi. Bakı, "Azərnəşr", 1967, s.10.

[4] Л.Г.Фризман Жизнь лирического жанра. Изд-во "Наука" М., 1973, с.12.

Xaqani, Nizami, Füzuli, kimi klassiklər yaratmışlar. XIX əsr mərsiyələri də ilk növbədə xalq ədəbiyyatı, sonra isə klassik poeziya ilə bağlı idi; daha doğrusu mərsiyə şeri dini ənənədən yox, ədəbi ənənədən yaranmışdı. Bu mərsiyələrdə klassik şerin ictimai kədər motivləri davam etdirilirdi. Onlar Sərg tarixi, keçmişdə olmuş qanlı hadisələr haqqında canlı və ibrətli söhbətlər idi. Oradakı ideya-məzmun çox vaxt dini-şiə təəssübkeşliyinin hüdudlarını asırdı. Şairlər insani hissləri, mənəvi gözəlliyi, əxlaqi təmizliyi, bəşəri kədəri hətta siyasi azadlığı və bərabərliyi təbliğ və tərənnüm etməklə yaşadıqları dövrün despotizminə, xüsusilə müstəmləkəçilik siyasətinə qarşı çıxırdılar.

Mərsiyə şerindəki dünyəvilik və tarixilik humanizm ideyaları ilə bağlı idi. Müəyyən məsələlərə münasibətdə dini səciyyə daşımasına baxmayaraq, mərsiyə şairləri də insanın azadlığı ideyasını müdafiə edirdilər. Bununla belə bu azadlıq ictimai mahiyyət qazana bilmirdi və mərsiyə şerinin başlıca ziddiyyəti, məhdudluğu da bu nöqtədə idi; Qumri, Raci. Dilsuz, Asi, Növrəs və başqalarının təsvir və mədh etdiyi qəhrəmanlar - Məhəmməd, Əli, liseyn tarixi şəxsiyyətlər olduğu halda şairlər onları mövhumiləşdirir, bu adamların guya ruhən ölmədiyinə inanır və əfsanəvi məhşər günü onlardan kömək diləyirdilər. Məsələn. Növrəs Füzuliyə təxmislərindən birini belə qurtarırdı:

Arizə qan yaşı gözdən cari eylər müttəsil,
Növhəxandır Növrəsi-məhzuni-müztər ilbəil,
Ya Əli, ruzi-cəzadə qoyma qalsın münfəil.
"Arizuməndi-vüsa1ındır Füzuli xəstədil,
Vəslin istər, dövləti-didarın eylər arizu".

Mərsiyə şeri Azərbaycan ədəbiyyatında süjetli lirikanın inkişafına xeyirli təsir göstərmiş. insanın daxili dünyasının, subyektiv hisslərinin canlı və təsirli təcəssüm etdirilməsində, poetik dilin orta əsrlərə məxsus qəliz ərəb-fars tərkiblərindən təmizlənməsində və sadələşməsində müəyyən qədər əhəmiyyətli rol oynamışdır. Bu əsərlər poetik-struktur baxımdan bəzi keyfiyyətlər qazanmışdı. Növhə və sinəzənlərin bir çoxu yüksək bədiiliyi və şeriyyati ilə fərqlənirdi; şairlər gözəl qafiyələr yaradır, poetik sözün imkanlarından sənətkarlıqla istifadə edə bilirdilər. Misal üçün, "həqq yolunda və eşq aləmində nə qədər ağır cəfalara və böyük bəlalara giriftar" (F.Köçərli) olmağı İmam Hüseynin səadət saymasını və bunu öz bacısı Zeynəbə fəxrlə bildirməsini Əbülhəsən Raci şeirlərinin birində belə ifadə edirdi:

Bacı, əhdim budu bu çöldə gərək qanə batam.
Qanımı Əkbərimin qanına şövq ilə qatam.
Can verib təşnə, gərək isti qum üstündə yatam,
Cismi-məcruhim ilə, sineyi-suzanım ilən.

Fikri aydın və təsirli ifadə etmək, oxucuda güclü emosiya yaratmaq üçüı şair əruzun axıcı bəhrini seçməklə bərabər həm də rədiflərdən məharətlə istifadə edir:

Əhli-Kufə yetirər zülmünü itınamə, bacı,
Bədənimdə dəxi qoymazla qala camə, bacı.
Mizələrdə aparərlar başımı Şamə, bacı,
Bədənim yerdə qalar peykəri-üryanım ilən.

Şamdə məclisi-işrət quralar, söz deməręm,
Küçəvü bamdə səf-səf duralar, söz deməręm,
Xeyzuran çübü nə qədri vuralar, söz deməręm,
Bəzmi-əğyardə mən bu ləbü dəndamın ilən.

Başqa mövzularda yazılan əsərlər kimi mərsiyə və təriqət şerinin yaradıcıları da öz əsərlərinin mərkəzinə insan, onun sosial mühitdə mövqeyi məsələlərini çəkir və öz dünyabaxışlarına uyğun şəkildə izah edirdilər. Bu şerin mayasında dünyəvilik və tarixilik motivləri ilə yanaşı bir də humanizm pafosu vardı. Müəyyən məsələlərin bədii şərhində idealist səciyyə daşımasına baxmayaraq, bu şerin lirik qəhrəmanı zülmkarlıq və qəddarlığın əleyhinə çıxır, insan azadlığı və xoşbəxtliyi ideyalarını müdafiə edirdi.

* * *

XIX əsr Azərbaycan ədəbiyyatında epik şeir də inkişaf edirdi. A.Bakıxanov, M.Ş.Vazeh, M.B.Xalxali, M.M.Şükuhi, S.Ə.Şirvani, M.T.Qumri kimi şairlərin məsnəvi, təmsil və mənzum hekayələrində həyat, gerçəklik əhatəli, panoramlı təsvir, poetik təhkiyə üsulu ilə canlandırılır, obrazların xarakteri geniş əhvalatlar və hadisələr fonunda inkişaf edir və açılırdı.

Epik şeirdə əxlaqi-tərbiyəvi fikirlərin təbliği xüsusi yer tuturdu. Şairlər qoca Şərqin Sədi, Nizami və başqa qüdrətli sözustalarının ənənələrini davam etdirərək, mənzum hekayə və təmsillərində müasirlərini qayğıkeş, səmimi olmağa, cəmiyyət işlərinə ayıq gözlə baxmağa, ağıl və düşüncə ilə hərəkət etməyə, bəşəriyyət üçün xeyirli işlər görməyə çağırırdılar. (A.Bakıxanov -"Hikmətin fəziləti", "Tədbirin gözəlliyi", "Yersiz minnət qoymaq"; Q.Zakir - "Zovci-axər", "Tərlanlar və elçilər", "Dərviş ilə qız" və s.).

Belə əsərlərin müəllifləri haqqı, ədaləti müdafiə edir, insan şüurunun qüdrətinə yüksək qiymət verir, həyatda ən xeyirli şeyin hünər və qabiliyyət, ən yaxşı şeyin xeyirxahlıq, ən lazımlı şeyin isə həqiqət olduğunu müasirlərinə bildirirdilər. Onların təbliğ etdikləri sadə əxlaq normalarına zəhmətkeşlik, əməksevərlik; düzlük, doğruçuluq, mehribanlıq, təmizlik kimi yüksək insani sifətlər daxildi. Yalançılıq, fırıldaq, təkəbbür, lovğalıq, xudpəsəndlik kimi naqis cəhətlər isə bu əsərlərdə şiddətlə pislənirdi.

Klassik poeziya ənənələrini davam etdirən XIX əsr şairlərinin epik yaradıcılığında əxlaqi-didaktik ideyalar geniş yer tuturdu. Orta əsr ədəbiyyatının, xüsusilə nəsihətamiz şerin möhkəm zəmini üzərində yetişən XIX əsrin didaktik poeziyası tamamilə yeni məzmun kəsb eləmişdi. Artıq quru nəsihətçilik, moizə və tərbiyə öz yerini "sağlam ağlın mühakiməsinə" (F.Engels) tərk edirdi. Hətta Seyid Əzim, Qasir, Sidqi, Hacı Ağa Faqir kimi məktəbdar şairlər deyil, xalis məclis ab-havasında boya-başa çatan Məhəmməd Səfa, Mirzə Ələsgər Növrəs, Molla Məhəmməd Zövi, Məşədi Məhəmmad Bülbül və başqaları da qəzəl, qəsidə, rübai janrlarında yazdıqları əsərlərində yaşadıqları cəmiyyətin, onun əxlaqi və hüquqi qanunlarının köhnəldiyini, yeni zəmanə ilə bir yerə sığmadığını yüksək bədii intonasiya ilə bildirir, ağlın qüdrəti, elmin və mədəniyyətin əhəmiyyəti barədə danışırdılar. M.F.Axundzadə ideyalarını poeziya sahəsində davam etdirən bu şairlər özlərinin ədəbi mühitlərindən, məclis ab-havasından tamamilə ayrılmasalar da, eyni zamanda yeni tipli məktəbin təşkilatçısı, müəllim, humanist və beynəlmiləlçi kimi fəaliyyət göstərirdilər. Xüsusilə 80-90-cı illərin ədəbi-bədii prosesində maarifçi realizmin geniş vüsət alması, başda M.F.Axundzadə və H.Zərdabi olmaqla "əkinçilərin" irəli sürdüyü estetik prinsiplərin bədii təcrübədə getdikcə qüvvətlənməsi onların yaradıclığına yeni məzmun gətirir. Dəyişən ictimai-tarixi şəraitin təsiri ilə qəzəl və qəsidə ədəbiyyatı kimi əxlaqi-didaktik şeir də müasirliyin ideya-üslub mübarizələrində yeni estetik məzmun qazanır.

Əxlaqi-didaktik şerin qəhrəmanı dəfələrlə dünyanın isti-soyuğundan keçmiş müdrik, aqil bir insan - Atadır. Ömrunü dünya işlərinin gedişatını öyrənməyə sərf edən bu insan - Ata çox hadisələr görmüş, çox adamları sınaqdan keçirmiş, zəngin həyat təcrübəsi qazanmışdır. Hansı sifətlərin yaxşı, hansıların isə pis olduğunu gözəl bilən insan - Ata öz övladlarına - gənc nəslə müraciətində doğruçuluq, səmimiyyət, xeyirxahlıq, böyüklərə hörmət, alicənablıq kimi nəcib insani sifətləri təbliğ edir, konkret həyati nümunələr əsasında həmin sifətlərin fəzilətlərini göstərirdi. Bunun əksinə olaraq o, sərxoşluq və oğurluq etməyi, qumar oynamağı, rüşvət yeməyi pisləyir, onların insana fayda yox, bəla gətirəcəyini bildirirdi.

Əxlaqi-didaktik şeirdə təbliğ olunan əsas insani xüsusiyyətlər sadəlik, təvazökarlıq, mehribanlıq, vətənpərvərlik, beynəlmiləlçilik və əməksevərlik idi. Məsələn, Seyid Əzimin öyüdlərində zəhmət, əmək insanı ucaldan başlıca amillər kimi göstərilir, gənc nəslə işsizlikdən, bikarçılıqdan uzaqlaşıb, müəyyən bir sənətə yiyələnmək tövsiyə olunurdu:

Ey oğul, bil ki, adəmi-bikar,
Xüşk olan bir odundu, layiqi-nar.
Bunu bizdən deyibdilər əqdəm,
Sənəti olmayan deyil adəm.

Maarifpərvər şair başqa bir şerində birlik, ittifaq ideyasını irəli sürərək, fərdiyyətçiliyin əleyhinə çıxır, gəncləri birliyə, ittifaqa çağırırdı:

İttifaq eyləyəndə beş barmaq,
Xeyli asandı bir işi tutmaq.
Yoxdur, ey sərvarim, tək əldə səda,
İttifaq ilədir sünırü səfa.

Epik şerin başqa mövzuları kimi əxlaqi-didaktik əsərlər də dərin humanizm problemləri qaldırır, cəmiyyət üzvlərinin, bütövlükdə xalqın mənəvi azadlığı, əxlaqi saflığı və təmizliyi prinsiplərini müdafiə edirdi.

XIX əsr ədəbiyyatında epik şerin ən gözəl nümunələri Q.Zakir və Seyid Əzimin, M.Ş.Vazeh və A.Bakıxanovun, M.T.Sidqi və Xan Qaradağının mənzum hekayələri, öyüd və təmsilləri, M.M.Şükuhinin "Münazireyi-Əqlü Eşq", "Bəzzazların öyünməsi", M.B.Xakalinin "Sələbiyyə", məsnəviləri, M.T.Qumrinin "Kənzül məsaib" kitabıdır. Həcmindən asılı olmayaraq, bu əsərlərin hər birində canlı bədii surətlər, yaddaqalan əhvalatlar görmək mümkündür. Hadisə zənginliyi, fəaliyyətin geniş planda verilməsi də adları çəkilən əsərlərin epik səciyyəsini qüvvətləndirən məziyyətlərdir.

***

XIX əsr Azərbaycan poeziyasının əsas qol larından biri də realist satiradır. Ölkənin sosial-iqtisadi həyatında ictimai və milli zülmə, müstəmləkəçilik siyasətinə qarşı etiraz, mövcud vəziyyətdən narazılıq əhvali-ruhiyyəsinin qüvvətlənməsi və xalq azadlıq hərəkatının genişlənməsi - bədii ədəbiyyatda kəskin, açıq tənqidi pafosun meydana gəlməsi ilə nəticələnir; əsrlər boyu gah dəhşətli faciələrlə ağlayan, gah da azadlıq həsrəti ilə alışıb yanan, gözəllik və məhəbbəti tərənnum edən, qəhrəmanlara və hökmdarlara mədhiyyə oxuyan, təbiətə, bahara, gülə və bülbülə nəğmələr qoşan bəşəriyyət indi bədii təffəkküründə tənqidə geniş yer verir, "həyat haqqında amansızcasına açıq danışan əsərlər yazırdılar[1]. Şeirdə demokratizmin həyatiliyin, sosial məzmunun güclənməsi, obrazlar sistemində təbiillyin artması, mövcud cəmiyyətə, ictimai quruluşa maarifçi baxışın dərinləşməsi, ən başlıcası isə əsrin ortalarında dünya tarixinin "tam mənada komizm mərhələsinə qədəm qoyması" və "getdikcə daha artıq istehza doğurması" poeziyada satira va realizmin yaranması üçün obyektiv şərait, zəmin idi.

Tarixi şərait, ictimai mühitdə gördükləri mənəvi-əxlaqi eybəcərlik saf bəşəri duyğular haqqında nəğmələr qoşun Azərbaycan şairlərini məhəbbət və

---

[1] Əziz Mirəhmədov. Yazıçılar, talelər, əsərlər. Bakı, 1978, s.99.

gözəlliyin tərənnümünə dair odlu lirika ilə kifayətlənməyə qoymur, onları kəskin tənqidi-satirik əsərlər yazmağa təhrik edirdi, B.Şakir, Q.Zakir, A.Canı oğlu, M.Miskin, M.Nadim kimi sənətkarların yaradıcılığı Azərbaycan şerində yeni bir ədəbi cərəyanın meydana gəlməsini göstərirdi. Bu cərayanın tənqid obyekti, şairləri narazı salan məsələlər çox idi. Lakin onlar əməkçi xalqın həyatı, ağır güzəranı ilə hər şeydən artıq maraqlanırdılar. Yoxsul kəndlinin, rəiyyətin çətin dolanışığı, rəncbərin insan yerinə qoyulmaması, bir tikə çörəkdən ötrü bütün günü bəylərin qapısında xidmət edəıı kəndlinin dözülməz vəziyyəti Nadimin şeirlərində dərin hüznlə, kədər hissi ilə, onları incidən bəylər və ağalar isə hədsiz qəzəblə təsvir olunurdu ("Misir nəvəsi imamverdi", "Murad xan", "Kərbəlayı" və s. şeirlər).

Kəndlilərin vəhşicəsinə istismar olunduqlarını biçinçilərin haqqını kəsən, camaatı susuz qoyan mülkədarların yırtıcı təbiətini realist boyalarla təsvir edən Nadim "Mahmud" satirasında təhkimçi-feodal quruluşunun zulm və zorakılığını, rəncbərlərin kotana qoşulduqlarını ürək ağrısı ilə, kəskin daxili etiraz ruhunda gostərirdi:

Mahmud! Əya rəncbərara mərdi-yeganə,
Nahaq yerə rəncidə olub gəlmə fəğanə,
Xaliq sizi rəncbər yaradıbdır bəyə, xanə.
Hərçənd gərəkdir qoşalar at bu kotanə,
At olmasa, heç incimə, insan da qoşarlar.

Hakim sinifləri tənqid, çarizmin qanun-qaydalarına, yerli feodalların özbaşınalığına etiraz, habelə ayrı-ayrı yaramaz sosial tipləri ifşa satirik şerin başlıca motivləri idi.

Doğrudur, satiriklərin yaradıcılığında cəmiyyətin siyasi-iqtisadi əsaslarına toxunulmur, eybəcərliklərin əsas kökləri göstərilmirdi; bununla belə onlar mənfiliklərin bilavasitə "sahibi-ixtiyarla" əlaqədar olduğunu, cəmiyyətin xəstə hal aldığını bildirirdilər. Məsələn, Baba boy Şakir murovların oğrularla, yolkəsənlərlə dilbir olub, onlardan rüşvət almalarını, qubernator və sərdarın isə bu işə göz yummalarını çəkinmədən, cəsarətlə deyirdi:

Bu nə qubernator, bu necə sərdar?!
Dağılıb vilayət, oldu tarımar;
Cəldlanibdi rüşvəto murovlar,
Xəlqin işi ahü əfğanə dönüb.

Başqa bir şerində Şakir fitnəkar, "bodzat" bəylərin komendant və canişinə rüşvət verməklə vəzifəyə keçib, əhaliya divan tutduqlarını təsvir etmişdi.

Realist satiranın inkişafında Zakirin rolu və movqeyi xüsusi diqqətə layiqdir. Bəy zümrəsindən olmasına baxmayaraq, yerli hakimlərin fitnə-fəsadı və

çar məmurlarının ədalətsizliyi üzündən düşdüyü acınacaqlı vəziyyət, habelə ildən-ilə sadə, əməkçi insanlara yaxınlaşıb onlarla həmdərd olması Zakiri zəmanəsinin barışmaz; dovtələb ifşaçısına çevinmişdi. M.F.Axundzadə ilə ideya-yaradıcılıq dostluğu da onun realizminin və satirasının inkişafına böyük müsbət təsir göstərmişdi ("Vilayətin məğşuşluğu haqqında", "Zəmanənin tənqidi". "Divanbəyiləri həcv", "Hüseyn bəyi həcv", M.F.Axundzadə, İ.Qutqaşınlı, M.P.Kolyubakinə yazdığı mənzum məktublar və s,).

Zakir satirasında sosial bəlalar, yerli hakimlərin zülmü, çarizmin idarə və məhkəmələrindl olan sürundürmələr, ölkəni bürüyən rüşvətxorluq, halsizlıq cəsarətlə tənqid olunur. Şair çar məhkəmələrində işləyən məmurların çirkin mənəvi aləmini açır, onların büsbütün humanist hisslərdən məhrum yalançılar, "həşəratlar" olduğunu yazırdı:

Həddən aşıb büxlü həsəd, şərarət,
Yoldaş yöldaşına eylər xəyanət,
Alimdə əməl yox, bəydə ədalət,
İşlərimiz olub saf gərdən-bucaq.

Tənqidi-satirik şerin ifşa obyektlərindən biri də ikiüzlü din xadimləri, yalançı, satqın ruhanilər - seyid, molla, mərsiyəxan, dərviş, vaiz, axund və başqaları idi. Onlar dini təbliğat yolu ilə avam xalqı aldadır, itaətkarlıq əhvali-ruhiyyəsi tərbiyə edirdilər. Allah, Məhəmməd, Quran adından danışıb, islam dinindən öz cibləri üçün istifadə edən ruhanilərin qapazı, adətən, yoxsul vo sadəlövh kəndlinin başına dəyirdi. Onlar aldatmaq, hiylə gəlmək və müxtəlif təriqətlər düzəltməklə zəhmətkeş külləri istismar boyunduruğu altında saxlayırdılar. Onların başlıca hökmləri şəriət məhkəmlərində verilir və təsdiq olunurdu. Bu məhkəmələrin hüquqları isə hüdudsuz idi. Hətta"l846-cı ilə qədər bəylərə və başqa feodallara məxsus olan torpaqların alınıb-satılması çar hökuməti tərəfindən qanuni hal hesab olunmurdu. Bu işlər əsasən şəriət məhkəmələri vasitəsilə həyata keçirilirdi"[1]. Şəriət məhkəmələrinin başında duran qazilər moizələrində doğruçuluqdan, ədalət, insaf və halallıqdan danışsalar da, özləri dövrün hakim təbəqələri ilə əlaqəyə girib riyakarlıq edir, oğurluq, rüşvətxorluq və quldurluğa rəyac verirdilər.

Bu sifətlərinə görə Azərbaycan şairləri ruhanilərin yaramazlığını açıb göstərir geniş xalq kütlələrində onlara qarşı nifrət hissi oyadırdılar. Q.Zakir "Qarabağ qazisi", "Şuşa mollaları haqqında", "Üsuli və şeyxi təriqət mollalarının həcvi" kimi şeirlərində xadimlərinin eybəcərliyini gösrərir, M.F.Axundzadəyə məktublarının birində sözü ilə işi düz gətirməyən vaizlərin ikiüzlülük və yalançılığını ifşa edirdi.

[1]Azərbaycan tarixi.1 cilddə, II cild, Bakı, 1964, s.99.

Vaiz bizə söylər şəri-Mustafa;
Hərama mürtəkib olmayın əsla!
Özü lüm-lüm udur batində, amma
Zahirdə dediyi mənayə bir bax!

İkiüzlü din xadimlərinin, məzhəb və şəriət başçılarının, əxlaqsız mollaların, rüşvətxor qazilərin tənqidi Vazeh, Bakıxanov, Nadim, Canıoğlu, Şeyda, habelə aşıq şeri tərzində əsərlər yazan başqa şairlərin də yaradıcılığında nıühüm yerlərdən birini tuturdu. Şübhəsiz, bu sənətkarların əsərlərində satirik pafos, ictimai kəsər, ifşa gücü, hadisələrin mahiyyətinə nüfuz, həyatı tipik əks etdirmənin bədii dərəcəsi eyni deyildi. Dünyagörüşündən, ictimai-sosial mövqeyindən, yaradıcılıq metodundan və poetik istedadının gücündən asılı olaraq, onlardan, məsələn, Zakir, Vazeh. Nadim və Şakirin yaradıcılığında tənqid, açıq ifşa daha güclü olduğu halda, o birilərdə qismən zəif idi. Bu şairlərin tənqidi hələ onları əhatə edən dövrün, zamanın, bütövlükdə ictimai mühitin konkret milli problemlərinə, mətləb və ziddiyyətlərinə dərindən nüfuz edə, cəmiyyətin ictimai əsasını sarsıda biləcək yüksək gülüş səviyyəsinə qalxa bilmirdi.

Əlbəttə, ayrı-ayrı realist-satirik təfərrüat "ictimai-həyat hadisələri, baş verən siyasi-iqtisadi dəyişikliklər üzərində real müşahidələr Zakirdə (əlavə edək: Şakir, Misgin və Nadimdə - Z.Ə.) çoxdur. Amma onları birləşdirən, izah edən qanunauyğunluq və proses kimi qavrayan konsepsial ictimai baxış zəifdir, daha doğrusu, suxiya şəklindədir"[1].

Üz etiraz və narazılıqlarında "xalqın mənafeyi və mövqeyi ilə ən geniş mənada birləşə bilmədiyi üçün" bu şairlərin həcvləri satiraya məxsus geniş ictimai vüsət və dərinlik qazanmır. Onlar ümumiyyətlə "bəyliyə yox, ayrı-ayrı bəylərə, vaizliyə yox; islamı "xələldar edən" vaizlərə qarşı çıxdığı üçün öz demokratizmində və xəlqiliyində ardıcıl görünə bilmir"[2]. Bu cəhəti Q.Zakirin yaradıcılığında izləyən F.Qasımzadə haqlı yazır ki, ictimai ədalətsizliyi obyektiv surətdə ifşa edən şair "çar hakimləri əleyhinə mübarizə apardığı zaman mütləqiyyətin başqa siyasi bir quruluşla əvəz edilməsi məsələsini əsla fikrinə gətirmirdi. O da Şakir və başqa müasirləri kimi güman edirdi ki, bütün ictimai bəlaları törədənlər ancaq ucqarlarda işləyən çar hakimləridir, guya canişinin və padşahın bu ədalətsiz işlərdən xəbəri yoxdur"[3].

Əsrin ikinci yarısında satirik şeir M.B.Nadim, M.M.Şükuhi və Seyid Əzim Şirvaninin yaradıcılığında inkişaf edir. "Dövlətlilərin xəlvəti işi", "Sərrafiyyə", "Əttar", "Dər həcv ağa Əbdüşşükr Marağayi vəkili-marafiə", "Marağa

[1] Yaşar Qarayev. Realizm: sənət və həqiqət. Bakı, 1980. s.56. :

[2] Yenə orada, s.57.

[3] Feyzulla Qasımzadə. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1974. s.224.

bəzzazlarının yığıncağı", "Kənd əhli və qurd" kimi təmsil və həcvlərində Şükuhi müasiri olduğu insanlarda gördüyü mənəvi naqislikləri - sələmçilik, yalançılıq, saxtakarlıq kimi sifətləri bədii gülüşün hədəfinə çevirir.

Nadim və Seyid Əzimin satiralarında isə yerli bəylərin ikiüzlülük və satqınlığı ilə yanaşı çar məmırlarının rüşvətxorluğu, soyğunçuluğu, ruhanilərin ictimai əxlaqsızlığı kəskin bədii intonasiya ilə tənqid olunur. Xüsusilə Seyid Əzimin "Şirvanın təzə bəyləri haqqında", "Şamaxının təzə bəylərini həcv", "Köpəyə ehsan", "Allaha rüşvət" kimi satiralarında tənqid və ifşanın boyaları olduqca tünddür. Öldürücü gülüş, kəskin istehza, tənqid hədofinə qarşı nifrət və qəzəb hissi, xəlqilik ruhu bu satiraların başlıca məziyyəlləridir.

Bütün bunlar göstərir ki, XIX əsr Azərbaycan poeziyası bizim çoxyaşlı şerimizin inkişaf tarixinə yeni bir mərhələ kimi daxil olur. Əsrin əvvəllərindən ictimai-siyasi və mədəni həyatda baş verən mühüm dəyişikliklər ümumiyyətlə bədii fikrin, o cümlədən poeziyanın yeni istiqamətdə inkişafın şərtləndirir. Qədim və zəngin ənənələri olan lirik və epik şeir bu dövrdə həm bədii-estetik məzmun, həm də poetika-sənətkarlıq, forma-janr və dil-üslub baxımından daha da zənginləşərək orijinal keyfiyyətlər qazanır. Satirik şeir təşəkkül tapır və getdikcə qüvvətlənir...

"XIX əsr Azərbaycan şeri antologiyası" adlanan bu kitabda həmin dövrdə yaşayıb-yaratmış 60-dan çox şairin əsərlərindən nümunələr toplanmışdır. Tərtibçi onları müxtəlif dövrlərdə çap olunmuş kitablardan seçmiş və tarixi-xronoloji prinsip əsasında düzmüşdür. Əvvəlki nəşrlərdə təsadüf edilən bir sıra imla xətaları aradan qaldırmış, kitabda əsərləri gedən sənətkarlar haqqında çox qısa məlumat verilmiş, nümunələrin götürüldüyü mənbələr göstərilmişdir.

*Zaman Əsgərli*

## MƏHƏMMƏD BƏY AŞİQ

Məhəmməd bəy Aşiq XIXəsr şairlərinin yaşca ən böyüyüdür. O, 1776-cı ildə Şuşa şəhərində doğulmuşdur. Alası Behbud bəy Qarabağda məşhur olan Sarıcalı-Cavanşir tayfasındandır. Onun Qarabağ xanlığının ərazisində -Vərəndə və Zəngəzur mahallarında çoxlu kəndləri və obaları vardı. Ömrünün sonlarında Behbud bəy ixtiyarında olan torpaqları iki oğluna Məhəmməd bəyə və Böyük bəyə paylamışdı. Lakin Məhəmməd bəy atasının verdiyi torpaqları qardaşı Böyük bəyə bağışlayıb, özü yenicə aldığı Zəngilan kəndində məskunlaşdı. Burada onun həyatı narahat keçirdi; qayınları ilə onun arasında tez-tez baş verən torpaq çəkişmələri məhkəmə salonlarında davam edirdi. Belə çəkişmələr nəticəsində Rusiya hökuməti Məhəmməd bəyi Ordubada sürgün etmiş və o, həyaının axırına qədər Ordubadda yaşayıb, 1861-ci ildə orada dünyasını dəyişmişdir.

Məhəmmədbəy şeirlərinin bir qismini öz adı, digər qismini "Aşiq" təxəllüsü ilə möhürləmişdir. Onun müxtəlif təzkirələrdə qalan əsərlərini Ənvər Çingizoğlu toplayaraq, 2000-ci ildə Bakıda "Şuşa " nəşriyyatında çap etdirmişdir. Buradakı şeirlər həmin kitabdan götürülmüşdür.

### QƏZƏLLƏR

Necə kim ol sənəmin qəmzeyi-xunxarəsi var,
Dili-zarımda nıənim qanlı ciyərparəsi var.

Dili-əşkimi mənim salma nəzərdən, ey göz,
Dut giranmayə onun səbəyi-səyyarəsi var.

Yar xalına baxan gözdə qaradan qalmaz,
Demə aşiq ona kim, gözlərin qarəsi var.

Dami-təxsirə salır hər yetən azadələri,
Qaşü göz, zülfün əcəb qəmzeyi-məkkarəsi var,

Sanma bikarə məni şahi-hünərməndanəm,
Yığılıb başıma dəhrin nə ki avarəsi var.

Rəngi-zərdim yox əcəb əşk ilə gülgünə dönüb,
Cigərimdə acı müjgan oxunun yarəsi var.

Küfri-zilltün sevəli kamil olub iymanım,
Gərçi bu rəmzlərin şəridə kəffarəsi var.

Bağlanmış silsileyi-kakilə könlüm möhkəm,
Mən kimi yüz min onun Aşiqi-biçarəsi var.

* * *

Aldım qələmi namə yazam, yarə könüldən,
Ya rəb, ola bir məhrəmi aparə könüldən.

Ol qönçə dəhən dilbərə yetkəc dil uzadıb,
Bülbül kimi hər dəm gələ göftarə könüldən.

Tez-tez qoyub ol sərvi-qədin payinə başın,
Tabus qılıb tez ilə yəlvarə könüldən.

Əvvəl alıb nitqi-Məsihadən icazət,
Axır edə hər ərzimi sərdarə könüldən.

Xünbaarlığın dideyi-giryanını bir-bir,
Təqrir edə ol gözləri xunxarə kömüldən.

Pərvanəsifət düşdügümü vadiyi-hicrə,
Hər ləhzə deyə atəşi-rüxsarə könüldən.

Naçarlığımı ərz edə ol şahi-cahar,
Rəhm eyləyibən, bəlkə, edə çarə könüldən.

Keyfiyyəti-əhvalı və həm qisseyi-hicri,
Ərz eyləyə, bilgi verə dildarə könüldən.

Aşiq , qəmi-hicrani yazıb eylədim irsal
Ol zülfiu siyahə bu üzü qarə könüldən

* * *

O qara tellərinə oğru deyim, ya rəhzən,
Ya könlüm məmləkətin qarət edib badə verən.

O münəvvər yüzini gördü məgər ay ilə gün,
Düşdülər dağa-daşa, oldular avarə gəzən.

O gözü qaşın olub qətlim üçün amadə,
Biri şəmşir çəkib, biri yayə düzən.

O xəttü xali-siyahın məxi-rüxsari,
Ləşkəri-hindü həbəş türkə tapıb əl deyəsən.

O qədü qamələ bax, gör nə qiyamət eylər,
Rəşgdən bağə qaçıb, guşə tutub sərvi-çəmən.

O hənalı əlinə, nola, mübarək deyələr,
O ki şirin dilinə şəhdü şəkərdir deyilən.

Ağzına qönçə deyən kəslərin ağzın yummasan,
Görsə bir gəz onu yüz yerdən açar qönçə dehən.

Şikəni-zulfdə dil nalәsi keçdi həddən,
O qarə gündən onu qurtarın, Allahı sevən.

Dürfəşanlıq bu qədər eylədik, Aşiq, bəsdir.
Həm bu dəhrdə bir dərdə yetib qədr bilən.

## QOŞMALAR

Səndən ayrı işim mənim ey dilbər
Gecə-gündüz ahu fəqan olubdur
Tağafül rəhmindən zülmü sitəmi
Bizim barəmixdə ehsan olubdur

Ləhzə-ləhzə halın sorduğun könlüm
Gündə min nəsihət verdiyin könlüm
Daim şadü xürrəm gördüyün konlüm,
İndi dərd əlindən viran olubdur.

Nə istərsən, zalım, mən binəvadan?
Bir gün əl çəkməzsən cövrü cəfadan.
Sanma indi, bil ki, qalü bəladan,
Gözlərim hüsnünə heyran olubdur.

Haçan almamışdın əqlimi sərdən,
Oxudum məhdi-hüsnünə əzbərdən.
O gündən ki saldın gözdən nəzərdən,
Mənim halım çox-çox yaman olubdur.

Heç yada salmırsan mən dilfikarı,
Səni nə bimürvət yaradıb tarı,
Dəhanın şövqündən Aşiqi-zarı
Öldürən bu daği-pünhan olubdur.

* * *

Təzədən bir işə düşmüşəm genə,
Ala gözlü bır şux gəlin sevmişəm.
Mina gərdənini, tər sinəsini,
Rəna qəddin, qulac qolun sevmişəm.

Qədri-qiymət bilən bir əsilzadə,
Namü nişanım deməṇəm yada,
Sərasər əndamı oxşar şumşada,
Nazik ayağların, əlin sevmişəm.

Bəyənmirəm onun məcmui-karın,
Şövqində var idim bir belə yarın,
Xoş ədasın, xoş rəftarü göftarın,
Danışanda şirin dilin sevmişəm.

Görməmişəm belə zülfu dəhən tək,
Yüz min əsiri var, əlbəttə, mən tək,
Gülüstanə düşmüş zağü zəğən tək,
Ay qabaqda siyəh telin sevmişəm.

Müşkin kakilinin sərgəştəsiyəm,
Növki-mujganının dil xəstəsiyəm.
Aşiqəm, zülffünün pabəstəsiyəm,
Üzün, saçın, incə belin sevmişəm.

* * *

Bilirsənmi könlüm, yar, səndən ayrı,
Necə miskin-miskin, natəvan gəzir.
Düşüb səhralara şeydalar kimi,
Sübhü şam bilməz, hər zaman gəzir.

Bir dilbəri-əla, çeşmi məstanə,
Qüssəsindən könül oldu viranə,
Bilmirəm ki, neynəmişəm cananə,
Hər görəndə məndən belə yan gəzir.

Bu dili-divanə, ey şuxi-ali,
Canü dildən sevib ol xəttü xali,
Kakili nıişkinə aşiq olali,
Başın üçün, daim sərgərdan gəzir.

Firqəlindən qara bağrım olub su,
Alıbdır qərarım o zülfu geysu,
Mən ölmüşəm ləli-ləbindən ayru,
Deyirlər ki, cismində bəs can gəzir.

Genə Aşiq unudubdur hər karı,
Sevibdir bir şuxi, çeşmi-xunxarı,
Ol yanağı mahı, lalə rüxsarı,
Necə qıyır, zülfi pərişan gəzir.

* * *

Ey bivəfa, qədir bilməz dilbərim,
Şikayətim səndən bir kitab olmuş.
Yaza bilməz onu xameyi-qüdrət
Çünki həddən keçmiş, bihesab olmuş.

Saraldım həsrəti-ali-ruyindən.
Tapmadım bir rəmz hali-ruyindən.
Dərdimə ol şirin göftguyindən,
Nə bir sual olmuş, nə cavab olmuş.

Müjgan oxun canda o sipər kimi,
Dərin əzizimdir simü zər kimi,
Dil dafinə daim əfilər kimi,
Türreyi-tərrarın piçü tab olmuş.

Qızıl gül həsrətdir o al ruyuna,
Sərvi-səhi qat olubdur buyuna,
Hər gündə üz düşər xaki-kuyuna,
Kəmtərin qulamın afitab olmuş.

Əsiri-zülf olmuş divanə könlüm,
Olubdur Aşiqdən biganə könlüm,
Dağılmış dünyada viranə könlüm,
Bir gün şad olmadı, ol xarab olmuş.

* * *

Səni tarı məndən olma mükəddər,
İncitmə, bu diti-viranı sən, sən.
Neylərəm dünyanı, əzizim, sənsiz,
Bilirəm dərdimin dərmanı sənsən.

Gözəldir camalın, hüsnündür cəmil,
Ölmədim hicrində, qalmışam xəcil.
Başınçün, cy gül, dolansa yüz il.
Könlümün mülkünün sultanı sənsən.

Vamiqin Əzrayə var idi meyli,
Onunçün axardı gozündən seyli,
Yusifin Züleyxa, Məcnunun Leyli,
Mənim də canımın cananı sənsən.

Hər nə ki ərz etdim, ona yetmədim,
Şad eyləyib bizi, gəlib getmədin.
Könlüm alıb, bir yol qəbul etmədin,
Bu qədər ki, çəkdim imanı, sənsən.

O gizli baxışın alıbdır canı,
Cadu qəmzələrin verməz imanı.
Tarı hifz eyləsin növki-müjganı,
Aşiqin qatili-pünhanı sənsən.

**GƏRAYLILAR**

Qan ağlar can quşu daim,
Rəhmsiz səyyad əlindən.
Öldürməz, eyləməz azad,
Ha çəkər fəryad, əlindən.

Sultani-eşqidir zalım,
Yaman yerə yetib halım,
Dil şəhri ilə xəyalım,
Olubdu bərbad əlindən.

Zülmündən ol sitəmkarın,
Naləsindən dili-zarın,
Bir neçə gün ruzigarın,
Olmadım dilşad əlindən.

Növki-mujganları səf-səf,
Eşq əhlini qılmış hədəf,
Atsa yayınmaz hər tərəf,
Çıxmışlar ustad əlindən.

Gözlərini Aşiqi-zar,
Sevəndən bəridir bimar,
Məni, tari, öldür, qurtar,
Ol iki cəllad əlindən.

* **

Aşıqinəm sənin axı,
Əzəl qadasın aldığın.
Cana vurub məhəbbətin,
Çəngəl, qadasın aldığım.

Can çıxır, könül neyləsin,
Dərdini kimə soyləsin?
İstər sədaqət eyləsin,
Tez gəl, qadasın aldığım.

Salma könlün iztiraba,
Zülfün içrə piçü taba,
Sataşma xanəxəraba,
Dincəl, qadasın aldığım.

Seyrəqibdən iba qılla,
Kuyində görmüşəm, özləm,
Rəşkdan sayəni billəm,
En gəl, qadasın aldığım.

Qulum deyib, ey şahzadə,
Salmadın Aşiqi yada,
Olurmu sən tək dünyada,
Gözəl, qadasın aldığım?!

## ABDULLA CANIOĞLU

*XIX əsr Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələrindən olan Abdul Canıoğlı 1780-ci ildə Şuşada doğulmuşdur. Əsas məşğuliyyəti ticarət və kimyagərlik olan Abdulla Camoğlu dövrünün qabaqcıl ziyalıları, şair və musiqiçiləri ilə yaxınlıq və dostluq edərmiş. Gözəl təbi varmış; həm klassik poeziya, həm də folklor üslubunda lirik və satirik şeirlər yazmışdır. Xüsusilə həcvçilikdə çox məşhur olmuşdur. Əsərlərinin bir qismində "Qənbər" təxallüsü işlətmişdir.*

*A.Canıoğlı 1838-ci ildə vəfat eimişdir. Onun yaradıcılığından nümunələr Hüseyn Əfəndi Qayıbovun "Azarbaycanda məşhur olan şüəranın əşarına məcmuədir" (I cild, 1986), Məhəmmədağa Müctəhidzadənin "Riyazül-aşiqin" (1995) və Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" (1998) kitablarından götürülmüşdür.*

### QƏZƏL

Müəttər qıldı eşq əhlin dəhanın nəfyü isbatı,
Yəqin oldu mənə kim, var-yoxdandır onun zatı.

Nə şirindir dəhanın söhbəti, ləli-ləbin hərfi,
Ki, təlx olmuş ləbi-ləlindən ayrımlar ovqatı.

Cəhan zülmət sarayın rövşən etməzdi, əgər yüz gəz,
Yüzündən kəsbi-ənvar etməsəydi şəms miratı.

Dağıtdı əğdi-zülfün dövri-ruyindən səba, guya,
Tülui-sübgahı nurdan fərq eldi zülmatı.

Gözün gördüm, xətadan olmadım xali, müsəlmanlar,
Xuda küffarə mərcu etməsin həm beylə afatı.

Məqaləti-ləbin babində natiq İsavü Məryəra,
Xətü xalü rüxün haqqında nazil müshəf ayatı.

Ləbi-ləlin sevənlar etmədi kövsər təmənnasın,
Səri-kuyin görənlər şövqdən tərk etdi cənnatı.

Nə mümkün kakilündən ömri-kutahilə kam almaq,
Könül, başdan çıxar, tul etmə bu batil xəyalatı.

Dəhanın zülməti-pünhanə çəkdi abi-heyvanı,
Quban-xətti-ruyin həsrəti tar eldi miratı.

Bəla peykanı dolmuş canə yüz qat, ey gözüm nuru,
Xədəngin saxla ondan kim, dəmirdəndir onun qatı.

Hava səqfində quşlar kamiyab olmaq xədəngindən,
Həsəddən sıçrayıb əflaka çıxdı ahımın atı.

Səgi-kuyina nəzr etmiş cigər pərgaləsin könlüm,
Səadətdir ona məqbuli-dərgah olsa xeyratı.

Xədəngi-çeşmi-məstin sineyi-məcruha mərhəmdir,
Təğafül qılma Abdullaha mərsul et bu sovqatı.

**MUXƏMMƏSLƏR**

Ah kim, qalmadı can cismdə canan gedəli,
Oldu hər yerdə ki, canan gedəli, can gedəli,
Tutdu zülmət göz evin şəmi-şəbistan gedəli,
Oldu viranə könül kişvəri, sultan gedəli,
Yəni sərdari-cahan, sərvəri-dövran gedəli.

Gül üzün görməyəli olmadı xəndan güllər,
Şəra odlara yanıb, başına qoydu küllər,
Zülfı sövdasi ilə dərhəra olub sünbüllər,
Necə fəryadü fəğan eyləməsin bülbüllər –
Ki, olub xar ilə həmdəm güli-xəndan gedəli.

Çərx rəhm eyləmədi dideyi-giryanımıza,
Qoydu həsrət bizi ol şəmi-şəbistanımıza,
Atəşi-bicr ilə od saldı bizim canımıza,
Sancılıb navəki-qə sineyi-suzanımıza,
Guşeyi-çeşmdən ol kipriyi peykan gedəli.

Çıxdı çün Şişədən ol mahliqa misli-gülab,
Şişə əhlinə bu vəclı ilə həram oldu şərab,
Sındı başlarda həva şişəsi manəndi-hübab,
Oldu aləmdə fərəh gülşəni bümərrə xərab,
Üzü gül, kakili sünbül, xəti reyhan gedəli.

Çəkəli bəzmdən ol ləbləri meygun ətəyin,
Doldurub qan ilə sağər dili-pürxun ətəyin,
Əşk seylabı tutar aşiqi-məhzun ətəyin.
Nalə fəryadü fəğanım tuta gərdun ətəyin –
Ki, qara oldu günüm ol məhi-taban gedəli.

Mənəm ol qumriyi-miskin ki, salıb aləmə səs,
"Sərv ku-ku" deyərəm hüzn ilə ta qəti-nəfəs,
Abü danəm ələmü qüssə, yerim künci-qəfəs,
Bir zaman eyləməzəm seyri-gülüstanə həvəs,
Səhni-gülzardan ol sərvi-xuraman gedəli.

Məqsədim rövzeyi-kuyində budur şamü səhər –
Ki, bula feyzi-vüsalında ziya dideyi-tər,
Ola xaki-qədəmin sürmeyi-ərbabi-bəsər,
Qılasan gülşəni-kuyində olan murə nəzər,
Görəsən kim, necədir halı Süleyman gedəli.

* * *

Ey ki, zülmətgəhi-zülf içrə üzün misli-çıraq,
Məstü sərxoş gözünə qarşı yaman gözlərə ağ,
Olmasın xaki-dərin guşeyi-çeşmimdən uzaq,
Ləblərindən dəhənim dərdə dəva etdi soraq,
Söylədi: ağzıma innabi-ləbü sibi-buxaq.

Baxdı mərdüm yüzinə, saldı nəzərdən ayi,
Qıldı xəm şöhrəti-əbruyi-lətifin yayi,
Qədrü qiymətdə deyil ləl ləbin həmtayi,
Həvəsi-zülfi-siyahınla olub sövdayi –
Ki, çəkib silsileyi-kakili-tərrarə daraq.

Görünür çöhrələrin laləyə gülgun, gülə al,
Qoymadı al ilə ruyin dili-ayinədə hal,
Sürmeyi-şux gözün fitnəyə saldı filhal,
Qıldı izhari-şərəf Kəbeyi-rüxsari də xal,
Vərəq üz sürtdü qədəmgahına gülgunə yanaq.

Kakilin şanələnir zinəti-duş etmək üçün,
Xoş gəlir xəlqə ləbin hərfi nüyuş etmək üçün,
Dil dilər şərbəti-göftarını nuş etmək üçün,
Xəlqdən vəsfi-bənaguşunu guş etmək üçün,
Bəhr açdırdı sədəfdən düri-qəltanə qulaq.

Gül xitab etsə sənə, qönçə ona eylər itab,
Qönçə kimdir ki sənə qarşı durub verə cavab?
Baxsa hər dəm üzünə şərmdən olmazmı gülab,
Nədir ayinə görən dəmdə səni eyləyə tab,
Əksi-ruxsarın ona olmasa mənada dayaq?!

Dursa ayinə, müqabil üzünə qılsa nəzər,
Ona üz vermə, nəzərdən sal onu şamü səhər,
Tazədən qoyma ola dövri-yənağında əsər,
Vəsməvü sürmə gözü qaşına meyl etsə əgər,
Sürməni seyrə salıb vəsməyə qıl qaş-qabaq!

Hüsnünə aşiqi-sadiq demə hər gümrahi,
Aşiq olduryaxa çərxi dili-atəşgahi.
İmtəhan eylə şəbi-hicrdə Abdullahi,
Şöleyi-ahına gər yanmasa çərxin mahi,
Tiğ çək, başım kəs, şəm kibi atəşə yaq.

## BABA BƏY ŞAKİR

*Baba bəy Şakir təxminən 1780-cl ildə Qarabağ mahalının Mehriban kəndində bəy ailəsində doğulub, 1845-ci ildə ölmüşdür. Qasım bəy Zakirin qohumu və yaxın dostu olmuşdur, Zakir Baba bəyin vəfatı münasibəitilə məşhur Maddeyi-tarixi-Baba bəy" şerini yazmışdır. Baba bəyin bədii irsindən çox az miqdarda satirik və lirik əsərləri məlumdur. Önların bir qismi əruz, digər qismi heca vəznindədir. Satiralarında fitnəkar bəylər, mövhumat və cəhalət yayan ruhanilər, rüşvətxor, zülmkar məmurlar, komendant, qubernator, sərdar və b. ali rütbəli dovlət qulluqçuları kəskin tənqid olunurlar.*

*Şairin əsərlərindən örnəklər onun "Seçilmiş əsərləri" (1985) kitabından götürülmüş, mətnlər şeirlərin əvvəlki nəşrləri (Məhəmməd ağa Müctəhidzadə Riyazül-aşiqin. İstanbul, 1910; Baba bəy Şakir. Şeirlər. Bakı, 1927) ilə tutuşdurulmıış, tərtibçinin "müasirləşdirmələri " aradan qaldırılmışdır.*

### QOŞMALAR

Mürği-ruhum təndə durmaz, dövr edər,
Yenə canan düşdü yada, ay mədəd!
Qərib ölkə, baş yastıqda, göz yolda,
Kimim var ki, yetə dada, ay mədəd!

Diyari-qürbətdə mən bəxtiqarə,
Bir dərdə düşmüşəm, bulunmaz çarə;
Bilsəm, badi-səba yetirər yarə,
Çəkərəm bir qəlbi səda, ay mədəd!

Sübhü şam gözümdən tökərəm qanlar,
Görüb yar, müsahib üzümti danlar...
Hər diyara qəflə işlər, yaranlar,
Gələn yoxdur bu bərbada, ay mədəd!

Gözdən saldım gözəllərin cəmini,
Yəqubun bağladım dərdü qəmini,
Seyü-əşkim tutdu ruyi-zəmini,
Tapmadım, əyləşəm, ada, ay mədəd!

İzn olmadı, qucam incə belindən,
Öpəm dodağından, əmam dilindən.
Mən Şakirəm, bir zalımın əlindən,
Cavan ömrü verdim bada, ay mədəd!

* * *

Şamü səhər qan süzüldü didəmdən,
Razi-dilim pərizada yetmədi.
Gah yalvardım, gah döşəndim payinə,
Kar guşinə nalə, səda yetmədi.

Tora saldı canan könül quşumu,
Aldadıban sərdən aldı huşumu.
Qatdı fələk qovğalarla başımı,
Rəhmə gəlib yar imdada yetmədi.

O gözləri şəhla, qaməti bəstə,
Anlamaz, nə çəkir Şakir şikəstə,
Didari şövqündən düşübdü xəstə,
Ömür keçib, bir murada yetmədi.

* * *

Qaradır üzümüz haqq dərgahında,
Kef üstə kef gələr damaq üstünə.
Vilayət məğşuşdu, zülm bihesab,
Bir üz də salarıq yamaq üstünə.

Bu dövranda hünər söhbəti bitdi,
Bərəkət qeyb oldu, kişilik itdi,
Kərəmli kişilər rəhmətə getdi,
Kələf çözələndi yumaqüstünə.

Naiblər mahalı xali tapdılar,
Bəyzadələr kənd - kəsəyi çapdılar,
Daşdan yumşaq nə gördülər, qapdılar,
Qapqara yaxdılar dümağ üstünə.

Çuxam çula dönüb, yırtılıb kürküm,
Keçib boğazıma sürtülmüş börküm.
İnsafdan, mürvətdən danışsa hər kim,
Tökülər yüz yerdən çomaq üstünə.

Kimin ki başından aşardı varı,
Tapılmaz evində bir çanaq darı.
Yollanaq Tiflisə, tapaq sərdarı,
Hərəmiz bir yandan cumaq üstünə.

**GƏRAYLI**

Nə müddətdi o biilqar
Mənimlə göz-gözə gəlməz.
Boş, bihudə sözdən ötrü,
Yar yarınnan sözə gəlməz.

Eşqinə can verə-verə,
Müştaq idim o dilbərə,
Tor qurmuşam nahaq yerə,
Ahu olub düzə gəlməz.

Az qalıb ki, fitnə-feli,
Şakiri eylə dəli
Qapı-qapı gəzər eli
Şakın eləyə dəlı,
Yön çevırıb bızə gəlməz.

**TƏNQİDİ ŞEİR**

QUBERNİYA BİNA OLANDAN BƏRİ

Quberniya bina olandan bəri,
Oğrunun hər biri bir xanə dönüb;
Yox yetişən ərzə, divan eyləyən,
Dağılıb vilayət, viranə dönüb.

Murovlar buyurur oğurlayın at,
Naçalnikdən eyləməyin ehtiyat,
Olmaz urusluqda eyləmək isbat,
Onunçün tülkülər aslanə dönüb.

Dəxi bizdə qalmayıbdır day, dana,
Gedirik sərdarə yetişdik cana,
Olubdu oğrular sahibi-xana
O ki ev sahibi, mehmanə dönüb.

Var idi on atım, iyirmi malım,
Qərəz, bir tövr ilə keçirdi halım,
Yığıb bir hal ilə apardı zalım,
Qapımız sovrulmuş xırmanə dönüb.

Bu əsrdə olan sahib-ixtiyar,
Tamam oğurluqda olubdur pərgar,
Yatmayıb sübhədək dartar nə ki var,
Qarabağın malı bostanə dönüb.

Qalmışıq məəttəl sultanlı, xanlı,
Əgər belə keçsə, qalmaz bir canlı,
Kürün o tayında olurdu qanlı,
Şimdi bu dağılmış Şirvanə dönüb.

Deyirlər bu saat Qanlı İsmayil
Bir milyon dövlətə olmayır qayil,
Kəsib Əriklini misli-Əzrayü,
Bac alır hər gələn karvanə dönüb.

Rəsuldan şərm yox, Allahdan da bim,
Allah rizasına danışmaz heç kim,
Qarabağ düzəlməz, mənim əzizim,
Çünki öz əhlimiz şeytanə dönüb.

Əmiraslan idi əvvəl talançı,
Gecə-gündüz qırqə gəzən dilənçi,
Uzun nəfəs, mütəqəllib, yalançı,
Şimdi aləm Əmiraslanə dönüb.

O ki Şahnazoğlu hamıdan başdı,
At Rəhmin oğlu ilə yoldaşdı.
Kələntərli Göyüş, şirvanlı Daşdı,
Ağamməd qardaşı Qurbanə dönüb.

Bu dörd-beş dananın əlində zarıq,
Apardı hər nə var qüttaüttəriq,
Zülm ifrat, mənzil irağ, at arıq,
Qaradağlı bizə Tehranə dönüb.

Murovlar oğrunu buyurur gündə,
Girin pusqusuna, gözləyin gendə,
Görün sala bilirsizmi kəməndə,
Heç deməz, it oğlu ceyranə dönüb.

Bu nə qubernator, bu necə sərdar?!
Dağılıb vilayət, oldu tarımar;
Cəldlənibdir rüşivətə murovlar,
Xəlqin işi ahü əfqanə dönüb.

Bundan əqdəm ellər gedərdi dağa,
Məhəbbət eylərdi düşən qonağa,
Şimdi gedə bilməz evdən irağa,
Kişiyə dövləti zindanə dönüb.

O ki Əfətlinin özgədir karı,
Tamam olarındır ölkənin varı,
Razıyıq verələr bizə bir xarı,
Bir ədna gədəsi sultanə dönüb.

Qarabağın həramisi, yalanı,
Üstə düşsən danışmazlar yalanı,
Şimdi derlər təqəllübdə
Kolanı Cəmilliyə, Kürdüstanə dönüb.

Rzaqulu oğlu Şirvanlı Səfi,
Nəsibin, əlbəttə, veribdir dəfi,
Dağıdır əqmişə, alır əşrəfi,
Hər biri bir tülək tərlanə dönüb.

İmirlilər-Sübhanverdi uşağı
Bir gecə evində yoxdu yatmağı,
Kəm olmaz evində oğru qonağı,
Hamsı İsmayıla, Zamanə dönüb.

Qızılhacılılar gəzər eşşəkli,
Altı köhlən atlı, yanı yedəkli,
Sarbanlı, Şatırlı, həm Rəcəbbəgli,
Gəncəli Sadığa, Qurbanə dönüb.

Səsindən guşumuz batıb atlının,
Kimdir yetə fəryadına kəndlinin,
Küllühüm Qarabağ, Bayəhmədlinin
Əlində bendeyi-fərmartə dönüb.

Piriməli, Həsənli, Nayibalılar,
Qovzanlı mülkündə olan nə ki var,
Gəlir hər tərəfdən misali-bazar,
Mal alan, mal satan meydanə dönüb.

Şərm, həya qalmayıbdır bizlərdə,
Oğurluq, xudkeşlik olub bipərdə,
Onunçün düşmüşüz hərə bir dərdə,
Tapılmayır çörək, dərmanə dönüb.

Deyil burda olan işlərdən agah,
Belə məlum, ədalətli padişah,
Xalqın fəryadına yetişsin Allah.
Bu dövran bir özgə dövranə dönüb.

# KAZIM AĞA SALİK

*XVIII əsrin sonları, XIX əsrin birinci yarısında yaşamış Kazım ağa Salik istedadlı şairlərdan biridir. O, Azərbaycan ədəbiyyatında həm klassik poeziya üslubunu, Füzuli ənənələrini, həm də Vaqif ədəbi məktəbini davam və inkişaf etdirmişdir.*

*Əsli Şəmkir vilayətindən olan Salik 1781-ci ildə Qazax mahalının Şıxlı kəndində anadan olmuş, ilk təlim və tərbiyəsini də orada almışdır. Uşaqlıq illərindən yaşadığı mühitdə dərin hörmət qazanan şair gənclik illərini də fərəhli və şən keçirmiş, heç bir maddi sıxıntı görməmişdir. O, həyata həmişə nikbin gözlə baxmış, müasirlərini dünya nemətlərindən zövq almağa çağırmış, əsərlərində şən yaşamağı, mənalı ömür sürməyi təbliğ etmişdir. Lakin qoca vaxtlarında əvvəlcə qardaşı Mustafa ağa Arifin, az sonra qızı Xeyrannisənin, daha sonra isə yaxın dostu və həmdəmi Yəhya bəyin ölümü Salikin səhhətinə ağır təsir göstərmiş, o, bədbinləşərək həyatın etibarsızlığından, ömrün vəfasızlığından şikayətlənmişdir.*

*Kazım ağa Salik 1842-ci ildə vəfat etmişdir. Əsərlərindən nümunələr 20 cildlik "Azərbaycan Klassik Ədəbiyyatı Kitabxanası"nın VIIIcildindən (1988) götürülmüşdür.*

## QƏZƏLLƏR

Yenə bır mahlıqa şolə salıb bag içrə,
Sanki tavusi-çəmən çətr vurub zağ içrə.

Demə, bu bağə yaraşmaz bu kəmalü bu cəmal,
Mədəni-zər tapılır, gər arasan, dağ içrə.

Zülfu xab görünür ruyi-səmən üzrə nə xoş,
Nə əcəb, türfə düşüb rəngi-qarə ağ içrə.

Yandı canım, bədən içrə şəbi-hicrində bunun,
Necə kim şəm yanar hər gecələr yağ içrə.

Baxma, Salik, qocalıbsan, gözələ, fikr elə kim,
Kim qoyar ruzi-bəhadə aruği çağ içrə.

* * *

Möhnətindən daima halım pərişandır, fələk!
Dəmbədəm aləm ləbindən içdiyim qandır, fələk!

Var isə bir özgə dövramn, onu göstər bizə,
Yoxsa ki, yaxşı dolanmaz bu nə dövrandır, fələk?

Bu nə sövdadır edirsən, ona kim razı olub?
Verdiyin dərdü bəladır, aldığın candır, fələk!

Sudi yox, nöqsanı çox, bir bibinadır sərmayəsiz,
Gər hesab etsən, ziyadə xəlqə nöqsandır, fələk!

Sən dəxi bir etdiyindən etiraz et, etiraz,
Cümlə aləm gərdişindon didəgiryandır, fələk!

Sən nə afətsən ki, səndən hiç can bulmaz rəha.
Ya gəda, dərvişü ya soltanü ya xandır, fələk!

Salikəm, əl çəkmişəm mən böylə sövdadən, yəqin
Çox çətin sövda edirsən, sanma asandır, fələk!

Ey xudanı fikr edən, gəl kuhsarın fikr qıl,
Gunə-gunə tər şükufə, laləzarın fikr qıl!

Asimanə qıl tamaşə, mehrü məh seyrinə bax,
Munca kuhi Bisütuni-bərqərarın fikr qıl!

Gah qırağında qərar et, mövc edən dəryanı gör,
Gah dərya içrə əyləş, həm kənarın fikr qıl!

Əbrü badü bərfü baranın qamusun qıl xəyal,
Bu kəmalı qıl təfəkkür, fəsli-çarın fikr qıl!

Gah dərdü qəm verir könlə, gəhi zövqü sünır,
Gündə yüz gunə dalanan ruzigarın fikr qıl!

Dövlətü mal ilə nadan dəstini qılmış fəraq,
Təngdəst etmiş cahanda huşyarın, fikr qıl!

Demə kim, quşlar həvadə pər ilə pərvaz edər,
Yerdə xoş rəftar edən bipay marın fikr qıl!

Kimsə baş açmaz xudanın etdiyi əfaldən,
Sirrinə yetməz fərasət ruyi-karın fikr qıl!

Həqq özün ayinəvəş rövşən qılıbdır aləmə,
Leyk anı bilməyə qəlbinin qubarın fikr qıl!

Fikr qılma kim, görüm dünyada ol ayinəni,
Hiç kəs görməz bu gün, bəs, razi-yarın fikr qıl!

Öylə pünhandir ki, pünhanlıqda olmuşdur əyan,
Etmə pünhanın təxəyyül, aşikarın fikr qıl!

Müxtəsər, elmi-lədünni hikmətin bilməz bəşər,
Əmrinə eylə itaət, zicrü narın fikr qıl!

Pənc ruzin, Salika, pəncahə yetmiş, eylə şükr,
Etibar etmə cahana, etibarın fikr qıl!

## MÜXƏMMƏSLƏR

Agah et, ey bad, məndən ol vəfalı həmdəmi,
Söylə, gəl gör əşkdən ruyimdə bəhri-əzəmi,
Çarə qıl kim, qərqi-ab etmiş məni çeşmim nəmi,
Vəqtdir, ey Nuhi-dövran, gəl ki, gəlmişdir dəmi,
Yoxsa bu tufana sənsiz çarəsaz olamaz gəmi.

Hanı Rüstəm Zal, yəni pişvayi-pəhləvan?
Hanı ol divi-səfidə vurduğu gürzi-giran?
Hanı ol Əfrasiyab, İsfəndiyari-qəhrəman?
Cümləsin qüllabinə çəkmiş qəzayi-asiman,
Leyk qılmış sənglax çərx Rəxşi-Rüstəmi.

Aləmi təxsirə salmış fitnəvü ali-fələk,
Aləmə məlumdur kim, böylədir hali-fələk,
Aqilü nadan olubdur cümlə pamali-fələk,
Sərvqədlər qədini əymişdir ol zal fələk,
Gör necə zali-fələk təsxirə salmış aləmi.

Düşmənidir bu zamanda hər kişi öz canının,
Fərqi yoxdur bir-birindən aqilü nadanının,
Vay, yüz nıin əlindən ədlsiz dövranının.
Dərd üçün heç bir təbibin sudi yox dərmanının,
Bu zəmanə zəxminin yox bir müvafiq məlhəmi.

Demə bu zəxmin, təbiba, bunda yoxdur çarəsi,
Məlhəmi-vəslət dilər bu tiği-hicran yarəsi,
Qərqi-xun eylər cahanı çeşmimin fəvvarəsi,
Olmuşam dəşti-fənadə Arifın avarəsi,
Gəl ki, pamal eyləmişdir Saliki hicran qəmi.

* * *

Məlahət gülşənində bir güli-həmrayə həsbəndəm,
Fəsahət kişvərində bülbüli-şeydayə həsbəndəm,
Lətafət mədənində gövhəri-yektayə həsbəndəm,
Səbahət aləmində bir mələksimayə həsbəndəm,
Budur, xislətdə bir şuxi-qədi-rənayə həsbəndəm.

Alıbdır aqlimi məndən, edib Məcnunü divanə,
Salıbdır tazədən rəxnə bu gün həm dinü imanə,
Tərəhhüm eyləməz zalim məni-bisəbrü səmanə,
Ləbi-ləlin həvasindən dönübdür bağrımız qanə,
Əcəb şuxi-qəmərtələt, cahanarayə həsbəndəm.

Tərəhhüm et, məni qılma cahan mülkündə avarə,
Məni məcnun edən sənsən, kim etsin dərdimə çarə?
Ləbi-nuşin dəvasindən tələttüf eylə bimarə,
Xədəngi-tiri-müjganın edibdir sinəmi yarə,
Billuri-safü simin gərdəni-minayə həsbəndəm.

Qaşın qövsi-qüzehdir, ya hilali-eydi-əzhadır?
Dü zülfün türreyi-Leyla və ya zülfı-çəlipadır?
Üzün gündür və ya atəş və ya nuri-təcəlladır?
Ləbin yaquti-biqiymət və ya ləli-Mosihadir?
Mən an çeşmani-məftun, nərgisi-şəhlayə həsbəndəm.

Olubdur mürği-dil məhbus daim zülf damanında,
Edər ləlin təmənnasın həmişə şövqi-canında,
Əgər küstaxlıq etsəm, zərafatlıq məqamında,
Hərəc yoxdur mərizə, həq buyurmuş öz kəlamında,
Mərizi-eşqəm əvvəldən, ruxi-zibayə həsbəndəm.

Sərasər cüstcu etsən, əgər şövq ilə dünyani,
Tapılmaz mən kimi aşiq sana, ey Yusifi-sani,
Mənə bihudə cövr etmə ki, tərk etməm bu sövdani,
Olur ya mətləbim hasü və ya ömrüm olur fani,
Riza ver, ya ki, cəng eylə ki, mən dəvayə həsbəndəm.

Qələm divanəyə yoxdur, mənəm Məcnuni-bipərva,
Edib əşkim məni aləmdə həm bibakü həm rüsva,
Alıbdır dinü imanım, edibdir ömrümü yəğma,
Bu yolda Salikəm, billah, vurubdur başıma sövda,
Nə bakim var bu aləmdən ki, mən üqbayə həsbəndəm.

## QOŞMALAR

Ey Leyli, mən səni görəndən bəri
Məcnun olub biyabanə düşmüşəm.
Ləbi-lolin rəngi getməz fikrimdən,
Müxtəsər ki, əcəb qanə düşmüşəm.

Mən müştağam onun nazü cəncinə,
Tab eylərəm cəfasına, rəncinə,
Əl yetirdim yaxasının gəncinə,
Gör nə bağə, nə bostanə düşmüşəm.

Boyun tənə edər sərvü çinarə,
Püstanların dəxi lirauvü narə,
Məni bundan kim çıxarır kənarə,
Nagah çahi-zənəxdanə düşmüşəm.

Nuk-müjganın tökdü əşki-ahını,
Zülfun pozdu cəmiyyəti-halımı,
Görməmişəm sənin kimi zalımı,
Çox davaya, çox divanə düşmüşəm.

Salikdir ləqəbim, Kazımdır adım,
Bilirsən ki, səndən sənsən muradım.
Demə nədir bunca ahü fəryadım,
Bir bülbüləm, gülüstanə düşmüşəm.

* **

Ey ağalar, məni neyçün qınarsız,
Nə müddətdir mən o yarı gormənəm.
Mən ha qınayardım eşqə düşəni,
Daxi eşq əhlini karı görmənəm.

Mən gəzdiyim o bir şirin candadır,
O da mənim kimi natəvandadır,
İtirmişəm heç bilmənəm handadır.
Şirin dilli xoşgöftarı görmənəm.

Binəva Salikəm bağrımda zədə,
Həq bilir ki, gözüm yoxdur kimsədə,
Sözü bizimlədir, qəlbi özgədə
Ol səbəbdən büqran görmənəm.

# QASIM BƏY ZAKİR

*XIX əsrin birinci yarısı Azərbaycan şerində xüsusi yer tutan Qasım bəy Zakir miili realizmin ilk görkəmli nümayəndələrindən biridir. O, feodalizm Cəmiyyətinin eyiblərini ifşa edən, zəhmətkeş xalqa yaxınlaşıb onu müdafiə edən bir sənətkar olmuşdur.*

*Zakir 1784-cü ildə Şuşa şəhərində varlı bəy ailəsində doğulmuş, ömrünün çoxunu Qarabağ hakimi Mehdiqulu xanın ona bağışladığı Xındırıstan kəndində keçirmişdir. Şair xalqı istismar edən yerli bəyləri, ruhaniləri, çar məmurlarını əsərlərində daim tənqid etdiyi üçün özünə çoxlu düşmən qazanmışdır. Onlar ədavət hissi ilə şairi dolaşdırmaq, həbsə aldırmaq üçün tədbirlər düşüınüb, fürsət axtarmış və nəhayət, bəhanə tapmışlar. Onlar Zakirin qardaşı oğlu Behbudun qaçaqçılıq etdiyi və rəsmi idarələrdə gözdən düşmüş kürəkəni Əlibəy Fuladovla yaxından əlaqə saxladığı barədə hökumətə xəbərçilik edərək şairi ailəsilə birlikdə həbsə aldırmışlar,*

*1849-cu ilin oktyabrında Zakir Bakıya sürgün edilmişdir. Bir neçə ay həbsxanada qaldıqdan sonra yaxın dostlarının - M.F.Axundzadə, I.Qılqaşınlı, Axund Əhməd Səlyani və başqalarının köməyi ilə həbsdən azad edilmiş, yenidən Şuşaya qayıdaraq ömrünün axırına qədər polis nəzarəti altında yaşamışdır.*

*1857-ci ildə Şuşada vəfat etmiş və oradakı Mirzə Həsən qəbristanlığında dəfn olunmuşdur. Şairin yaradıcılığından örnəklər onun 1964-cü ildə çap olunmuş "Əsərləri "ndən götürülmüşdür.*

## QƏZƏLLƏR

Sən onda elə zövqü səfa bağ arasında,
Mən munda yanum piltə kimi yağ arasında.

Peykanlarını sineyi-çakimdə görən der: -
Bir qönçeyi-tərdir ki bitib bağ arasında.

Könlüm quşunu seyd elədi qəmzəvü çeşmin,
Qorxum budu qanlar düşə ortaq arasında.

Getmişdi saçı seyrinə, dil gəlmədi, bişək,
Güm oldu şəbi-tardə sığnaq arasında.

O1 guşeyi-əbruydə çeşminmidi, yoxsa,
Yatrmş iki Xütən geyiki tağ arasında?

Nasehlər edir mən məni mütribü meydən,
Əfsus ki, qaldım neçə sarsaq arasında.

Zakir, rəhi-eşqində diriğ eyləmə canı,
Ta nami-nikuyin qala üşşaq arasında.

* * *

Gərçı tutub aləmı şunşu qovğayı-eşq,
Yoxdu cahanda, vəli mən kimi rüsvayi-eşq.

Canü dilü əqlü huş cüralə müsəlləm ona,
İndi nədir bilməzəm daxi təmənnayi-eşq.

Xuni-dili dişrəyə mərdümi-çeşmim tökər
Kim, gərək ari ola mənzilü məvayi-eşq.

Dur yola düş, ey təbib, çarə mənim dərdimə,
Ləli-ləbi-dilbəri yazmış ətibbayi-eşq.

Vaizi-əfsanəgu dün məni neyrəng ilə,
İstər idi döndərib eyləyə tərsayi-eşq.

İş mana qalsaydı gər, keçmiş idim badədən,
Tale edib yarlıq, qoymadı danayi-eşq.

Dərgəhi-piri-muğan - məlcəyi-əmnu əman.
Xanəgəhi-meyfüruş - bəzmi-dilarayi-eşq.

Zahidi-sahilnişin, bəhri-bəladan saqın,
Kamə çəkər Yunisi mahiyi-dəryayi-eşq.

Sal təni-napakinə xirqeyi-sədparəni,
Hər qədə layiq dögül xələti-zibayi-eşq.

Qeyslə həmdərs idim, qaldı o "Vəllyl"də,
Naqis imiş, olmadı vaqitı-mənayi-eşq.

Badiyeyi-hicrdə Zakiri-gümgəştəyə,
Oldu əcəb rahbər mürşidü mövlayi-eşq.

* * *

Can cilvələnir qaməti-mövzunu görəndə,
Dil tazələnir arizi-dilcunu görəndə

Zənciri-vününə birə yüz rəğbətim artır,
Rüxsari üzə pirəfsunu görəndə

Pürpiç oluram, hərdəm oda düşmüş ilan təki
Ol arizi-gülnardə qeysunu görəndə

Dağıldı xiridari-qəmi-eşqin olanlar,
Bu mərdümi-çeşmim tökən altunu görəndə.

Gəlmişdim edəm mərdümi-çeşminlə müdara,
Bildim ki, düzəlməz bu iş əbrunu görəndə.

Xunxarəligi eyb degil nərgisi-məstin,
Hər kim ola qaynar qanı gülgunu görəndə.

Ey əhli-hünər, cəm degil Zakir həvası,
Eyb eyləmə şerindəki məzmunu görəndə.

* * *

Yoxdu bu bəzmdə gərçi sitəmi-yarı görən,
Eylə bilsin ki, görüb dideyi-xunbarı görən.

Munca kim zülm edər, insafü mürüvvət axır
Salacaqdırmı onun könlünə bir tarı, görən?

Xəstədillər nə çəkir bəstəri-möhnətdə, bilir
Nərgisi-məstə baxan, qərazeyi-xunxarı görən.

Aşiqin halı pərişanü təbah olduğunu
Fəhm edər zülfi-pərişanü siyəhkarı görən.

Tuta gər Yusifi-gümgəştə nəbati-Misri,
Eyləməz meyl ləbi-ləli-şəkərbarı görən.

Yanar əhvalına nəvvnəsifət şanələrin,
Piç-tabü girehi-türreyi-təvvarı görən.

Mütləqa ol məhi-bimehrə dəxi meyl etməz
Künci-qürbətdə gəlib Zakiri-bimarı görən.

* * *

Qəsdin budu gər xatiri-biçarə dağılsın,
Bir şanə çək ol türreyi-tərrarə dağılsın.

Ver zib ruxi-alma, çıx xanədən, ey məh,
Məh daldalanıb, əncümü səyyarə dağılsın.

Tənha dili-məhzunə həqiqətdə cəfadır,
Bir parə oxundan de təni-zarə dağılsın.

Açmış bu gün ol sərvi-səhi töhfeyi-hüsnün,
Xüddamləri müjdeyi-bimarə dağılsın.

Bir ləhzə o birəhmə nihan şərhi-qəmim var,
Allahı sevərsiz, deyin əğyarə dağılsın.

Vəhmim budu, yol verməyələr ləxti-cigərdən,
Təqsim eləyim, hər itə bir parə dağılsın.

Göz mərdümi məşqi-xəti-hüsnün həvəs eylər,
Ey çeşm, bu lövhündə olan qarə dağılsın.

Birənc nə mümkündür ola gənc müyəssər,
Zakir, dəmi-əfsun oxu şəhmarə, dağılsın.

**MÜXƏMMƏS**

Məni bir şux bu gün xanə-xarab etdi yenə,
Aldı aramımı, bitaqətü tab etdi yenə,
Bürqə üzdən götürüb, kəştı-niqab etdi yenə,
Dili-məcruhü pərişanı kəbab etdi yenə,
Didəmi əşki-dərun ilə pürab etdi yenə.

Gün kimi şölə verib sinədə əbyəz bədəni,
Tazədən eşqə salıb məstü cünun etdi məni,
Saçı canlar yatağı, telləri dillər vətəni,
Küfr zülfü talayıb Çini, Xətavü Xütəni,
Ləşkəri-xalü xəti Hində cəvab etdi yenə.

Keçdi əyyami-zimistan, gəlib fəsli-bahar,
Eyləyib seyri-çəmən naz ilə ol türfə nigar,
Biləsincə dəfu ney, saqiyü sağər — nə ki var,
İçibən cami-məhəbbətdən, olub məstü xumar,
Açıban bəndi-qəba, Lərki-hicab etdi yenə.

Bari-hicr ilə "əlif" qəddimi "nun" etmiş idi,
Arizusunda qara bağrımı xun etmiş idi.
Ruzigarimi siyəh xalı zəbun etmiş idi,
Gərçi əvvəl məni sərməstü cünün etmiş idi.
Öldürüb, qoymadı, axırda səvab etdi yenə.

Müjəvü qərazəvü göz, bir də kaman əbrulər,
Hamı bir yanə və bir yanə haman əbrulər,
Bir qatı yaydürür danənişan əbrulər,
Zakiri-xəstədilin, gör, nə yaman əbrulər
Cismi-zarın hədəfi-tiri-şəhab etdi yenə.

**QOŞMALAR**

Yar demişdi: gələn bayrama gəlləm,
Ömür başa yetdi il arasında.
Tutub səri-zülfün, dönüb başına,
Şanə tək gəzəsən tel arasında.

Qaydasıdır, qara çarqat bürünür,
Siyah zülfün ucu yemən sürünür.
Nə göyçək yaraşır, nə xoş görünür
Mina, inci kəmər bel arasında.

Gözümün yaşına qərq oldu tənim,
Bu hal ilə işim müşküldür mənim.
Səndən ayrılandan, ey gülbədənim,
Həq bilir, qalmışam sel arasında.

Piranəsər könül hər kimə yetər,
Uşaqtəbiətdir, gördüyün istər.
Onun sözlərinə qatışma, dilbər,
Dəli yola gedər el arasında.

Zakir, etibarı yoxdu dünyanın,
Aldanma xeyrinə, şərrinə anın.
Qoygilən başını bəyaz püstanın
Can ver şirin-şirin, öl arasında.

* * *

A ləbləri badə, ağzı piyalə!
Bir söz desəm olma bidəmaq, sana.
Yetişibsən, indən belə yaraşmaz
Yadlar ilə deyib-danışmaq sana.

Əcəb bihəyadır çərxi-kəcrəftar,
Hər ayda bir hilal eylər aşikar;
Şəksiz sənin ilə ədavəti var,
Göstərir düşəndə qaşqabaq sana.

Mədənisən felin, nazü qəmzənin,
Bərabərin yoxdu aləmdə sənin;
Təhrik eyləməsə səba, qönçənin
Ağzı nədir aça dil-dodaq sana?!

Cəvahir qolbaqlar bəyaz biləyi
Gahi qucar, gahi eylər hənəyi,
Behiştin hurisi, göyün mələyi
Yetişməz, yüz çala əl-ayaq, sana.

Zakirəm, eylədin əqlimi zayil,
Olmaz belə surət, belə şəmayıl;
Elə mən deyiləm hüsnünə mayil,
Göz dikibdir tamam Qarabağ sana.

* * *

Dost yolunda cəfa çəkdim, can üzdüm,
Yetişmədim bır məkanə, ay mədəd.
Sərasər əndamım mum tək əridi,
Eşq atəşi düşüb canə, ay mədəd.

Muradımız şükufəsi bitmədi,
Bəlalı sərimdən sövda getmədi,
Yetər oldu ömür başə, yetmədi
Əlim zülfi-pərişanə, ay mədəd.

Qalmışam göz yolda, könül intizar,
Qəm tutub yaxamı hər yana dartar,
Mən bilmənəm necə bağlanıb yollar,
Bir gələn yox bu viranə, ay mədəd.

Ayrı düşmək vətənimdən yamandı,
Diyari-qürbətdə öldüm, amandı.
İtirmişəm yarı xeyli zamandı,
Axtarıram yanə-yanə, ay mədəd.

Bir kimsənin yoxdu məndən xəbəri
O qaşları yayı sevəndən bəri,
Şikəstə Zakirəm, ahım əsəri
Od salıbdı asimanə, ay mədəd.

** *

Həqdi, gözəl çoxdu cahan içində,
Gözəldə bir neçə nişanə gərək.
Əvvəl, aşiqinə mehriban ola,
Ondan qeyrilərə biganə gərək.

Gözəlin büllur tək gərək bədəni,
Eyləyə özünə heyran görəni,
Yarlı-yaraşıqlı boyu. gərdəni,
Nə uzun, nə gödək, miyanə gərək.

Ənbər xəcil ola zülfü buyindən,
Qəmər rüxsarından, şəms ruyindən;
Canlar təzələnə göftüguyindən.
Sözünün hər biri dürdanə gərək.

Mərifətdə kamil, sinndə uşaq,
Qədirbilən, özü doğru, sözü saq.
Quzu quyruğu tək nazikü yumşaq.
Lərzə verə cismi hər yanə gərək.

Zakir, nə yamandır halı dünyanın,
Əskik olmaz qalmaqalı dünyanın,
Dərdü sərdi mülkli malı dünyanın,
Can üçün bir belə cananə gərək.

** *

Bir saat havada qanad saxlayın,
Nizam ilə gedən quşa durnalar!
Qatarlanıb nə diyardan gəlirsiz
Qaqqıldaşa-qaqqıldaşa, durnalar?

Mən sevmişəm onun ala gözünü,
Nəsib ola bir dəm görəm üzünü;
Yoxsa danışırsız dilbər sözünü,
Veribsiniz nə baş-başa, durnalar?!

Diyari-qürbətdə müddətdi varam,
Gecə-gündüz canan deyib ağlaram;
Mən də sizin kimi qəribü zaram,
Eyləməyin məndən haşa, durnalar!

Laçın yatağıdı bizinı məkanlar,
Yavaş-yavaş gedin, səsiniz anlar,
Qorxuram toxuna ötən zamanlar,
Sürbəniz dağılıb çaşa, durnalar!

Zakirəm, od tutub, alışıb cigər,
Var isə canandan sizdə bir xəbər,
Təğafül etməyin, Allahı sevər,
Dönməsin bağrınız daşa, durnalar!

**GƏRAYLILAR**

Cəfa çəkdim, bağ yetirdim,
Gülşəni xarə tapşırdım.
Bunca fikrü xəyal etdim,
Tapmadım çarə, tapşırdım.

Ölsəm qoyun, sizi tarı,
Yönümü dilbərə sarı.
Özüm öz əlimlə yarı
Bu gün əğyarə tapşırdım.

Nə qədər eylədim minnət,
Vəslinə vermədi fürsət,
Lailac olub, aqibət
Gənci şəhmarə tapşırdım.

Qaldım misali-pərvanə,
Eşq oduna yanə-yanə,
Canı göndərdim canana,
Dili dildarə tapşırdım.

Xəstə Zakir kimi hanı
Könlü olan qəm məkanı?
Mən öldüm, ahü əfqanı
Bülbüli-zarə tapşırdım.

** *

Neyləmışəm, incımısən
Yenə, ey gülbədən, məndən?
Zahirən, vardır təzədən
Sənə bir söz deyən məndən?

Qəm evində zar olalı,
Eşqə giriftar olalı,
Yarımadıq yar olalı,
Nə mən səndən, nə sən məndən.

Mailəm çeşmi-ğəzalə,
Olmuşam dərdə həvalə.
Əl götürməz ahü nalə
Gecələr sübhədən məndən.

Pərişan etdin halımı,
Əyibsən qəddi-dalımı;
Nə deyim, tanrı zalımı
Xəbər alsa, görən, məndən?

Yox olub Zakirin varı,
Günbəgün artar azan;
Xəbərdar eyləyin yarı,
Ey Allahı sevən, məndən.

** *
Keçdi növbəti-zimistan,
Yenə fəsli-bahar oldu.
Əndəlibi-binəvanın
Sənəti ahü zar oldu.

Yasəmənü gülü lalə
Bir çəməndə qurub halə;
Ərğovan tutub piyalə,
Nərgis içib xumar oldu.

Əmr olundu, abi-neysan,
Cansızlara bəxş etdi can;
Yenə təzələndi dövran,
Nə gözəl ruzigar oldu!

Səbzpuş olub çəmənlər,
Qaldırdı hər şükufə sər.
Oyan, ey bəxti-bixəbər,
Yatan hamı bidar oldu.

Əlac oldu hər bimarə,
Tapıldı dərdinə çarə.
Elə həsrət qalan yarə
Zakiri-dilfikar oldu.

## MİRZƏ BAXIŞ NADİM

*Mirzə Baxış Nadim tənqidi-satirik şerin görkəmli nümayandələrindən biridir. O, 1785-ci ildə Navahıda doğulmuşdur. Atası Molla Əsədulla dövrünün gözüaçıq, məktəbdar adamlarından olmuşdur. Şair ilk təhsilini ailədə atasından almış, sonra Şamaxıya gedərək mədrəsədə oxumuş, fars və ərəb dillərini oyrənmişdir.*

*Nadim 1878-ci ildə Navahıda vəfat etmişdir. Əsərlərindən nümunələr 20 cildlik "Azərbaycan Klassik Ədəbiyyatı Kitabxanası "nın VIII cildindən (1988) götürülmüşdür.*

### MÜXƏMMƏS

Ey mənim canım alan, səndə nə adətdir bu?
Göstərir şərhi-qaşın hər dəm, əlamətdir bu,
Səni yaxşı deməyir xalq, məlamətdir bu,
Sizə hərcayi desəm mən, nə ləyaqətdir bu?
Demə boş söz danışır, cayi-şikayətdir bu!

Kimdir olsun bu gözəllik əməlinə məğrur,
O1 qədər çəkməyəcəkdir, olacaq ondan dur,
O zaman faidə verməz kim, olursan məzur,
Kəsbi-fürsət edibən guşeyi-xəlvət tuta gör,
Gəl eşit pəndimi bir rahi-səadətdir bu!

Sübh fəryadü fəğan hasil olur bülbüldən,
Əsəri-ülfət ilə dostluq umardı güldən,
Eşq peyvənd olunub cisminə ta əvvəldən,
Tutuban çaki-giribanını, qoymur əldən,
Göstərir aşiqinə, rəsmi-məhəbbətdir bu!

Sən kimi görməmişəm mahvəşi-dünyani,
Zibü zinət, bu deyil həddi-gözəllik, tani,
Ey vüsali-hərəmin aşiqə can dərmani,
Yenə pünhani baxıb hərdəm alırsan cani,
Eyləmə, aləmi-dostluqda xəyanətdir bu!

Rəhm qıl, Allaha bax, qoyma məni bu qəmdə,
Dərdü qəm kəsrətü-tüğyan eleyib sinəmdə,
Dil qalıb ahü fəğan içrə, gözüm dərnəmdə,
Qılır ecazi-Məsihanı qaşın hər dəmdə,
Bilmirəm sehrdi, ya əhli-kəramətdir bu?

Bir belə şux gözəl görməmişəm dünyadə,
Rəhm edib aşiqini salmaya heç bir yadə,
Almağa qaşü gözü can durub amadə,
Oxşayır xanəxərab can alıcı cəlladə,
Yoxdur insaf əsəri bunda, nə hikmətdir bu?

Məni-aşüftədili eyləmisən tərki-vətən,
Necə kim aşiqdir Leyliyə Məcnun gendən,
Dönməzəm, başın üçün, hərgiz ölüncə səndən,
Nə müddətdir çəkirəm həsrətivi, simintən,
Yanıram atəşi-eşqində, mürüvvətdir bu?!

Vədeyi-vəslə əgər sadiq isən, bismillah,
Ruzi-əvvəl sənə bel bağlamışam, həqqə pənah,
Eyləmə dəsti-ümidim ətəgindən kutah,
Eşidəm bizdən əgər, yar, uzaqsan, billah,
Qılaram şiveyi-tufan, necə söhbətdir bu?!

Müxtəsər, hər nə isə başıma düşdü sevda,
Kəsrəti-ləşkəri-üşşaqdə qaldım tənha,
Qaşı tufani-bəla, nərgisı-dür, göz şəhla,
Olmağım sən kimi Leyla səbəbindən rüsva,
Mənim, əlbəttə, cünunluğına dəlalətdir bu.

Kuyinə gər desələr var münasib cənnət,
Huriyü qılman gərək, yoxsa nədir bu söhbət,
Sən kimi mahliqayə nə bəzək, nə ziynət,
Qürrətül-mahi qaşın tərhilə çəkmiş qüdrət,
Xəlqlər əhməq olurmuş nə şəbahətdir bu?!

Nə deyim, eşq təriqində əcəb qaldım zar,
Ahü fəryadü fəğan rizqim olub leylü nahar,

Eşq zənciri sərimdə dolanıram bazar,
Bu nə sözdür, səni hərcayi deyirlər əğyar,
Tövbə qıl, tərk elə, səndə nə təbiətdir bu?

Hüsni-ruyin dili-üşşaqə fərəhəfzadır,
Zülfü xalın bir olan ildə şəbi-yeldadır,
Qamətin sərvi-xuramandı və ya rənadır,
Qaşların aləm arasında yədi-beyzadır,
Kilki-təqdir ilə çəkmiş, yədi-qüdrətdir bu.

Rəhi-eşqində, qərəz, bil ki, yetişdim canə,
Ağlamaqdan gözümün əşki dönüb ümmanə,
Əql yox, tərqdə Məcnun kimiyəm divanə.
Ləhzeyi pişi-xəyalımdan ola bir yanə,
Öldürür Nadim özün, bil ki, qiyamətdir bu.

**QOŞMALAR**

Neyləmişdim, yarəb, həqq dərgəhində,
Xəstə olub müdam, cahanə düşdüm.
Yazıldı naməmiz ölkəbəölkə,
Yetişdi dillərə, dastanə düşdüm.

Can qurban eylərəm görsəm dustimə,
Durubdurlar o zalımlar qəsdimə,
Yengi gəlmiş idi təbib üstümə,
Qədəm basdı geri, dərmanə düşdüm.

Canü başım olsun yolunda fəda,
Cavan ömrüm əcəb yanıbdur oda,
Neyləmişdim məgər, ey Tari, xuda,
Giriftar oluban, zindanə düşdüm.

Xəstə Baxış, sözün demə bihesab,
Oxudum Quranda ayətül-kitab,
Təşnəlikdən oldu cigərim kabab,
Axtarıban dəşti-bəyanə düşdüm.

* * *
Kimsənəm yox mənə yazsın bir namə,
Qürbət içrə bu diyarə mənimçün.
Məlum olsun sizə əhli-məhübban,
Dua qılım sahibkarə mənimçün-.

Malü əmlakımı etdilər təraş,
Tökər mərdümlərim müdanı qanlı yaş,
Əlac edin mənə, ey qövmü qardaş,
Bir yerdən olmadı çarə mənimçün.

Yetmədin dadıma, ədalət şahım,
Səndən qeyri bir kəs yoxdur pənahım,
Dağıldı üstümdən tamam sipahım,
Dağlar göy geyibdir, qara mənimçün.

Əcəb pozdu fələk xanımanımı,
Din yolunda qıldım fəda canımı,
Yığılıb düşmənlər alıb yanımı,
Yerbəyerdən çəkir nərə mənimçim.

Getdi tamam havadarım qırıldi,
Ağlayıb dostlarım, düşmənim güldi,
Qəm çəkib ləşkərin, üstümə gəldi,
Cəfa çəkdi ol biçarə mənimçün.

Car dedigin o aradə bir mahal,
Əskik olmaz ondan müdam qiylü qal,
Fələk əlif qəddim etdi misli-dal,
Namə yazın havadarə mənimçün.

Miskin Baxış, dərdim eylərəm izhar,
Sanki könülümdən heç getməz qübar,
Pənah gətirdim sənə, pərvərdigar,
Yazılıbdır bəxtim qarə, mənimçün.

## HEYRAN XANIM

*Azərbaycanın görkəmli qadın şairlərindən olan Heyran xanım XVIII əsrin sonlarınnda Naxçıvan şahərində doğulmuşdıır. Əsərlərindən bilinir ki, şairənin əsli Cənubi Azərbaycanda məşhur olan Dünbüli tayfasındandır. Rusiya-İran müharibəsində (1826-1828-ci illər) məğlubiyyətə uğrayan şah qoşunları geri çəkilərkən yolüstü yaşayış yerlərinin əhalisini də İrana köçməyə məcbur etmişlər. Köçürülən əhali içərisində Heyran xanım və onun ailəsi də var idi.*

*Beləliklə, şairə gənc yaşlarında doğma yurddan ayrılmış, ömrünün axırına qədər Cənubi Azərbaycanda, Təbrizdə yaşamışdır.*

*Heyran xanım dövrünə müvafiq fars dilində yüksək təhsil almış, Şərqin , Firdovsi, Sədi, Hafiz, Nizami, Füzuli kimi ktasaiklərinin yaradıcıhğını oxuyub oyrənmişdir. Onun şeirlərində Azərbaycan sənətkarlarından Həsənoğlu, Nəsimi və Füzulinin təsiri aşkar duyulur. Şairənin bir sıra qəzəlləri dahi Füzuliiyə nəzirə şəklində yazılmışdır.*

*Lakin şairənin orijinal şeirləri daha çoxdur. Belə şeirlərində o, bir tərəfdən təmiz eşqin, saf məhəbbətin vəsfini verir, digər tərəfdən isə zəmanə zülmünün çoxluğundan bəhs edərək, dövranın möhnətindən, fələyin gərdişindən acı-acı şikayətlənir, Heyran xanımın əsərləri nikbin pafosu, tərənnümün səmimiliyi, dilinin sadəliyi və aydınlığına görə XIX əsr Azərbaycan ədəbiyyatında xüsusi yer tutur. Onun əsərlərindən örnəklər 20 cildlik "Azərbaycan I Klassik Ədəbiyyatı Kitabxanası"nın VIIIcildindən (1988) götürülmüşdür.*

QƏZƏLLƏR

Olubdu qəm yatağı, şad gördüyün könlüm
Dağıldı qüssədən, abad gördüyün könlüm.

Diyari-qəmdə giriftarü dəstgir oldu,
Kəməndi-firqətə, azad gördüyün könlüm. -

Fəraq dərdinə axtardı, tapmadı çarə,
Cəmii hikmətə ustad gördüyün könlüm.

Səriri-vəsldə Xosrovsifət oturmuşdu,
Olubdu kuhdə Fərhad, gördüyün könlüm.

Fəraqi-möhnətə düşmüş pərişikəstə olub,
Vüsal seydinə səyyad gördüyün könlüm.

Hücumi-möhnətü qəmdən, süpehri-əlayə
Yetirdi naləvü fəryad, gördüyün könlüm.

Çəkib şərarələr, etdi vücudimi, Heyran,
Misali-kureyi-həddad gördüyün könlüm.

* * *
Bir namə yazım, badi-səba yarə yetirsin,
Şərhi-qəmimi ol büti-xunxarə yetirsin.

Hicran ələmi saldı ayaqdan məni-zari,
Daruyi-vüsali mənə bir çarə yetirsin.

Səbrim kəsilib, yar mənim canımı alsın,
Ya şad eləsin vəsl ilə, didarə yetirsin.

Dünyadə və üqbadə görüm mətləbə yetsin,
Hər kəs məni ol yari-vəfadarə yetirsin.

Bir yol verin, ey möhnəti-hicran ki, pəyamım
Ta badi-səba ol gülü gülzarə yetirsin.

Yüz həsrət ilə bu dili-hicranə giriftar,
Əzm etdi, özün ol güli-bixarə yetirsin.

Yüz niş ilə səddi-rəb olub xari-sitəmkar,
Qoymadı özün ol gülə biçarə yetirsin.

Gəl tanrı üçün bunca sitəm eyləmə izhar,
Qoy yarə özün bu dili-avarə yetirsin.

Bikəsliyimə rəhm eləsin xaliqi-biçün,
Heyrani o şəhbazə digər-barə yetirsin.

** *

Ya rəb, kərəm et, ol büti-məhparə qayıtsın,
Bir rəhm eləsin bu dili-bimarə, qayıtsın.

Bu dil ki ona mənzil idi, oldu xərabə,
Əzm etsə əgər yar, dəxi harə qayıtsın?

Şanə çəkibən çin-çin els, sal üzə zülfün,
Qüllab kimi ucları rüxsarə qayıtsın.

Mürği-dili-zarim genə avarə qalıbdır,
Zülfün xəmin aç, ta ki bu avarə qayıtsın.

Gəl rəhm elə, qoy aşiqi bir yarə yetişsin,
Ərzin eləsin ol büti-xunxarə, qayıtsın.

Çün kövkəbi-bəxtim yetişib nəhs məqamə,
Bir əmr elə, ta sabitü səyyarə qayıtsın.

Əhd et, edəsən canüvi sən sidq ilə qurban, Heyran!
Yar əgər bir də bu gülzarə qayıtsın.

** *

Yetişib müjdeyi-canbəxş ki, canan gəliri
Canibi-gülşənə ol sərvi-xuraman gəliri.

Ayrılıq dərdi məni saldı ayaqdan, yarım-
Etməyə bu dili-pürdərdimə dərman, gəliri.

Əsibən badi-səba zülfi-siyahin dağıdıb,
Mehr tek mah üzü oldu dirəxşan, gəliri.

Qaməti sərvi-səhi, zülfı kəməndi-dilü can!
Üzü gül, qaşı kaman, kirpiyi peykan gəliri.

Çün təbəssümlə olub ləl-ləbi dürrəfşan,
Səhni-gülzar olub gülləri xəndan gəliri.

Görsədib arizini, aləmi pürnur qılıb,
Gün tülu etdi, üfüqdən məhi-taban, gəliri.

Xəncəri-naz ilə qəmzə oxun almış əlinə
Aşiqin qəsdinə bir afəti-dövran gəliri.

O nə vəqtdir deyərlər, yar ötər şövkətilən,
O nə gündür deyərlər: ol şəhi-xuban gəliri.

Gər yetişsən o şəhin xidmətinə, dön başına,
Elə, Heyran, canuvi sən ona qurban, gəliri.

* * *

Əsiri-möhnəti-hicran mənəm, mən,
Qəribü zarü sərgərdan mənəm, mən.

O gülzari-vüsalindən uzaqda,
Çü bülbül ruzü şəb nalan mənəm, mən.

Nə mənzil, nə məkan, nə xaniman var,
Cahanda xəstəyi-dövran mənəm, mən.

Sənin hicrin ilə, cy şəmsi-taban,
Bulud tək daima giryan mənəm, mən.

Bu məclisdə olub pərvanə misli,
O nari-eşqilə suzan mənəm, mən.

Əsiri-zülfün içrə yox mənim tək,
Sədaqəllə sənə qurban mənəm, mən.

Qanıma təşnəsən sən ey sitəmkar,
Üzünə valehü Heyran mənəm, mən.

## ZİKRİ ƏRDƏBİLİ

*Zikri Ərdəbili Azərbaycanın istedadlı şairlərindəndir. O, hicri tarixinin 1205-ci (miladi 1790-cı) ildə anadan olmuşdur. Zikrinin əsl adı İbrahim, atasının adı Həsəndir. O, şairlik sənətini ustadı Fikridən öyrənmişdir. Lirik şair olan Zikrinin şeirlərində ictimai motivlər və vətənpərvərlik, saf məhəbbət hisslərinin tərənnümü qüvvətlidir. Onun bir sıra qəzəlləri vaxtı ilə dillər əzbəri olmuş xanəndələr tərəfindən oxunmuşdur. Şeirlərindən nümunəvi 20 cildlik "Azərbaycan Klassik Ədəbiyyatı Kitabxanası "nın VIII cildindən (1988) götürülmüşdür.*

### QƏZƏLLƏR

Ey səba, bu ərzimi ərz etgilən cananıma,
Bəlkə dərman eyləyə bu dərdi-bidərmanıma.

Gərçi bu çərxi-fələk səndən məni qıldı cüda,
Barı sən, ey bivəfa, hərdəm nolur, gəl yanıma.

Bilməzəm hərdəm neçin qanım tökər canan yerə,
Hiç rəhm etməz mənim bu dideyi-giryanıma.

Ahu tək hər yana nıəstanə dolandırma gözün,
Az qalıbdır gözlərin rəxnə sala imanıma.

Saqiya, dur, sağəri-sərşar doldur, nuş edim,
Qəm yemə, gör çox yetibdir qəm, bu qəmli canıma.

Canımı canan alıb, naseh, məni mən eyləmə,
Bilmirəm bir can nədir ki, qıymayım cananıma?!

Zikriyi-şuridədil sübhü məsa söylər: Fətək –
Qoydun həsrət sən məni ol gözləri məstanıma!

* * *

Həvayi-eşq ilə doldur könül kaşanəsin, yarəb,
Qəmi-eşq ilə təmir et bu qəm viranəsin, yarəb!

Meyü meyxaneyi-eşqin yolun bildirmə əğyarə,
Bəlalı aşiqə içdir bəla peymanəsin, yarəb.

Çəkib şanə dağıtdı zülfünü məşşateyi-naşi,
Pərişan könlümü sındırdı, smdır şanəsin, yarəb!

Rəqibim kakilündən könlümü istər rəha qılsın,
O kim istər yıxa bu xanəni, yıx xanəsin, yarəb!

Həqiqət atəşindən suznak eylə səməndər tək,
Ki nari-şəmə yandırma könül viranəsin, yarəb!

Xəyali-xalın ilə düşdü dami-zülfünə könlüm,
Bu nabina quşün sən damdə ver danəsin, yarəb!

Vüsali-yarə yetdi Zikri, amma hiç kəs bilməz,
Nə növ ilə əda qılsın bunun şükranəsin, yarəb?

** *

Dövri-rüxsarına geysuyi-pərişan düzülüb,
Ya ki, gül dövrünə bir dəsteyi-reyhan düzülüb?!

Əsmə, ey badi-səba, pozma nizami-zülfün,
Ki, nizamilən ona çox dili-viran düzülüb.

Necə tərsabeçədir bu ki, qiyam eyləyibən,
Qibleyi-hüsnünə min dəsta müsəlman düzülüb.

Gül üzündə görübən daneyi-dürri-ərəqi,
Belə sandım ki, gül övrağına mərcan düzülüb.

Şərbəti-ləlini bimar könüllər istər,
Bir içim sudan ötrü, gör necə ətşan düzülüb.

Ey kamanqaş, bu qədər atma xədəngi-müjgan,
Ehtiyat eylə ki, amacına çox can düzülüb.

Bilməzəm, hansı əsir oxlayacaqdır, Zikri,
Bu sayaq ilə ki, əbrusuna müjgan düzülüb.

* * *

Cadu gözünə rahibü tərsa nə münasib?
Əyri qaşına taği-kəlisa nə münasib?

Derlər mənə Məcnun, sənə Leyla eşidənlər,
Məcnun mənə nisbət, sənə Leyla nə münasib?

Can istərisən, eylə bir iyma, verim, amma
Göytar olan heynidə iyma nə münasib?

Ey simbədən, könlümü nərm eyləmisən sən,
Ayineyi-büllurinə ara nə münasib?

Dəndarıma gər iqdi-sürəyya dedim, amma
Lölölərə ol iqdi-sürəyya nə münasib?

Qoy başına bir mən dolanım, çünki olubdur –
Şəm atəşinə yanınağa pərvanə münasib.

Xof etməgilən, Zikri, o xublar qəzəbindən,
Sərbadiyeyi-eşqdə pərva nə münasib?

***

Ey xətin muyu mənə mülkü-Süleymandan ləziz!
Vey üzün nuru mənə mehri-dirəxşandan ləziz!

Bir gözün şəhlası yüz min səfheyi-Tövratdan,
Bir qaşın əbrusu min-min mülki-İrandan ləziz!

Gül üzün görmək mənə gülbərgi-həmradan əcib,
O1 səri-kuyin mənə seyri-gülüstandan ləziz!

Zahida, etmə mənə tənə bilibsən, bilmişəm,
Canı sən canandan, cananı mən candanləziz!

Abi-heyvan ləblərin şəbdin içibdir, ey sənəm,
An üçün bir ab yoxdur, abi-heyvandan ləziz!

Abi-beyvan ilə göstərdim o Xizrə ləblərin,
Onu bundan bisəfa buldu, bunu ondan ləziz!

Zikriya, cananə meyl et, çək cəhan mülkündən əl,
Yoxdu bir zad bu cəhan mülkündə canandan ləziz!

Məni bir qaşı kəman oxladı müjganı ilə,
Atdı bir ox ki yarar könlümü peykanı ilə.

O kamanqaş gözəl atdıqca xədəngi-müjəsin,
Doldu peymaneyi-çeşmim ciyərim qanı ilə.

Bağlayıb boynuna zahid xəmi-zülfün tuqun,
Gör necə küfr təriqin tutub iymanı ilə.

Könlümüz cəm idi, nagah əsib badi-səba,
Qıldı pəjmürdə yenə zülfi-pərişanı ilə.

Xublar içrə vəcahətli idi Yusif əzəl,
Deyin o əzzələ qarşı dura, bu sani ilə.

Aşiqin cismini duzəx odu yandırmaz, elə -
Ki, elə yandırır od məhvəşi hicranı ilə.

Zikrinin naleyi-əfqanı yetişdi fələyə,
Yandırar əncüməni-əncümü əfqanı ilə.

## ABBASQULU AĞA BAKIXANOV

*Abbasqulu ağa Bakıxanov Azəbaycan mədəniyyətinin inkişaf tarixinə böyük alim, müfəfəkkir, tarixçi, filosof və şair kimi daxil olmuşdur. O, 1794-cu il iyun ayının 21-də Bakı qəzasının Əmirhacıyan kəndində doğulmuş, uşaqlıq çağlarını doğma yurdda, oraya yaxın olan Balaxanı vəMaştağa kəndlərində yeniyetməlik və ilk gənclik dövrunü isə Qubada, atasının Əmsar kəndindəki malikanəsində keçirmişdir.*

*1819-cu ilin dekabr ayında Tiflisə gedib orada Qafqazın baş hakimi general A.P. Yermolovun idarəsində Şərq dilləri üzrə mütərcim vəzifəsinə qəbul edişmişdir. Rəsmi dövlət qulluğu Rusiya-İran və Rusiya-Türkiyə müharibələri dövrünə təsadüf etdiyindən o, bir sıra hərbi səfərlərdə iştirak etmiş, bacarıqlı ictimai xadim-diplomat kimi ianınmışdır. Hərbi xidmət sahəsində poikovnik rütbəsinə yüksələn A.Bakıxanov rəsmi dövlət qulluğunda çalışmaqla yanaşı elmi və ədəbi yaradıcılıqla da məşğul olmuşdur. O, muxtəlij illərdə "Qanuni-Qüdsi", "Təhzibi-əxlaq", "Kitabi-nəsihət", "Kitabi-Əsgəriyyə", "Mişkatül- I ənvar " və b. əsərlərini yazmışdır.*

*1845-ci ildə Şərqə səyahət fikrinə düşür. 1846-cı ilin martında səfərə çıxaraq, əvvəl İrana, oradan Türkiyəyə gedir. Bir ay Ustambulda qalır, Misiri gəzdikdən sonra Məkkəyə gedir. Lakin vaxtsız ölüm səyahətini davam etdirməyə ona imkan verməmişdir.*

*A.Bakıxanov 1847-ci ildə Məkkə ilə Mədinə arasındakı "Vadiyi-Fatimə"də vəba xəstəlıyindən vəfat etmiş və orada dəfn edilmişdir. Şeirlərindən nümunələr "Bədü əsərləri" kitabından (1964) götürülmüşdür.*

### QƏZƏLLƏR

Gözlərin kim, aşiqə məxmur şəklin göstərir,
Əhli-fəqrə mərdümi-məğrur şəklin göstərir.

Bəs ki, çəkdim qamətin yadilə ahi-atəşin, -
Xatirim nari-şəcərdən Tur şəklin göstərir.

Nəşeyi-meyxarə bais olduğun bildim, kimin
Bir pərivəş can ara məstur şəklin göstərir.

Kuyi-canandan cüda aşiqlar əhvalın desəm,
Dəşt ara bikəs qalan rəncur şəklin göstərir.

Qamət üzrə taqği-geysudən asılmış, həqqi var,
Dil "ənəlhqq" söyləsə, Mənsur şəklin göstərir.

Asimanda kövkəbi-səd olsa, Əsəd yerdədir,
Bu səbəbdən yer səvadi nur şəklin göstərir.

Töhfeyi-babi-Süleyman söyləsəm, Qüdsi, nolur,
Bu qəzəl rani-mələxlə mur şəklin göstərir.

* * *

Arizu eylər könül dildar gəlsin, gəlmədi,
Zülfü kafər, gözləri xunxar gəlsin, gəlmədi.

Hər pərivəş cilveyi-hüsn eyləmiş, mən gözlədim
Dilrübalər fövcinə sərdar gəlsin, gəlmədi.

Canə gəldim bivəfalar ülfətindən, istərəm
Bir vəfa rəsmində sabit yar gəlsin, gəlmədi.

Dərdü möhnət keçdi həddən, bəs ki, çəkdim intizar,
Gözlədim ol şux gülrüxsar gəlsin, gəlmədi.

Ləhceyi-canpərvərindən şur salsın aləmə,
Əndəlibi-şaxeyi-gülzar gəlsin, gəlmədi.

İstədim, Qüdsi, deyim vəsfi-cəmalın dilbərin,
Kuşiş etdim, zineti-göftar gəlsin, gəlmədi.

* **

Dil eşq yolunda zar olubdur,
Bir gül həvəsində xar olubdur.

Xunabə dönübdü rəngi-zərdim,
Bu gülşən üçün bahar olubdur.

Dövrani-fələk müxalif olmuş,
Can düşməni-ruzigar olubdur.

Dilbər qəmi, dustlər fəraqi,
Dərdim bir ikən bəzar olubdur.

Mən etmə, kəlamım olsa dilsuz,
Söz mənşəyi pürşərar olubdur.

Xunin ciyərim bəsani-lalə,
Əfsurdəvü daği-dar olubdur.

Qəm bihədü dərd binihayət
Möhnət dəxi bişümar olubdur.

Hicran sitəmi alıb qərarım,
Gün nuri gözümdə tar olubdur.

Hicrində düşüb bəlayə,
Qüdsi Sərgəştəvü biqərar olubdur.

* * *

Əldə mey, üzdə gülüş gəldi nigarım bu gecə,
Pis nəzərdən uzaq, ol çeşmi-xumarım bu gecə.

Yar üzü meylə qızarmış, meyi etmiş üzü al,
Nə məharət eləmiş saqiyi-yarım bu gecə!

Mən bilirdim ki, kimə lütfi və ya nifrəti var,
Almasaydı əgər o, səbrü qərarım bu gecə.

Üzünü yad eləyib gözlərimə axdı qanı,
Batinü zahir olub güllü baharım bu gecə.

Qaşla üz, ayla günəş misli çıxıb bir yerdə,
Nə qiyamət eləyir laləzarım bu gecə.

Kuyinə düşmək üçün sinəmi yırtmış könlüm,
O çəmənzarı dilər bülbüli-zarım bu gecə.

Kakilindən hələ mən bircə dügün açmamışam,
Tökülür, Qüdsi, qələmdən nəki varım bu gecə.

Pisləyirsən gözəli sən necə hər an, ey şeyx?
Bu necə əql, nə insaf, nə iman, ey şeyx?

Sevgini xəlqə həram etdin əzəldən, lakin
Qəlbini çaldı sənin huriyi-qılman, ey şeyx!

Hər nədən məst olursan, nə təfavüt, məstsən,
Məstliyinlə bizi sən eylədin heyran, ey şeyx!

Nə üçün inciyəsən, üzr varındır hər an,
Olmusan cümlə təriqətlərə nadan, ey şeyx!

Bir baxaq biz içirik, məst oluruq bir meydən,
Söylə verdik bu işilə kimə nöqsan, ey şeyx!

De görək ki, nə olub hasilin ol məsciddən,
Nə verib ömrünə bu naləvü əfqan, ey şeyx!

Qüdsiyə vermə nəsihət belə boş baş ilə sən,
Onu almış ələ bir zülfi-pərişan, ey şeyx!

**MÜXƏMMƏSLƏR**

Qəm çəkmə, könül, gər ciyərin qanə dönübdür,
Əyyami-vüsalın şəbi-hicranə dönübdür.
Bülbül tək işin naləvü əfqanə dönübdür,
Tiflisə nəzər qıl ki, gülüstanə dönübdür.
Hər bir gözəli afətü cananə dönübdür.

İrs ilə yetib bunlara asari-vəcahət,
Geysuləri sünbül tək alıb tabü təravət
Qamətləri dünyaya salıb türfə qiyamət,
Hər dilbərə bir növ verib rəngi-nəzakət,
Kür suyu məgər çeşmeyi-heyvanə dönübdür?

Hər şuxi-pəripeykər açıb türreyi-tərrar,
Dildadələri etmək üçün damə giriftar.
Səyyadi-sitəmgər bu güzərgahda çox var,
Ahubeçələr tək doludur kuçəvü bazar,
Çin mülkimə bu mənzili-viranə dönübdür.

Hər kim gələ Tiflisə tamaşa tələbindən,
Zülfi-ruxi-məhvəşləri görmək səbəbindən,
Görməz əsəri-rahəti-can ruzü şəbindən,
Xoşləhcə pərizadələrin ləli-ləbindən,
Bu kişvəri-pürşur Bədəxşanə dönübdür.

Bunlarda bu yarəb, nə səfadır fərəhəngiz,
Hər sərvqədin şiveyi-rüxsan bəlaxiz,
Rüxsari-niku, türreyi-mişkini dilaviz,
Hər əbruyi-xəm şəkildə bir xəncəri-xunriz,
Qan tökmək üçün hər müjə peykanə dönübdür.

Hərçənd bu gülzardə çox dilbəri gördüm,
Can qəsdim edən şuxi-sitəmküstəri gördüm,
Arizləri mehtaba bərabərləri gördüm,
Əvvəl yetişən gündə ki, İskəndəri gördüm,
Aya bu mələkdir, dedim, insanə dönübdür.

Qüdsi ki, dəmi-qüdsi vurub lafi-təvəüa,
Tən eylər idi görsə birin valehü-şeyda,
Tərk eyləmiş islamı görüb bunları hala,
İstər ola çarubkeşi-səhni-kəlisa,
Zünnar salıb boynuna, Sənana dönübdür.

* * *
Dila! Əzm eylə sən bülbül sifət gülzarə, bismillah,
Muradın olsa meyl etmək fəğanü zarə, bismillah,
Gər istərsən müdam olmaq cigər sədpara, bismillah,
Qərəz fikrin tamaşadır əgər dildarə, bismillah,
Nəzər qıl ləli-canbəxşi-rüxi-gülnarə, bismillah.

Təmənnasında gün-gündən məni-dilxuni şeyda qıl;
Gərəkməz namü namusum, qəmi-eşqilə rüsva qıl,
Verib dünyavü din nəqdin məlai-vəslə sevda qıl.
Əgər yox dəstrəs sevdayə bari get tamaşa qıl,
Gəlibdir Yusifi-gülpirəhən bazarə, bismillah.

Çəkərdin arizu daim deyirdin şövqi-yar ilə -
Ki, düşsün ittifaqi-vüslət ol siminüzar ilə,
Edim canım ona təslim zövqü etibar ilə,
Durubdur ol büti-sərməst tiği-abidar ilə,
Sözün gər doğrudur, ey aşiqi-biçarə, bismillah.

Demişdin, ey büti-tərsanikəc, bərhəmzəni-aləm –
Ki, etməm aşiqimdən mən yaman gün iltifatim kəm.
Alıbdır səbrimi dərdü bəla can qəsdin eylər həm,
Əgər iqrarı sabitsən vəfa həngamidir bu dəm,
Tərəhhüm qıl, qədəm bas dideyi-xunbarə, bismillah.

Olubdur qərqi-xunabi-cigər çeşmi-tərin, Qüdsi,
Yanıbdır daği-möhnətdən düi-qəmpərvərin, Qüdsi,
Gətir təqrirə bir-bir yarə ərz et qəmlərin, Qüdsi,
Əgər bu şivədən dilgir olarsa dilbərin, Qüdsi,
Şüru eylə bir özgə vəchlə izhara, bismillah.

**MİŞKATÜL-ƏNVAR**

*İxtisarla*

Ey düzlüyü sevən, eşqi gəl eyləmə məzəmmət,
Zahidlikdə mən görmürəm nicat üçün əlamət.

Küfrilə din heyran qalıb, onlar kimi arayır?
Daraq kimin mişk ətirli saçlarını darayır?!

Mən duyuram ruhoxşayan yar ətrini inanın,
Can mülkündən xəbər verir iltifati cananın.

Nəşə verdi yar canından nuş etdiyim hər damla,
Adı ilə bəzədim bu kitabımı inamla.

Çünki onun hümmətinin feyzi ilə bu pak can,
Günəş kimi tülu etdi sanki qara torpaqdan.

Hər nə qədər tərifini mən söyləsəm var yeri,
Odur bizə kəşf eyləyən bilinməyən şeyləri.

O səadət günəşidir mənə işıq, nur verən,
Odur mənim hər zərrəmdə yüz möcüzə göstərən.

Bu canımdir ancaq onun bir müşkatul-ənvari,
Bu qəlbimin xəznəsidir o məxzənül-əsrari.

Bu kitabda istəyirəm yazım onun sirrindən,
Qoy "Mişkatül-ənvar" - deyə adlandırım onu mən.

Qəribədir, tarixi də sanki doğmuş əsrardən,
Hasil oldu can adı da bu "Mişkatül-ənvar"dən.

Ey misilsiz cavan, çalış hümmət eylə hər işə,
Cavanbəxtsən, qoca kimi tədbirli ol həmişə.

Cavanlıqda dərdlər səni tez qocaltdı, durma get!
"Var"ın, "yox"un cəfasından varlığını xilas et!

Ey işıqsız yar gözünə nur bəxş edən gün kimi,
Ey zavallı aşiqlərin dərdlərinin həkimi.

Bu xəstəyə öz qəmzəndən lütf et, bir dərman göndər,
Gülüşündən bu ölmüşə ruh ver, yeni can göndər.

Qüdsini sən bu səhrada qoyma qalsın sərsəri,
Öz yolunu itirənin, axı, sənsən rəhbəri.

Həqiqətə çatmaq üçün mənə doğru yol göstər,
Nədə bir səhv etsəm onu, bir mürəbbim ol, göstər!

FİKRİN İZAHl

Ömür keçdi boş-boşuna, etdik daim ahü vah,
Keçdi xoşluq zamanları, çatdı bəla günü, ah!

Ey saqi, ver piyaləni, doldur, içim durmadan,
Bəlkə şadlıq bir də gəlsin qəlb evinə meyhiman.

Əl tutmasan qəmlər məni məhv eyləyər, yaxşı bil,
Ona görə verdiyin su adlanmada Səlsəbil.

Ey saqi, gəl atəşimə bir su çilə, çat dada,
Qızışdırsın ta ki, o su atəşimi daha da.

Qəlb evinin təmizliyi o şərabdan pay alar,
Su deyilir ona, lakin bir atəşdir aşikar.

Ey saqi, bu ruzigardan mən də bir kam almadım,
Bir badə ver, ənbər içən, çağırılsın qoy adım.

Bəlkə o mey nicat verə mənə sonsuz kədərdən,
Torpağıma ruh piləyə, cana gələm bir də mən.

Ey saqi, bir ayna ver ki, dünyaları seyr edim,
Tut qarşımda, sənə gözəl bir macəra söyləyim.

Tuti ayna görən kimi məlumdur ki, dil açar,
Sən də sudan bir ayna tut, sirlər edim aşikar.

Saqi, mənə abi-həyat peymanəsi əta et,
Əsrlərin günəşilə bu dərdimə dəva et!

Qoy yarımın surətini mən göstərim badədə,
Əhsən desin bu qüdrətə yar da, mən də, badə də.

Bu dünyada hər kəs olur vəchlə kamiran,
Zülmətdən - Xızr, mənsə günəş çeşməsindən hər zaman.

Ey saqi, mən dərd içində avarayəm ruzü şəb,
Heyranlığın səhrasında dolanıram təşnələb.

Susuzluğa bir çarə qıl, ürəyimi sirab et,
Sən bu suyun xassəsini anlat mənə, savab et!

"Cami-mey" ki, söyləyirlər, bu sözdə nə məna var?
Acı badə içində de nə qəribə halət var.

Nəzərlərdə saf, gül rəngi görünür o hər zaman,
İçəriyə çəkən zaman neçün olur qızıl qan?

Deyirlər ki, huşyar edər içənləri bu badə,
Bəs neçin məst, xar eləyir, verir həyatı badə?

Gözə bir cür görünən bu mayedə min sifət var?
Onda şoran duzu vardır, Fəratdan da nemət var.

Sənə qurban olum, saqi, sakit qalma, yenə dur,
Sən hərəkət edən zaman məclisimiz şən olur.

Dolu şərab badəsi ver, unudum hər dərdi mən,
Bəlkə bir az can qurtarım bu şüurun əlindən.

Urək şənlik məclisinin çiçəklənən bağıdır,
Ağıl isə yolkəsən tək vurub onu dağıdır.

Dünyaları əks eyləyən saf aynadır bu ürək,
Ağıl toxu örtər onu paslı, qara pərdə tək.

Lütf et, saqi, məqsədimə çatım bəlkə birtəhər,
Bihuş olub qələm çəkim huşyarlığa bir qədər.

Urək azad olan zaman işgəncədən, əzabdan,
Bəlkə ona gizli sirrlər olacaqdır nümayan.

Biləcəkdir bu badənin xoş səfası necədir,
Biləcəkdir ibtidası, intihası necədir.

Əgər mənə kömək olsan, ümidim var, nəhayət,
Sənin gözəl niyyətinlə kəşf edilə həqiqət.

CAN YAXAN EŞQİN İŞIĞINDAN BİR ŞÜA

Salam sizə, ey sevdanı bilən əhli-mərifət,
Səlamətlik guşəsinə çəksin sizi məhəbbət.

Məhəbbətsiz bu dünyada nəşə yoxdur, bu şəksiz,
Eşqi isə duymaq olmaz saf duyğulu ürəksiz.

Ürəklərin rahatlığı eşq ilədir hər zaman,
Hər kəs olmuş öz eşqilə bu dünyadə kamiran.

Bu dünyada yoxdur ancaq məhəbbətin adəmi,
Başdan-başa o qəm-kədər olsa belə, nə qəmi?!

Onun qəmi elə qəmdir ki, üstündür şadlıqdan,
Onun bəndi içindəsə sad olar hər insan.

Dərd içində nalan cdər o qədor cismü canı,
Unudarsan həmişəliksən hər iki dünyanı.

Dərhanından yaxşı olan dərdi çəksin qoy ürək,
Bil əbədi yaşamaqdan xoşdur bu dərdlə öhnək.

Bu xərabə yerə düşüb can çəkişən hər insan,
Öz kədərli ürəyini istər edə şadiman.

Lakin yoxdur bir nəfər də bu dünyada bəxtiyar,
Şadlıq, şöhrət, xoşbəxtliyin ancaq quru adı var.

Hərənin bir dərdi vardır, deyin kimdə qəm yoxdur?
Bir fərq ilə: birində az, o birində çox-çoxdur.

Başdan-başa bu dünyanın işləri qəm, kədərdir,
Lakin insan bu işlərdən qafildir, bixəbərdir.

Bu dünyada bir iş yoxdur, olsun tamam zərərsiz,
Bir şirin bal tapılmaz ki, olsun tamam zəhərsiz.

Hər bir işin mənasını axtarırlar səbəbdə,
Əziyyətsiz tapılmaz bu aləmdə bir səbəb də.

Cəhd eyləyər hər kəs tapsın bir az şadlıq dəmini,
Şadlıq tapmaz, o daha da artırar öz qəmini.

Bu dünyada möhnətdən başqa yoxdur səadət;
Eşq olsun o aşiqə kim, ona gülür məhəbbət.

Bu qəmlərdən, kədərlərdən, işgəncədən, əzabdan,
Ancaq bir eşq xilas edər ürəkləri hər zaman.

Olmasın qoy can evində yar qəmindən başqa qəm,
Dərd bir olsa, tez tapılar o dərdinə bir məlhəm.

Sənin dərdin o vaxt çatar istədiyin dərmana –
Ki, qovuşsun könül yara, can vəfalı canana.

Bu mətləbi yaxşı dərk et: Məhəbbətdir azadlıq,
Onun qəmi, kədəri də olar xoşluq və şadlıq.

Həqiqətdən bəhs edərkən yada düşdü bir məcaz,
Bir cavandan deyim sizə ki, olmuşdu eşqbaz:

## EŞQDƏ TƏMİZLİK HAQQINDA

Eşqdə nə küfr vardır, nə də dinə uyan var,
Rindlik, məstlik olan yerdə təmiz və saf vicdan var.

Fisq ilə zöhd insanlara qurulmuş bir duzaqdır,
Huşyar olan şübhəsiz ki, bu kələkdən uzaqdır.

Səfsətədir hər müddəa, fikirləri müəmma,
Məsələlər məlum olmur, hər şeydə var bir əmma.

Aşiqlərdə təqlidə heç olmaz zərrə etimad,
Ancaq vardır hər bir işdə öz gücünə etiqad.

Boş laqqırtı nəyə lazım xoş gəlsə də hər avaz,
Göz gördüyün qəbul edər, quru sözə inanmaz.

Eşq hədisi başqa şeydir, tələbi də bir başqa,
Gəl dolanaq indi biz də bu hədisin başına.

Sözə yeni məna ilə yeni şəkil verərək,
"İstincanı", "İstibranı" biz başqa cür şərh edək.

Bunlar nədir ki, bunlarsız taət həram sayılır,
Onlar olsa insan ğəflət yuxusundan ayılır.

Burda daha yada düşdü bu sözlərin izahi
Ki, demişdi fazillərin başçısı Şeyx Bəhayi:

Yaramazlar, bu əməldən, hərəkətdən utanın
Ki, istinca daşlarıni gizlərsiniz şeytanın.

İstincadan qərəz budur ki, qəlb təmiz olmalı,
Alçaq tiynət məhv edilib paklıq əziz olmalı.

İstibrasa o deməkdir, gizli saxla hər sözü,
Sirr deyilən xəzinəyə məxzən olsun qəlb özü.

Şərab içsən şərabla da apararsan xumarı,
Su olmasa bəs təmizlik nə cür olar, bil barı!

Əbədiyyət badəsilə sərxoş olan hər adam,
"Vəlləzinə amənu"dən alar qüvvət və ilham.

Bu söz ilə təmizlənsə hər ürəyin qubarı,
Cəmalında şəfəq salar könüllərin ilğarı.

Bu bədxahlıq, yaramazlıq, xəbisliklə, ey cahil,
İbadətin mənasızdır, qəbul olmaz duan bil.

Bu hərəkət çox bənzəyər dərgahında üsyana,
Zahirdə həqq, batindəsə bağlanmışsan şeytana.

Bu riyakar itaətdən susmaq daha yaxşıdır,
Üsyankarlıq kafirlikdən hər mənada yaxşıdır.

Pis sifətdən çəkin, həqqə istinad et, ey insan!
Bir an belə üz döndərmə "gəl-gəl" deyən Allahdan.

Alın açıq hər işini eşqə bağla həmişə,
Qoy eşq olsun dil əzbərin sənə yüksək bir peşə.

Məhəbbətdən başqa yoxdur sənə düz yol göstərən,
Odur səni xeyir işlərə çəkib - qorxma, gəl, - deyən.

Ey qəfəsdə çırpınan quş, tənbəllikdən iş aşmaz,
Sən qartalsan, milçək işi qüdrətinə yaraşmaz.

Öz nəfsinin məhbəsindən qurtar, azad qanad çal,
"Leysə lil-insanə illa ma səa"dən ibrət al!

Əqlin varsa puç eyləmə ömrünü qıl ehtiyat,
Qoyma boş-boş kefcilliyə hədər olsun bu həyat.

Bir düşünsün əbədiyyət dövlətinə sahibsən,
Müvəqqəti ləzzət üçün uçurursan əlindən.

Asiliklə əziz ömrü göylərdən yerə saldın,
Uşaq kimi çirk içində batıb qaldın, qocaldın.

Azad doğan ürəyini özün saldın zindana,
Yaradılış mənasından xəbərsizsən, qansana!

Həqq yaratdı özü kimi səni, verdi min zinət,
Bu qamətlə dedi bizə etməlisən itaət.

Ta ki, səndə olsun əlaməti, cəlalı,
Dil və candan istəyəsən ta ki, o zülcəlalı.

Xəlvətdən bir mənzil verdi sənə möhkəm, mükəmməl,
Sonra dedi öz əqlinlə bizə tərəf qayıt, gəl.

Lakin indi bunları son unutmuşsan, ey insan,
Heyif olsun sənə, heyif, yazıq sənə, bir utan!

Bəzən guya meyl edirsən xaliqə, ibadətə,
Bu yerdə də pərdə olur öz varlığın taətə.

Taət etsən behişt şövqi, ya cəhənnəm xofindən,
Yəqin bil ki, dərgahında sədaqətli deyilsən.

Çünki bu nəfs istəyidir, xudpərəstlik deməkdir,
Həqqə taət əvəzinə, qurulmuş bir kələkdir.

Bəhaidən yenə düşdü yadıma bir rəvayət,
Bu yerdə çox münasibdir qoy eyləyim hekayət.

O demişdir: - Əvəz almaq məqsəd olsa taətdən,
Kor olmaqdır, muzdurluqdur, əl çək belə adətdən.

Aşiqlərə məqsəd ancaq yar vəslidir hər zaman,
Cənnət şövqi, ya cəhənnəm xofi bilməz o bir an.

Hər kəsin ki, yar sevdası başındadır nə qəmi,
Onun vardır öz behişti, öz müdhiş cəhənnəmi.

Kafirlərin küfri, həm də dini hər bir dindarın,
Ürəyində bir zərrəcik dərdə bənzər əttarın.

Hər şəxsin ki, olsa bu cür yüksək ali hümməti,
Əssabiqun ayəsindən alar gücü, qudrəti.

Candan keçib çatar o dəm cananının vəslinə,
Əzəliyyət aləmilə qavuşar bil o yenə.

## FAZİL XAN ŞEYDA

*Fazilxan Şeyda XVIII əsrin sonlarında Təbrizdə mühəndis ailəsində doğulmuşdur. Anadan olduğu il məlum deyil. Əsl adı Molla Fətulladır, Təbrizdə mükəmməl ruhani təhsili almışdır. Şeirlərində yüksək vəzifəli adamları tənqid etdiyinə görə dövlət məmurları və ruhanilərin təqiblərinə məruz qalmışdır. Buna görə 1838-ci ildə İranı tərk edərək Tiflisə gəlmiş və Rusiya təbəəliyinə keçmişdir.*

*Fazil xan 1846-cı ildə Qafqaz canişinliyində dəftərxana müdiri, 1847-ci ildə isə Tiflisdə yeni açılmış şiə məktəbinə müəllim təyin edilmişdir. O, Tiflisdə yaşadığı zaman "Divani-hikmət" ədəbi məclisinin yığıncaqlarında iştirak etmişdir. Şair 1852-ci ildə Tiflisdə ölmüş və şəhərin müsəlman qəbristanlığında dəfn olunmuşdur.*

*Fazil xan Şeydanın həyat və fəaliyyəti ətraflı öyrənilmədiyi kimi əsərləri də tam halda əldə edilməmişdir. Burada verilən məlumat və nümunələr "Yazıçı" nəşriyyatının çap etdiyi "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Əcəb hüsnü əcəb tale, əcəb şəmsü, əcəb taban,
Əcəb qüdrət, əcəb sane, əcəb xaliq, əcəb sübhan.

Əcəb xalü əcəb hindu, əcəb dəndan, əcəb lölə,
Əcəb kakil, əcəb əbru, əcəb qövsü əcəb müjgan.

Əcəb ləlü əcəb gövhər, əcəb saqi, əcəb kövsər,
Əcəb hüsnü əcəb zivər, əcəb hürü əcəb qilman.

Əcəb şuxü əcəb surət, əcəb zibü əcəb zinət,
Əcəb mahu əcəb tələt, əcəb Yusif, əcəb Kənan.

Əcəb lalə, əcəb gülşən, əcəb dilcu, əcəb əhsən,
Əcəb nərgis, əcəb susən, əcəb qönçə, əcəb xəndan.

Əcəb zülfü əcəb sünbül, əcəb xalü əcəb filfil,
Əcəb tuti, əcəb bülbül, əcəb əhmər, əcəb xoşxan.

Əcəb eşqü əcəb sevda, əcəb Fazil, əcəb Şeyda,
Əcəb şuriş, əcəb qovğa, əcəb məcnun, əcəb giryan.

* * *

Dəyən bülbül pərinə daima gülzarsız qalsın,
Salan aşiqləri pərgardən pərgarsız qalsın.

Hər əl əl ki urar şanə o geysuyi-pərişanə,
Mənim aşüftə könlüm tək, xudaya, yarsız qalsın.

Məni lal eyləyən bülbül kimi bir böylə mövsümdə,
Suali-həqq olanda, ey xuda, göftarsız qalsın.

O səf-səf çəkilən zülfün şikəncin sındıran şanə,
Dağılsın səfləri, Allah, görüm sərdarsız qalsın.

O çin-çin zülfi-pürçinin xəraci Çinü Maçinə
Verə gər Fazili-Şeyda, görüm, zünnarsız qalsın.

## MÜXƏMMƏS

Fələk heç kimsəni, yarəb, nigəran eyləməsin,
Heç kimi mayili-bir sərvi-rəvan eyləməsin,
Eşq canına salıb, afəti-can eyləməsin,
Onu dildən-dilə məşhuri-cahan eyləməsin,
Açılan qönçə kimin ömrü xəzan eyləməsin.

Mənə cövrü sitəm etməkdə fələk qoymadı kəm,
Necə Yusif kimi zindanə salıbdır möhkəm,
İstəməm bir kəsə izhar eləyim möhnətü qəm,
Yoxdur aləmdə dəxi bir belə yari-möhkəm
Ki, nihan sözlərimi xəlqə bəyan eyləməsin.

Gah naz ilə, gahi işvə ilə ol kafər,
Tiği-hicranilə hər ləhzədə can qəsdin edər,
Yetişən dadıma yox kimsədə insaf məgər?
Deyin ol zalimü xunxarə ki, Allahı sever,
Öldürüb aşiqi, nahəq yerə qan eyləməsin.

O qara gözlü ki, bir qan içici qatil imiş,
Natəvan könlüm əcəb yerdən ona mayil imiş,
İndi bildim ki, bu günlərdə vəfa müşkül imiş,
Deyin ol bülbülə kim, naləsi bihasil imiş,
Daxi bundan sora gülşəndə fəğan eyləməsin.

Yar özü könlün eda mənzilini Şeydanın,
Görə başdan-başa razi-dilini Şeydanın,
Açıban lütf ilə bu müşkülüni Şeydanın,
Çərx soldurmasın, axır, gülüni Şeydanın,
Ömrünün tazə baharını xəzan eyləməsin.

## MİRZƏ ŞƏFİ VAZEH

*Azərbaycan ədəbiyyatının maraqlı Şəxsiyyətlərindən biri Mirzə Şəfi Vazehdir. Milli mədəniyyətimizin inkişaf tarixinə o, istedadlı şair, mahir xəttat və müəllim kimi daxil olmuşdur.*

*Mirzə Şəfi Vazeh 1894-cü ildə Gəncə şəhərində dünyaya gəlmişdir. İlk təhsilini mollaxanada alan şair 1840-cı ildə Tiflisə köçərək qəza məktəbində şəriət və Azərbaycan dili müəllimi vəzifəsinə düzəlmişdir. 1846-cı ilda Gəncə şəhər məktəbinə dəyişilmiş, dörd il burada çalışdıqdan sonra yenidən Tiflisə qayıdaraq, şəhər gimnaziyasında kiçik müəllim vəzifəsini tutmuşdur. O, ömrünün axırına kimi bu vəzifədə işləmiş və 1852-ci ildə yəfat etmişdir. Şair Tiflisdə müsəlman qəbiristanlığında dəfn olunmuşdur.*

*Vazeh Tıflisdə yaşayarkən alman şərqşünas-alimi Fridrix fon Bodenştedtlə tanış olmuş, ona Şərq dillərini öyrətmişdir. Onların münasibəti getdikcə dostluğa çevrilmiş və Mirzə Şəfi öz əsərlərindən ibarət şeir dəftərini Bodenştedta bağışlamışdır. F.Bodenşdet həmin dəftəri Almaniyaya aparmış və oradakı şeirlərin tərcüməsini 1850-ci ilda Berlində çap etdirdiyi "Şərqdə min bir gün " əsərində vermişdir.*

*Sonralar müxtəlif dillərə çevrilərək, demək olar ki, dünyanın hər yerinə yayılan bu əsərlərin orijinalı tam halda əldə yoxdur. Onların az bir qismini məşhur Azərbaycan alimi Salman Mümtaz, bir hissəsini isə professor Həmid Məmmədzadə tapıb, oxuculara çatdırmışdır. Buradakı nümunələr şeirin "Şeirlər məcmuəsi" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Nə qədər kim, fələyin sabitü səyyarəsi var,
Ol qədər sinədə qəmzən oxunun yarəsi var.

Deyil əflakdə kövkəb görünən, çərxi-bülənd
Oluban didə, sərapa sənə nəzzarəsi var.

Ruzigarı tirə, daim ki şəbi tar keçər,
Hər kimin eşqdə bir yari-sitəmkarəsi var.

Necə xun cuşə gəlib, eyləməsin ahü fəğan?
Könlümün dideyi-giryan kimi fəvvarəsi var!

Ol qəzəldir ki, bu, Vazeh dedi, bir dərd əhli,
Zahirən lalə otağında qonaq-qarəsi var.

* * *

Bizə həmsöhbət olan özgə kitab almaz ələ,
Sən də zahidliyin ol dəftərini tulla selə.

Mən yarın xəstəsiyəm, eşqdən özgə demə söz,
Məni dildarımın eşqi beləcə saldı çölə.

O zamandan ki, mənim qəlbimə yol tapdı o yar,
Unuda bilməyirəm mən onu bir an da belə.

Bu fələk kim, sənə ulduzla bəzənmiş görünür,
Bəlkə aşiqdir o da sirrini faş etməz hələ?

İndi gül fəslidi, çöllərdə tamaşa dəmidir,
Çıx çəmən seyrinə, mey məclisi qur, şadlıq elə.

Yardan versə xəbər Vazehə o badı-səhər,
Qəbrdə olsa əgər bil ki, gələr bir də dilə.

* * *

Xoş olsun ol könül, eşqə məkandır,
Var olsun ol fikir, eşqə həyandır.

Susuz çeşməyə bənzər ol ürək kim,
Nə eşqin dərdini, nə qəm duyandır.

Bax, öyrən gör necə pərvanə, bülbül
Olublar eşq şeydası zamandır.

Məhəbbət əhlinə bu kafidir kim,
Öz eşqiylə o, rüsvayi-cahandır.

Məhəbbət mürği cövlan etsə harda,
O eşq ovlar, xəbərdar ol, amandır.

İki dünyanı verrəm sən baxanda,
Mənə eşqin bu sövdası əyandır.

Necə, Vazeh, əsiri olmayım mən
Bu eşqin qarşısında Qaf yalandır.

## MƏKTUBUN İNTİZARINDA

*Məsnəvi*

Məhəbbət bağının sərvi-rəvanı,
Məlahət bağının tazə fidanı,

Ucaboylular içrə fəxri-dövran,
Şikəstə qəlblərə munisü dərman,

Zamanın ən seçilmiş nocəvani,
Gözəllərin gözəli, mehribani,

Şəfəqdə, mehridə göylərdə bir ay,
Vəfadə, əhdidə yoxdur sənə tay.

Xoşəndamsan, xoşiqbal, xoşəməlsən,
Zəmanə görməmiş nazlı gözəlsən.

İlahi, sən uzaq et bədnəzərdən,
Yanında bədnəzər düşsün kəsərdən,

Səni Allah görüm ki, hifz qılsın,
Könül aynan həmişə aydın olsun,

Kamınca gərdişə gəlsin bu dövran,
Sənə sağlıq dilər qəlb ol xudadan.

Deyirəm, dost ayağına dəyən daş,
Ona yox, sinəmə dəysin mənim kaş,

Əbədi ömür qıl sən bu cahanda,
Həyatım olmasın sənsiz bir an da.

O tazə qönçətək ətrin var olsun.
Başında daima sövdalar olsun.

Məhəbbət şərtinin itmamı yetdi,
Bizim ərzi-halın əyyamı çatdı.

Bizə qafil olubsan, bu nədəndir?
Cövrə mayil olubsan, bu nədəndir?

Fərağında gözüm qanla dolubdur.
Biri Qülzüm, biri Ceyhun olubdur.

Bütün kirpiklərin xəncərsayağı,
Tökər qəlbim qanın üzüm aşağı.

Dövrəm Dəclə olub gözüm yaşından,
Oturmuş qan içində min-min insan.

Ürək göylər kimi əfğana gəlcək,
Gözümdən yaş axar gürşad yağıştək.

Mənim göz yaşlarım, himmət edin siz,
Yarın məskəninə axıb gedin siz.

Ayağına düşüb nazlı nigarın
Yetirin ərzini bu biqərarın.

Ürəyim parçalanmış qəm əlindən,
Məgər zülfü əsir sübhün yelindən?

Hardan bir qafilə gəlsə, qərarsız
Sürünnəm mən, sürünnəm ixtiyarsız.

Bu xəstə qəlbimin ahi, nəvası
Olar ol qafilənin zəng sədası.

Arayar, varmı yarın bir nişanı,
Arayar ol yeniyetmə cəvanı.

Nə ümmid, nə cavab tapmaz sualı,
Suallar dəf qılmaz bu məlalı.

Niyə didəm dolar həsrət yaşıyla?
İlahi, kimsəni salma bu hala!

Haray, ey çərx, əlindən, nə edərsən?!
Bu könlümü hər an dərdlə didərsən.

Mənə min dərdi verdin, yoxdu dərman;
Bir anlıq vəsl üçün bu qədri hicran?

Neçə min sinəyə dağlar çəkibsən,
Usanmazsan məgər bu cövridən sən?

Nə olardı, məhəbbət olmayaydı!
Olurdu kaş bu möhnət olmayaydı!

Üzünü görməyə yox əldə imkan,
Nə də gül dərmədim vəslin bağından.

Nə bir kəs var ki, həməsrarım olsun,
Nə bir kəs var mənim qəmxarım olsun.

Kimə deyim ilahi, vəsfi-halım?
Kimə deyim bu dərdim, bu məlalım?

Bu əsrara ilahi, kimdi mərhəm?
De kimdə var bu qədri dərdilə qəm

Ki, ona söyləyim dərdimi bir dəm?
Alım ondan bu dərdə bəlkə məlhəm.

Ey ənbər qoxulu sübhün küləyi,
Xəbər gətir, sevindir bu ürəyi.

Sən ey, aşiqlərin dərdinə məhrəm,
Möhnətkeş insana ən yaxşı həmdəm,

Tutulsa qönçətək bir qəlb kədərdən,
Sən onu gül kimi xəndan edərsən.

Nə olar ki, olub məhrəmi-əsrar
Bizim də dərdimizdən ol xəbərdar.

Danışım mən yarımın firqətindən,
Xəbər verim cəfavü-möhnətindən.

Mənim bu halıma rəhm eyləyib sən,
Tükənməz dərdimə imdad edəsən.

Gedib sən yanına ol zülmkarın
Yetir peymanını aşiqi-zarın.

Onun vüsalına yetən zamanda
Tələsmə halımı şərhü-boyanda.

Amandır, xatirinə dəymə birdən,
Bəlkə də rəmzi var, gizlində səndən.

Əvvəlcə başına dolan onun sən,
Mənim əvəzimdə öp gözlərindən.

Yetir bu ərzimi qəlb ovlayana,
Kədərli qəlblərə məlhəm qoyana.

Dəmadəm, ləhzə-ləhzə, sən müdam de,
Ona məndən dua söylə, salam de.

Əgər lütf eyləyib halım sorarsa,
Bu idbar olmuş iqbalım sorarsa,

Nə gecəm var, nə də bir gündüzüm var,
Nə bir iş görməyə yox məndə kirdar.

Qərarım ol şəkər göftarım idi,
Mədarım ol gözəl rəftarım idi.

O sözlərdən ürəkdən dərd qalmış,
O rəftardan məni tufanlar almış,

Ürəkdə qəm, bu canımda soyuq tər,
Həyat bağçamda da əsir küləklər.

Haray, mənim bahar  fəslim nə soldu?
Həyat çeşməm daha görünməz oldu.

İnan, sənsiz elə yannam, yaxıllam,
Mənimtək görməmiş təşnə bu əyyam.

Əgər sevdan başımda qalsa böylə,
Ümidim yoxdu vəslə heç səninlə.

Dönüb bəxtim, gecəm bil, gündüz olmaz
Səhər doğsa qəmimdən heç nə qalmaz.

Kimin xoş bəxti var gülsün, sevinsin
Ona tale yar olmuş, qoy öyünsün.

Qarabəxtin halın hardan bilər o?
Sitəmdən, hicrdən bilməz xəbər o.

Günəş cəmallıda rəhm olsa hərgah
Günəşə həsrətlə mən çəkmərəm ah.

Axı, səndən uzaqdı bu kədər-qəm,
Ürək darda, ciyər qan, gözlərim nəm.

Könül doymuş inan ki, qəm-kədərdən,
Qaçaram vəhşitək, cinsi-bəşərdən.

Elə bil Məcnunam sevdayi-Leyli,
Ürəkdə səhrayə artırdı meyli.

Göründü bir qasid, yox-yox o candı,
Bu xəstə qəlbimə ruhi-rəvandı.

Məni şad eylədi, o verdi namə,
Nə namə, ətridə misli - şəmamə.

Dolunca dağu-səhra mişk ilə mən –
Dedim ahu göbəyi gəldi Çindən.

Başımdan əqlimi aldı bir anda,
Dəyişdi halimi bu xəstə canda.

Açarkən naməni getdi kədər, qəm,
Kəramət qapısı açıldı ol dəm.

Bu namə dilrüba, o yardan idi,
O munis sevgilim dildardan idi.

Gah öpdüm, gah da qəlbim üstə qoydum,
Mənə sevinc gətirmişiydi, duydum.

Fəqət birdən halım oldu pərişan,
O xəttə baxmağım deyildi asan.

Təəccüb eyləyirdim iqbalımdan,
Mənə namə gəlib mişkin xalımdan.

Baxanda naməyə halım duruldu,
Ürək də namənin ətriylə doldu.

İlahi, bu necə xoş saət idi?
Bu ki, bir əvəzsiz səadət idi.

Məgər bu dövranın rəyi dolandı,
Yatan bəxtim məgər, birdən oyandı?

Nə oldu cövr - çərx, ol zülmü-dövran?
O zülmündən məgər oldu peşiman?

Oxudum naməsin gülüzlü yarın
İşindən hali oldum ol nigarın.

O namə çox şəfəqqətlə yazılmış,
Necə lütfü-məhəbbətlə yazılmış.

Yazıb: "Ey hicranın bəndində dustaq,
Hicrana səbr ilə dözərlər ancaq.

Qoy, üzün dönməsin cövri-fəraqdan,
Hicrimdə əl üzmə sən iştiyaqdan.

Hələ əskilməmiş mehrin yanımda,
Sevdan başımdadır, zövqün canımda.

Səni unutmaram, fikrim bu olmuş,
Nə vaxt ollam o yarımla həmağuş.

Bütün eşq əhlinə bu bir məramdır,
Naümmidlik məşuqlara həramdır..."

Gəl ey saqi, gətir bir cami-gülgün,
Ürəkdə pas tutan dərdimi silsin.

Şükur olsun ki, bəxtim də yar oldu,
Nə xoş əyyam, nə xoş ruzigar oldu!

Gəl ey Vazeh, məcazi-eşqidən sən
Həqiqət tap, onunla yüksələrsən.

## SEYİD MİRHƏMZƏ ƏFƏNDİ NİGARİ

*XIX əsr Azərbaycan ədəbiyyatında "Seyid Nigari" təxəllüsü ilə tanınan Hacı Mirhəmzə əfəndi təriqət şerinin görkəmli nümayəndələrindən biridir. O, 1795-ci ildə Qarabağın Cicimli kəndində doğulmuşdur. Gənc yaşlarında Şirvana gəlmiş, dövrünün görkəmli alimlərindən bilik almışdır. Nigari Rusiya imperiyasının müstəmləkəçilik siyasətinə qarşı yönəlmiş müridizm azadlıq hərəkatının öncüllərindən olmuş və buna görə hökumət onu sürgün etmək istəmişdir. Şair təqiblərdən qurtarmaq üçün Anadoluya getmiş, ömrünün axırına qədər orada yaşamışdır. Nigari 1886-cı ildə Xarputda vəfat etmiş və özünün vəsiyyətinə əsasən Amasiya şəhərində dəfn olunmuşdur. Məzarı indi də orada - Şirvan camesindədir.*

*Bədii yaradıcılığa gənclik illərində başlayan Seyid Nigarinin şeirlər divanı XX əsrin əvvəllərində çap olunsa da sovet dönəmində onun adı, demək olar, tamam unutdurulmuş, əsərləri geniş oxucu kütləsinə naməlum qalmışdır. Yalnız son vaxtlar şairin əsərlərindən ibarət "Xaki-payin taci-sərim" kitabı "Azərbaycan" nəşriyyatında (2004) çap olunmuşdur. Nigarinin şeirlərindən nümunələr həmin kitabdan götürülmüşdür.*

### QƏZƏLLƏR

Cahan bağında, ey bülbül, Nigari kimi yar olmaz,
Mənim tək sinəsi gül-gül bulunmaz, dağidar olmaz.

Yaqılmış atəşə varım, alışmış sinədə narım,
Yanar canım bu odların, desəm duzəxdə var olmaz.

Dəgil bihudə kim, bülbül, yanar əlbət, qılar qül-qül,
Vəlakin mən kimi, ey dil, bulunmaz dağidar olmaz.

Yaqılmış odlara varım, dağılmış çöllərə narım.
Görənlər beylə odlarım, deyər bir belə nar olmaz.

Alıbdır canımı qəmzə, düşübdür könlümə lərzə,
Hər bir aşiq Seyid Həmzə, hər bir dilbər Nigar olmaz.

* * *

Bəxtim bana üz verdi, şərabdarə yetişdim,
Öpdüm ayağın, kaseyi-sərşarə yetişdim.

Hər şamü səhər kaseyi-sərşar ilə ömrüm
Sərməst keçib, badeyi-əsrarə yetişdim.

Nəqqaşi-əzəl çəkdi bənim nəqşimi aşiq,
Bu rütbeyi-həq dad ilə didarə yetişdim.

Oldum həme dəm nəqşi-Nigarim ilə məşğul
Əl dəgmədi bir karə, qələmkarə yetişdim.

Bəxş eylədi ol sərxəti-məşqim bana bir hal,
Pərkarə nə hacət, elə bir karə yetişdim.

Hər şamü səhər seyri-süluk eylədim axir,
Xaki-qədəmi-Əhmədi-Muxtarə yetişdim.

Əlminnəti-Lillahi ki, ey Miri Nigari,
Kamim bana yüz açdı, kərəmkarə yetişdim.

* * *

Nə qəmim var cahan içrə bənim, yar bənim,
Nəyim əksikdi bənim, yar bənim, var bənim.

Sayeyi ali-əba, badeyi-əshabi-səfa,
Xərməni-feyzi-bəha, cəzbeyi-əhrar bənim.

Sazü sazəndə qəzəl, çuşü xüruşi-sevda,
Xubi-şirin hərgəhi, təbi-şəkərxar bənim.

Azu çox, hər nə ki var bəzmi-hərifan içrə,
Malikanəm, həme dəm kaseyi-dəvvar bənim.

Hər yanə badə fəşan kaseyi-irsal etdim,
Bəzmlərdə çəkilən sağəri-sərşar bənim.

Bilmədim kim, neçə karim, neçə kirdarim üçün
Qırdı başimdə bütün bizeyi-dildar bənim.

Şükür, ey Miri Nigari ki, xərabat içrə
Cəngü ahəngü qədəh, şeri-şəkərbar bənim.

* * *

Didəbanam rəhgüzari-şahı gözlər gözlərim,
Baqmazam qeyri yola, şəhrahi gözlər gözlərim.

Seyr qılam kubəku, avaz verəm babi-bab,
Barigəhi bəklərəm, dərgahi gözlər gözlərim.

Vaqifi-yarəm, vəlakin bixəbər əğyardən,
Qafilə göz verməzəm, agahi gözlər gözlərim.

Zərrə mənzurim dəgil, dünya və mafiha, vəli
Aləmi-dareyndə bir mahi gözlər gözlərim.

Söyləmə sərbəstə, ey Seyid Nigari, aşikar
Söyləsə kim, bir kərə, Allahı gözlər gözlərim.

* * *

Ey könül, uyma gel, ol türreyi-tərrarlərə
Bəndəlik etmə Məsihi kimi zünnarlərə.

Yıqar, əlbəttə yıqar, axiri bərbad eylər,
Versən, ər mənzifi-şəhin şahi əğyarlərə.

Çəkəlim badeyi-səba, tutalım cam ətəyin,
Can fəda eyləyəlim məsti-qədəhxarlərə.

Söylə, ey peyki-səba, hali-pərişanımızı,
Nə deyir sultanımız, binəva naçarlərə.

Əcəba, varmı əsrarə xəbərdar, deyin,
Beylə kim, çarə olurmu bu giriftarlərə?

Neyçün iftadələrin halını sormaz, neyçün,
İltifat eyləməz ol xəsteyi-didarlərə?!

Necə ah eyləyəyim, Miri-Nigari, könlüm
Mübtəladır ləbi mül, arizi gülnarlərə.

**TƏRCİBƏND**

Nə əcəb dövlət imiş seyri-şikari-Qarabağ,
Nə gözəl nemət imiş söhbəti-yari-Qarabağ.
Rəşki-mişk ənbər imiş buyi-qubari-Qarabağ,
Abi-heyvan imiş ənhari-bukari-Qarabağ.
Gövsəri-tubi imiş çayi-çinari-Qarabağ,
Aləmi-cənnət imiş dar - diyari-Qarabağ.
İmdi bildim nə imiş vəsfi həzari-Qarabağ,
Yeridir ki, çəkərəm ah və zari, Qarabağ.

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

Ah, aşüftəligim zülfı-səmənsayə deyin,
Vah sərgəştəligim kakili-leylayə deyin.
Bu günü qarəliyim mehrsiz ol ayə deyin,
Kari-tərsaliqim ol zülfi-çəlipayə deyin.
Dərdi biçarəligim ləli-Məsihayə deyin,
Sirri-pünhanımı ol ağzi müəmmayə deyin.
Dərdimi dilbəri-şirinü dilarəyə deyin,
Ərz edin mehnətimi, cümlə şəhinşayə deyin.
Suzişi-könlümi ol qönçeyi-hümrayə deyin,
Necə ah eyləməyim bülbüli-şeydayə deyin.

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

Gəlin, ey əhli-könül, artıb azarım, eşidin,
Yox rəvaci, kəsilib bei-bazanm, eşidin.
Yüzülüb rövnəqi-gülzari-baharım, eşidin,
Qalmayıbdır, dükənib leylü-nəharim, eşidin.
Cəm olun bir yerə, azari-həzarim, eşidin,
İrişib vəqti, qazın dari-məzarım, eşidin,
Yıqılıb səbr, yanıb nayi-qərarım, eşidin,
Alışıb suziş ilə mayeyi-varım, eşidin.
Dağılın kim tutuşub nari-minarim, eşidin,
Yeridir ərşə çıqarsa ahu zarim, eşidin.

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

Düşmədi kuyinə bir kərə güzarım gecələr,
Sormadı halımı bir mahi-üzarim gecələr.
Bir bana yanmadı kim, gəlmədi yarını gecələr,
Ol səbəbdən alışır cani-fikarım gecələr.
Yıqılır atəşə dil, artır azarım gecələr,
Çəkilir nöh fələkə zari-həzarım gecələr.
Dağılır hər tərəfə atəşi-zarim gecələr,
Yandı pərvanə kimi odlara varim gecələr.
Şəm tək nar ilə düşdü sərikarim gecələr,
Bəs necə yanmaya bu könlümə narim, gecələr.

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

İltifat eyləmədi mehrsiz ol ay mana,
Almadı pərdəni şol dilbəri-hərcay mana.
Atmadı tirini peyvəstə qaşı yay mana,
Arizin açmadı ol qönçeyi-həmray mana.
Qılmadı mehr vəfa mahi-dilaray mana,
Salmadı sayəsin ol mehr humsay mana.
Heç meyl eylamədi bəççeyi-Ənqay mana,
Müxtəsər, eylədi çox zülm şəhənşay mana.
Kim olur nari-məhəbbətdə ki, bir tay mana.

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

Yandı canım gecələr, gəlmədi ol məh nə ücün,
Almadı pərdəni şol, mehri-səhərgah nə ücün?
Neyləyim, olmadı bir dəm bəna həmrah nə üçün,
Eylədi çah yerim mahi-fələk çah nə üçün?
Sormadı hali-pərişanimi ki, gah nə üçün,
Yandım atəşlərə, ol olmadı agah nə üçün?
Baqmadı bir bana bin söylədim, Allah nə üçün,

İltifat etmədi, ey vah, şəhinşah nə üçün?
Yetmədi dadimə ah, eylədim ey vah, nə üçün,
Söyləmən siz bana kim, ərşi yaqar ah, nə üçün?

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

Dari-mehr üzrə gərək qəsd şirin can edəyim,
Dili sərdarə çəkib şövqlə qurban edəyim.
Cigəri parələyib, bağrı qızıl qan edəyim,
Dəmbədəm əşk döküb xuni-dil əfşan edəyim.
Canı atəşkədəyi-eşqdə suzan edəyim,
Yandırıb xaneyi-variyəti viran edəyim.
Gecələr tabəsəhər, dəmbədəm əfqan edəyim,
Güli-məqsud açıla dərdimə dərman edəyim.
Ey Nigari, nə qədər sirrimi pünhan edəyim,
Yandı canım anı bu nəzmlə şayan edəyim.

Dağlayıbdır məni bir laləüzari-Qarabağ,
Yandırıbdır məni bir nari-Nigari-Qarabağ.

## QOŞMALAR

Ey cünuni-Leyla, aşiqi-şeyda,
Məhəbbətdir ancaq sirati-minhac.
Ey talibi-mövla, ey əhli-sövda,
Oldur təriqəti-sahibi-merac.

Söyləyim bir nüktə əhli-dünyayə,
Sanmasun ərbabi-dili bimayə,
Hərdən əyməz dünyayi-mafihayə
Kimin sərində var eşqdən bir tac.

Ərbabi-dil baqmaz artıq sevdayə,
Təsir etməz töhmət əhli-rüsvayə.
Fikr eylə kim, neylər əhü-dəryayə
Məhabəti-dərya, kəsrəti-əmvac.

Şamü səhər səy et, ey əhli-sövda,
Gərçe xətərnakdır təriqi-Leyla.
İmdad eylər sana ülfəti-mövla,
Çünki həmdəmimdir ol şiri-qəllac.

Eyləsə təriqi-sövdadə qərar.
Ta kim üz göstərə xeyməyi-dildar.
Ey Seyid Nigari, hasil olur kar,
Eyni-inayət ki baqsa bir qiyqac.

* * *

Ey dili-pürsövda, talibi-Ənqa,
Qafi-eşqdə var əsrari-düşvar.
Məgər kəşf eyləyə ol sirri mövla,
Yoxsa mümkün dəgil kimsəyə izhar.

Zərrə nə fəhm etsin dəşti-kamuni?
Qətrə nə anlasın bəhri-Ceyhuni?
Çün necə söyləsün sirri-biçuni?
Bəs söylə, kim etsün izhari-əsrar?

Sanma kim, asandır ilfəti, əgər
Rubadən kəmtərdir andə şiri-nər.
Sındırıbdır çox şahinlər şahpər,
Həvayi-Ənqayə nəhayətmi var?

Gərçi xətərnakdir təriqi-dilbər,
Vəhm etmə kim, həmrahindir xeyli ər.
Həm rəhnimunindir sədiqi-Kərrar,
Həm rəhbərindir Heydəri-Kərrar.

Ey Seyid Nigari, ey dili-sadə,
Kuyi-həqiqətə eşqdir cadə.
Çəkmə ələm kim, yetərsən muradə,
Dutubsan daməni-Əhmədi-Muxtar.

* * *

Ey istəyən yari, sevən dildari,
Mülki-məhəbbətdə gərəkdir ixlas.
İxlas ilə eylə kari-kirdari,
Gir təriqi-xasə, eylə qəlbi xas.

İxlasinə hərgiz verməgil xələl,
Ta yetişsin sana feyzi-bibədəl.
Böylu qurulubdur qanuni-əzəl:
İxlas ilə olsun kari-xas ixlas.

Fəryadinə yetsin eşqi dildarin,
İmdadina yetsin pərvərdigarin.
Ey dil, şamü səhər olsun izkarin,
Təriqi-vəhdətdə sureyi-ixlas.

Sıqın eşqi-yarə, şövqi-dildarə,
İstəazə eylə pərvərdigarə.
Dəryayi-əsrarə, dürri-şəhvarə,
Ey dəli dil, eylə kəndini qəvvas.
Mütrib kim saz eylər, ələ alıb tar,
Məşuqi kim söylər şövqilə dildar.
Seyid Nigaridə qalmaz ixtiyar,
Vəqt kim rəqs eylər eşqlə rəqqas.

* * *

Şamü səhər, ey dil, vəchi-dildarə,
Sərf eylədin nəzər kim oldun mail.
Zərrə qədər yer qalmadı əğyarə.
Göstərdi üz dilbər, məhv oldu hail.

Çakər eyləmiş kim, səni bir şahid,
Hasil olmuş sana ülfəti-cavid.
Şükr eylə kim, buldum dövləti-xalid,
Ey dəli dil, ey bəndeyi-İsmail.

Kəmali-eşqə kim eylədin iman,
Göstərdi üz sana yəqini-canan.
Sərvəri-xubanə bəxş eylədin can,
Bəxş eylədi sana ruhu-şəmail.

Girdin kim, meydanə mərdi-mərdanə,
Vermədin bac Təhəmtəni-dastanə.
Eylədin kim, ta xidməti-şahanə,
Şahənşahdan gəldi sana həmail.

Oynadarsan ki, top, qılırsan cövlan,
Çəkərsən ki, çilə, atarsan peykan.
Ey Seyid Nigari, ey mərdi-meydan,
Ey fənni-hünərdə ustadi-kamil.

**GƏRAYLILAR**

Aşıq oldum gene tazə
Bir növ cavanə, cavanə
Hanı bir əhli-dil yazə,
Ərzəm cananə-cananə.

Qəm əlindən getdim dadə,
Dərdimdir həddən ziyadə.
Yalvarıram, vermə badə
Zülfin Səlmanə, Səlmanə.

Cüda düşdüm ellərindən,
Kəsmədim göz yollarından.
Zülfi-Leyla əllərindən
Gəzdim divanə-divanə.

Bilməzəm ki, ol kərəmkar,
Əfv edərmi, günahım var.
Yalvarıram, mar kimi zar
Hərdəm yalmanə-yalmanə.

Qurdum ülfətin binasın,
Yıqdım dünyanın esasin.
Nigari, eşq səhrasın
Gəzdim mərdanə-mərdanə.

* * *

Əqlimi ey güli-xəndan,
Atdın həvayə-həvayə.
Eylədin bülbül tək əfqan,
Düşdüm ah-vayə, ah-vayə.

Qeydi-zülfində, ey mahim,
Ərşə yetişibdir ahim.
Mürəxxəs et, padişahim
Məni bir ayə, bir ayə.

Ləlindir ömrüm səfası,
Ağzındır dərdim şəfası
Ey sənəm, zülfin həvası
Əldə sərmayə, sərmayə.

Bəndi-bənd gəldim xuruşə,
Zövqi yetirdim suruşə.
Mayıl oldum cuşə-cuşə,
Ləbi həmrayə, həmrayə.

Dərsin almış rahibərdən,
Müshəfi-ruyi-dilbərdən.
Nigari hərdəm əzbərdən
Oxur min ayə, min ayə.

# MOLLA QƏDİR NACİ

*Molla Qədir Nacinin doğum və ölüm tarixi haqqında dəqiq məlumat yoxdur. Əsərlərindəki işarələrə və tədqiqatçıların söylədiklərinə istinadən demək olar ki, o, XVIII əsrin lap sonlarında, ya da XIX əsrin əvvəllərində Şamaxıda doğulmuş, təxminən 70 il yaşamışdır. Şeirlərindən məlum olur ki, yaxşı mədrəsə təhsili almış, klassik Şərq ədəbiyyatına, xüsusilə Məhəmməd Füzulinin yaradıcılığına yaxından bələd olmuşdur. O, şeirlərinin bir çoxunu Füzulidən ilhamlanaraq yazmışdır.*

*Əsərləri müasirləri tərəfindən yüksək qiymətləndirilmiş, təzkirə səhifələrini bəzəmişdir. Bir sıra şeirləri Seyid Əzim Şirvaninin təzkirəsində, Hüseyn Əfəndi Qayıbovun "Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir" kitabında qorunub saxlanmışdır. Buradakı nümunələr Seyid Əzim təzkirəsinin çap nüsxəsindən (1974) götürulmüşdür.*

## QƏZƏLLƏR

Nədir bais ki məndən şəfqətin kəm etmisən, cana!
Məni məhrum edib, əğyan məhrəm etmisən, cana!

Əgər Fərhad gəlsə, rəxnə salmaz zərrə miqdarı
Yetən nakəslə əhdin öylə möhkəm etmisən, cana!

Sərəfraz eylədin əvvəl məni yüz lütflər birlə,
Bu layiqdirmi, axır xakməqdəm etmisən, cana!

Salıbsan canıma firqət odundan bir şərarət kim,
Ləbim xüşk ol şərarətdən, gözüm nəm etmisən, cana!

Əgər aləm fərax olsa sərasər, girməgə yer yox,
Könül məmurəsin bir gunə pürğəm etmisən, cana!..

Sitəmkeş Nacini xaki-dərindən eylədin ixrac,
Rəqibani-cəfacuni mükərrəm etmisən, cana!

* * *

Səbadən- gül üzarın üzrə zülfi-müşkbar oynar,
Gülün yanında guya sünbili-pü tabdar oynar.

Edən təhrik ruyində niqabi-əbrgundurmu,
Və yaxud aftab üzrə gəzər əbri-bahar oynar?!

Sənin tək bibədəl şuxi gətirmiş dəhri-həftaba,
Nişatü zövqdən daim fələkdə biqərar oynar.

Görüb öz mehrini zäyil, fələk salmış sənə mehrin,
Dolanır başuva yüz şövq ilə leylü nəhar oynar.

Niqabım kəşf edib yüzdən əgər ərzi-cəmal etsən,
Olub məczuu bihuş hər nə kim, aləmdə var oynar.

Nəsimi-zülfünü bulsa məşami-Naciyi-xəstə
Olub pakubi-dəstəfşan məstvar oynar.

* * *

Dil bəla hicrində çəkməkdən vüsalındır qərəz,
Ağlamaqdan didə didari-cəmalındır qərəz.

Mərdümi-çeşmim dəmadəm kim, cigər qanın içər,
Röyəti-xakü xətü rüxsari-alındır qərəz.

Təc dilər üftadeyi-dərgahın olsun kim, ona
Ol mübarək yerdə olmaq payimalındır qərəz.

Cismi-zarım dərd çəkməkdən dönübdür mulərə -
Kim, ona vəsli-miyam-mumisalındır qərəz.

Xah əhvalım sual et, xah qıl qətlimə hökm,
Canə ancaq ləli-nabından məqalındır qərəz.

Safi olmaq istərəm fikrü xəyali-qeyrdən,
Könlüm içrə arizu fikrü xəyalındır qərəz.

Naciyi-biçarə ömrün eşq ara qılmış tələf.
Kim tamaşayi-rüxi-fərxəndəfalındır qərəz.

* * *

Ta kim, gözüm ol sərvi-güləndamə düşübdür,
Vəslin dilər, amma təməi-xamə düşübdür.

Xali-siyəhin gördü könül zülfünə düşdü,
Bir quş kimi kim, danə üçün damə düşübdür.

Sirri-dəhənin bulmağa zehnim dolanır çox,
Biçarəni gör kim, qələt övhamə düşübdür.

Geysuləri içrə yüzünü gizlədi ol məh,
Yüz ah ki ömrüm günü axşamə düşübdür!

İşrətlə qəmi qismət edən vəqt müqəssim,
Qəm hissəsi mən xəsteyi-nakəmə düşübdür.

Gör halımı, ey badi-səba, yarə degil kim,
Hicrində filani yaman əyyamə düşübdur.

Göstərsə mənə ruyin əgər şahidi-məqsud.
Ol dəm bilərəm qəm günü əncamə düşübdür.

Əksi-rüxi-saqi görünür badədə, oldur
Bais, həvəsim badeyi-gülfamə düşübdür.

Eyb eyləmə, ey Nacini meyxarə görən kəs,
Yengicə kişi şiveyi-islamə düşübdür.

* * *

Bizi öldürdü fəraqında qəmin, ay qaragöz,
Nə qəmin, düşmənə lütfü kərəmin, ay qaragöz.

Səni tərk eyləməzəm, cismimi hər ləhzə əgər
Çak-çak eyləsə tiği-sitəmin, ay qaragöz.

Muyə döndərdi təni-zarimi zülfün həvəsi,
Qıldı xəm qəddimi əbruyi-xəmin, ay qaragöz

Paybənd etdi qədin, eylədi dilxun dəhənin,
Qönçəvü sərvini bağı-İrəmin, ay qaragöz.

Var mənim həm neçə min xeyli-qəmü ənduhum
Gər sənin var isə min-min həşəmin, ay qaragöz.

Zirveyi -ərşə yetər payeyi-izzü şərəfim,
Başıma yetsə qubari-qədəmin, ay qaragöz.

Qurtatar rəncü qəmü dərdü bəladən Naci –
Vətəni olsa hərimi-hərəmin, ay qaragöz.

* * *

Bəlayi-eşqdən dönməz mənim piranəsər könlüm,
Əcəb biəqldir kim, hiç bilməz xeyrü şər könlüm.

İçib mey şövq camından, olubdur məsti-laəyqil –
Ki, gər aləm sərasər olsa qəm, tutmaz xəbər könlüm...

Sanır peykani-qəmzən müttəsil könlümdə sakindir,
O məcruhun həsəddən dəmbədəm qanın içər könlüm.

Əgər daş olsa dözməz xublər zülminə, heyranəm
Nə eylər kim, dözər ol zülmə bu xunincigər könlüm.

Gözəllər ruyi-zibasın görüb məsrur olan gözdür,
Düşüb şövq atəşi içrə əbəs zəhmət çəkər könlüm.

Mənə yüz versə gər dünyavü mafiha, yüzüm gülməz –
Ki, daği-hicrdən xali deyil şamü səhər könlüm.

Yetən məhruyə can versəm, mənə eyb etmə, ey Naci,
Ki, öz canü tənimdən əhli-hüsnü çox sevər könlüm.

* * *

Saqiya, ver mey ki can ilə bərabərdir mənə.
Bəlkə canımdan ziyadə xubü behtərdir, mənə.

Meydən özgə yox dəxi bir çarə mən dilxəstəyə,
Çünki qəm çəkmək cahan içrə müqərrədir mənə.

Şadlıqdan qeyri fərzən yüz ələm qılsam tələb
Bəxti-naməsuddən cümlə müyəssərdir mənə.

Olmasa mənzuri-çeşmim ləli-nabın, bərgi-gül
Cismimi yandirmağa guya ki əxkərdir mənə.

Üz çevirsəm mənbərü mehrabdən, eyb etmə kim,
Həlqeyi-zülfün, qaşın mehrabü mənbərdir mənə.

Üstümə qəm ləşkərin çəkmiş, məni tənha sanıb,
Bilməmiş sən dilrübanın eşqi yavərdir mənə.

Naciyəm, cürmü xətadan dəxi yoxdur bir qəmim –
Kim, səri-kuyin təvafi-Həcci-əkbərdir mənə.

## MİRZƏ İSMAYIL QASİR

*XIX əsrdə "Qasir " təxəllüsü ilə tanınan Mirzə İsmayıl Molla Səlim oğlu Axundov (1805-1900) Şamaxı qəzasının Ləki kəndində (indiki Ağdaş rayonuna daxildir) ruhani ailəsində doğulmuşdur. 7 yaşında olarkən atası vəfat etmiş, o, anasının və bacılarının himayəsində böyümüşdür.*

*İlk təhsilini Şamaxıda mollaxanada alan Qasir sonra Təbrizə gedərək, orada ərəb-fars dillərini və Yaxın Şərq ədəbiyyatını öyrənmişdir. O, Təbrizdən doğma vətənə qayıdaraq bir müddət Şamaxıda yaşamış, Qaradonlu Sərhəd Məntəqəsində işləmiş, nəhayət, XIX əsrin 50-ci illərində Lənkərana köçərək, orada məktəbdarlıqla məşğul olmuşdur. Qasir Lənkəranda "Üsuli-cədid" məktəbi açmış və ömrünü xalqın maariflənməsinə sərf etmişdir.*

*M.İ.Qasir gənc yaşlarından şeir yazmağa başlamışdır, O, Lənkəranda fəaliyyət göstərən "Fövcül-füsəha " ədəbi məclisinin başçısı olmuşdur. Əsərlərini həm klassik üslubda, həm də xalq şeri tərzində yazmışdır. Lakin şairin əsərləri vaxtında toplanıb naşr olunmadığından uzun müddət oxuculara naməlum qalmışdır. Şairin nəvəsi İshaq Axundov onun pərakəndə şeirlərini toplayıb səliqəyə salmış, AMEA Əlyazmalar İnstitutunun əməkdaşları T.Nurəliyeva və P.Kərimov həmin əsərləri tərtib edərək 1988-ci ildə "Yazıçı" nəşriyyatında buraxdırmışlar. Bu kitabdakı nümunələr həmin nəşrdən götürülmüşdür.*

### QƏZƏLLƏR

Gördüm yenə cananımı canan arasında,
Guya ki, durub huriyü qılman arasında,

Hər kim görə ol qaməti-mövzunu deyər kim,
Bir sərvü xuramandı gülüstan arasında.

Ox tək qədi-dilcuyi oiub canıma peyvənd,
Ney-ney bir əlifdir, yazılıb can arasında.

Gördüm gözünü zülfi-siyahilə dedim bəs,
Nərgiz açılıb sünbülü reyhan arasında.

Bir zərrə camalından olub Leylidə zahir,
Məcnun, yeri var, qalsa biyaban arasında.

Mənada ona cilvə edib eşqi-Züleyxa,
Qoydu neçə il Yusifi zindan arasında.

Hüsnilə sənə Yusif ola bəlkə bərabər,
Vəsf eyləyib, Allah, onu Quran arasında.

Hər dəm görünür həlqəyi-zülfində cəmalı,
Bir kuyi-bilurinidü çovkan arasında.

Hər laf vuran kimsənə aşiq ola bilməz,
Aşiq odu kim can verə meydan arasında.

Ey kaş ola bu Qasiri-biçarə müqəssir,
Məhbus ola ol çahi-zənəxdan arasında

* * *

Əgər zəmanədə min mahruy dilbər, ola,
O kimdi hüsnündə, ey məh, sənə bərabər ola.

Tutubdu zülfi-siyahın tək aləmi-zülmət,
Götür niqabı yüzündən cahan münəvvər ola.

Qaşındır qovseyn, xalın həcər, qədin tuba,
Üzün behişt, ləbin səlsəbilü kovsər ola.

Xətadu gər verələr müşki zülfünə nisbət.
Rəva deyil ki, cəhan sərbəsər müəttər ola.

Ölüncə, söylüyəcəkdir cəmalivün vəsfin,
Füzuli, Hafizü Şirazi, ya ki Qasir ola.

* * *

Bos ki, əhsəndir yüzün heç nəqşi-digər istəməz,
Mən bu vəchilə dedim: bu vəch zivər istəməz.

Əşki-çeşmim səfheyi-ruxsarı qıldı laləgun,
Bir də ol məh surətindən kəsbi-əhmər istəməz.

Mişki-zülfündən sənin əxz eyləyib rütbə bunu,
Bu müşəxxəsdir ki, müşki-əzfər ənbər istəməz.

Natəvan canım düşüb qətli-vüsalın əzminə,
Qaşların müştaqdır, bir ayrı xəncər istəməz.

Lələ baxmaz görsə hər kəs qönçeyi-xəndanını,
Bir də bil, məhşər günündə abi-kövsər istəməz...

Naz ilə rəftar edən sərvini görsə, bağban,
Bağ ara şümşad, azadü sənubər istəməz.

Var nə qədri bu fəna dünyada ömrü, dilbəra!
Qasiri-biçarə səndən qeyri dilbər istəməz.

* * *

Həmişə könlüm ol məhparənin vəslini yad eylər,
Budur bais, ona bu xəstə canını etimad eylər.

Edibdir parə-parə könlümü bir az nigahilə,
Müşəxxətdir bu cadugər cahanda çox fəsad eylər.

Yüzün göstərcək o gülrux vücudimdən əsər qalmıb,
Gözümdən qayib olcaq dərdimi həddən ziyad eylər.

Bu yoldan dutmuşam şövqilə möhkəm daməni-hicri,
Yəqinimdir məni vəslindən ol məh namurad eylər.

Nə tərsa məzhəbin ol yari-birəhm ixtiyar eylib,
Nə dini-paki-islama həqiqət etiqad eylər.

Nədir, yarəb, səbəb dilbər məni daim qılıb məhzun,
Rəqibin naz birlə xatirin peysətə şad eylər.

Biri yarsın qara bağrım, biri qanımı nuş etsin,
Gözü kirpikləri birlə bu qəsdə ittihad eylər.

Yəqin kilki-qəza bu dəftəri-aləmdə əzzəldən,
Mənim bədbəxtlər silkində ismimi səvad eylər.

Yazanda səfheyi-divanə hicran şərhini Qasir,
Qələm kirpiklərindən, göz qarasından medad eylər.

* * *

Dil meylini bir türreyi-şəbgirə salıbdır,
Divanəyə bax, kim özünü girə salıbdır.

Nahəq yerə saldı özünü dami-bəlaya
Bu qana bulaşmış məni təqsirə salıbdır.

Könlüm yüzünün Kəbəsinin tövfinə getcək,
Şam əhli tutubdur onu, zəncirə salıbdır.

Əfsunkəri-çeşmin Hələbi-arizin içrə,
Çəkmiş həbəşi qulları təsxirə salıbdır.

Dün guşimə bir nalə səsi yetdi çəməndən,
Bu nalə mənim könlümü təsirə salıbdır.

Dil verdi sənin zülfi-pərişanına dilbər,
Xali-siyəhin Qasiri təzvirə salıbdır.

## MÜCRİM KƏRİM VARDANİ

*Şeirlərini "Mücrim", "Kərim" və "Mücrim Kərim" təxəllüsləri ilə imzalayan Mücrim Kərimin şəxsiyyətinə dair bizdə heç bir məlumat yoxdur. Mərhum yazıçı və ədəbiyyat araşdırıcısı Əzizə Cəfərzadə onun XIX əsrin birinci yarısında yaşadığını və ömrünün çoxunu səyahətlərdə keçirdiyini bildirir. Tədqiqatçı Mücrim Kərimin müxtəlif əlyazma cünglərindən topladığı şeirlərini 1978-ci ildə "Sünbülüstan" adı ilə nəşr etdirmişdir. Buradakı nümunələr həmin kitabçadan götürülmüşdur.*

### QƏZƏLLƏR

Çün eşitdim, ey əzizim, sahibazar-olmusan,
Gərdişi-dövran ilə dərdə giriftar olmusan.

İncinib nazik bədən ol bəstər içrə gah-gah,
Söylənən sözlərdən, aya, xeyli bimar olmusan?

Hadisati-ixtilafi-dövrdən zəhmət çəkib,
Möhnəti-amacgahi-çərxi-qəddar olmusan.

Paybənd etmiş səni ol həbsgahi-xanədə,
Neçə gündür ol səbəbdən tərki-bazar olmusan.

Dərdi-sər vermiş sənə asibi-dövri-qəza,
Gül kimi rəngin solub, aludeyi-xar olmusan.

Mümkün olseydi olurdum xidmətində müstədam,
Yüzümə çalma günahım, etmə, bizar olmusan.

Bilməzəm çərxi-fələk qılmış səni aşüftəhal,
Yoxsa biçarə Kərim tək sinəəfkar olmusan?!

Bəxt mənə yar olub şahi-Süleyman bu gün,
Sayə salıb üstümə ol şəhi xaqan bu gün.

Gördü ki, mən durmuşam zarü həzin dərdnak,
Görmək ilə aşiqə eylədi ehsan bu gün.

Mən fəqiri görcəyin qıldı təbəssüm rəvan,
Könlümü şad eylədi Yusifi-Kənan bu gün.

Yetər ki, bəyzadəmiz babasını görməyə,
Getmiş idi naz ilə sərvi-xuraman bu gün.

Qayıdışı ol zaman yolda mənə rast olub,
Etdi bazar əhlini əmrinə fərman bu gün.

Bar xuda eyləsin dövlətini müstədam,
Yavəri olsun anın xaliqi-yəzdan bu gün.

Ağlama zar, ey Kərim, şükr elə allıhana,
Rəyin ilə dövr edər gərdişi-dövran bu gün.

* * *

Bəxti-nafərcam tək açılmadı qarə sabah,
Ki, deyəm hali-dilim yari-cəfakarə sabah.

Məni rüsva elədi bəxti-siyahim gecələr,
Ki, neçün gəlmədi bir dəm eləyə çarə sabah.

Usanıb zülm binasından, edib şərmü həya,
Eyləmə sineyi-əfkarımı sədparə, sabah!

Yataram hicr dəmində, elərəm ahü fəğan,
Nəlur izhar edəsən halımı ol yarə, sabah!

Nə uzun oldu fəraqın gecələr, gəlmədi sübh,
Yazığam, ruzi-vüsalə yetir, ol karə sabah.

Mənə ol qədr təğafül elədi munca zaman,
Az qalıbdır ki, olam dərbədər, avarə, sabah.

Kərimin kimsəsi yoxdur ki, deyə, hali-dilin;
Həmdəm ol bir neçə dəm mən kimi qəmxarə, sabah.

**QOŞMALAR**

Fələyin əlindən qılan ahü zar,
Biri mənəm, biri, yarəb, kim ola?
Güli-ruxsarına çəkən intizar,
Biri mənəm, biri, yarəb, kim ola?

Ey gözləri cəllad, qaməti mövzun,
Bu qədər bəndəni eyləmə dilxun,
Sərgəşteyi-aləm, halı digərgun,
Biri mənəm, biri, yarəb, kim ola?

Kərimin könlünü eyləmə viran,
Zülümdən usanıb, halına bir yan,
Hicran ələmindən didəsi giryan.
Biri mənəm, biri, yarəb, kim ola?

* * *

Gözəllərin şahı, şuxü nazənin,
Yetişibdi hökmün külli-cəhanə,
Bilirsənmi necə yaxşı yaraşır,
Zərəfşan kəmərin, incə miyanə.

Gəlməyib dünyaya sən kimi dilbər,
Gülbərg-ləblərin yaquta bənzər,
Dolanım başına, ey pəripeykər,
Zülfimə sübhlər eyləmə şanə.

Pərişan tellərin aldı qərarım,
Mayiləm hüsnünə, sevgili yarım.
Çeşmi-siyahımsan, lalə üzarım,
Olayım mən heyran sən kimi canə.

Şahibazi-aləm mən səni billəm,
Düşübən torpağa yolunda ölləm,
Daneyi-xalının qurbanı ollam,
Qəbul eyləyəsən, şahi-zəmanə.

Camalın artıqdır şəmsü qəmərdən,
Yolunda keçmişəm can ilə sərdən,
Biçarə Kərimi salma nəzərdən,
Əgərçi kafərəm, gəldim imanə.

* * *

Ey ağalar, könlüm çapdı ələmlər,
Sultanım, sərdarım, ağam gəlmədi.
Dərdü qəm tapdağı olmuşam həmin,
Göz qaldı yollarda, sonam gəlmədi

Fəraqü hicrində qalmışam həzin,
O şahibazımın çəkərəm qəmin,
Bu dərdlə ölməyim olubdu yəqin,
Üstümə gözləri alam gəlmədi.

Həmişə ahlardır virdü əzbərim,
Bilirmi halımı şahü sərvərim,
Yazıqlar halına, biçarə Kərim,
Can çıxınca dedin: "Balam gəlmədi".

## ƏNDƏLİB QARACADAĞİ

*XIX əsr Azərbaycan şerində həm klassik poeziya, həm də şifahi xalq ədəbiyyatı üslubunu davam etdirən istedadlı şairlərdən biri Əhdəlib Qaracadağidir. Onun doğum və ölüm tarixi haqqında dəqiq məlumat yoxdur. Əsərlərindən müəyyənləşdirmək olur ki, Əndəlib Qaracadaği XIX əsrin əvvəllərində Cənubi Azərbaycanın Qaracadağ mahalında, Əhər qəsəbəsində anadan olmuşdur. Uşaqlıq illərini doğma yurdda keçirmiş, gənc yaşlarında isə Şimali Azərbaycana gəlib bir müddət İrəvan xanlığında mirzəlik etmişdir. Xanlıq Rusiyaya birləşdirildikdən sonra, o, mayor Şubinin yanında katib vazifəsində işləmişdir.*

*Şairin şəxsiyyəti və yaradıcılığı uzun zaman elin aləminə naməlum qalmışdır. Onun haqqında ilk dəfə ədəbiyyatşünas Həbibulla Səmədzadə məlumat vermiş, sonralar əsərlərinin bir qismi toplanıb nəşr edilmişdir. Burada verilən nümunələr "Yazıçı" nəşriyatının çap etdiyi "Cənub ulduzları" (1984) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Sərgəştə könlümün yenə min müddəası var,
Qovğalı başımın nə bəlalı bəlası var.

Bir dəm şikəstə könlüm açılmaz, səbəb nədir?
Gəl gör zəmanənin yenə bir macərası var.

Namehribani gör, küsüb əğyar ilən gəzər
Yarəb, kimin bu tərzdə bir bivəfası var?!

Sərrafi-əql ləli-ləbin müştərisidir,
Can nəqdini nisar qılıbdır, bəhası var.

Vəhm eylə, tərk qıl belə sevdanı, ey fələk,
Kim, bir xətərli mərhələdir, çox cəfası var.

Tənha bilib vücuduma qəsd etmə, ey könül,
Yüz min bəlayi-dövr kimi aşinası var.

Ey Əndəlib, naleyi-bicadan əl götür,
Gəl gör, bu gülşənin nə əcayib səfası var.

* * *

Hərçənd düşdü eşqin odu canə, ey gözəl,
Atəş vurubdu xərməni-imkanə, ey gözəl.

Gər məndən olsa, gül üzünə salasan niqab,
Aləm məbadə od tutub odlanə, ey gözəl.

Arif yanında küfrdür, Allaha xoş deyil,
İnsan deмək sən kimi cananə, ey gözəl.

Bir badə ver ki, bəzmi-vüsalında şövqdən,
Ləlin kimi dönübdür cigər qanə, ey gözəl.

Yıxdın evini cümlə müsəlmanü kafərin,
Nəzzarə eylə küfr ilə imanə, ey gözəl

Sahibqirani-nəqd nədir, burda can gərək
Sərf etməyə bu huriyi-Rizvanə, ey gözəl.

Qurban yerinə eyd günü Əndəlibi kəs,
Gər piri can qəbul ola qurbanə, ey gözəl.

* * *

Tarı bilsin, hicr bizar eyləyib candan məni,
Ey əcəl, imdad qıl, qurtar bu hicrandan məni.

Qarə olsun ruzigari, həm pərişan xatiri,
Ayıra hər kimsə, ol zülfi-pərişandan məni.

Bülbüli-şuridəni gəl, mən təsəvvür eyləyib,
Mən qılma, bağiban, seyri-gülüstandan məni.

Aşiqəm, didar ku, ya kafərəm zünnar ku?
Tutma sən xaric müsəlmandan məni.

Qümri tək boynuma sallam həlqeyi-geysulərin,
Salmasa o sərvqəd ayrı gülüstandan məni.

Mətləb oldur, bəlkə, yarın könlünə təsir edə,
Əndəlibəm, mən qılma ahü əfgandan məni.

* * *

Gəhi casusə üz tutdum, gəhi dildarə yalvardım,
Bulardan naümid oldum, dönüb əğyarə yalvardım.

Bilirdim çün rəqib etməz əlaci-dərdi-pünhanim,
Əbəs kim, ol xətakarə məni-biçarə yalvardım.

Gəhi büxtanə səndən şikayətlər qılıb, gəhi
Əlimü qadirü həyyi-əlğəffarə yalvardım.

Gəhi bir zahidi-bietibarın minnətin çəkdim,
Gəhi bir sərxoşu hər anda, hər xummarə yalvardım.

Basani-Əndəlib, ey gül, kənari-künci-gülzari
Qənimətlər bilib, hər guşə tutdum xarə yalvardım.

**MÜXƏMMƏS**

Zülm eyləyib bu gərdişi-dövran, haray haray!
Ömrüm yetişdi axıra, ey can, haray, haray!
Göz yaşı sel tək aşdı başımdan, haray, haray!
Könlüm sarayın eylədi viran, haray, haray!
Bir olmadı bu dərdlərə dərman, haray, haray!

Ey çərxi-bivəfa, yenə zülmün əyan olub,
Əğyarə yox, mənə zülmün yaman olub,
Qövmü əqraba nə var, hamı gözdən nihan olub,
İllət nədir ki, bir bu qədər bədgüman olub,
Görməz bu zülmü gəbrü müsəlman, haray, haray!

Görməz bir öylə qaməti dünyada heç çəmən,
Zülfü saçılmış ay üzünə, sanki yasəmən,
Əsla ki, bir ola o gözə ahuyi-Xütən,
Bağrım qan oldu, seyr eyləyəndə o qaşı mən,
Qan içdirir o çeşmeyi-müjgan, haray, haray!

Bilməm bu könlümün nə qüsuri, günahı var,
Qalmaz əlində böylə ki, bir səbrlə qərar,
Əğyarə yar olub dedilər ki, o şux nigar,
Ey vay, əgər ki, keçsə belə qarə ruzigar,
Məskən olar mənə o biyaban, haray, haray!

Baldan şirin o dilləri indi yad edir könül,
Böylə xəyal ilə özünü şad edir könül,
Biçarə, bax, bu növ ilə fəryad edir könül
Kimdir fələk əlindən elə dad edir könül,
Min aşiq öldürüb sitəmlə bu meydan, haray, haray!

Sənan şeyx ikən o cürə bütpərəst olub,
Vurmuş daşa piyaləni eylə şikəst olub,
Huşyar imiş əzəldə, dönüb böylə məst olub,
Heç bilmədim ki, gün dönüb axşam nə vəqt olub,
Getdi aman, din ilə iman, haray, haray!

Aldatmayın məni belə, ey dostlarım, daha,
Dildara yetməyib qalıb ancaq bir Allaha,
Əl çək, təbib, bir də sağalmaz dəyən yara,
Olmaz daha bu Əndəlibin dərdinə çara,
Gülzarının üzü dönüb ondan, haray, haray!

## QOŞMALAR

Ay silkinib gedən yaşılbaş sona,
Səndə tər cığalar, tellər görünər.
Aşiq olan sənin kimi şahbaza
Mənim tək rüsvayi-ellər görünər.

Yar yarın yolunda gərək neyləyə,
Başın, canın, malın qurban eyləyə.
Meylin verən sənin təki Leyliyə,
Məcnun tək məskəni çöllər görünər.

Gedən, getmə, bir bəri bax, ay gedən,
Gözüm doymur sən tək gözəl kimsədən,
Gah yaxandan şölə verər ağ bədən,
Gah olur ki, nazik əllər görünər.

Oxlayıbsan məni, ey ziba sənəm,
Nə hasil, qoymursan yarama məlhəm.
Gecə xəyalınla olaram həmdəm,
Səhər yastığımda göllər görünər.

Eşitməsən Əndəlibin ahini,
Tutsan bivəfalıq rəsmi-rahini
Sidqilə çağırram şahlar şahini
Gör necə tufanlar, sellər görünər.

* * *

Mənim ərzi-halım bir təriq ilə,
Söhbət salıb nazlı yarə deyən yox,
Hicran odu saldı məni ayaqdan,
Yandi gözəl cismim narə, deyən yox.

Eşq atəşi canda çəkib zəbanə,
Aşiqliyim məşhur oldu cəhanə.
Pünhan saxlamaqdan yetişdim can,
İndi vurub aşikarə, deyən yox.

Halım hökumətli, dövlətli, mallı,
Qabağında qullar, şəhləli, şallı,
Bir mina gərdənli, buxağı xallı,
Siyəh saçlı gülrüxsarə, deyən yox.

Ey üzü gül, boyu sərvü sənubər,
Vəsfin eyləmişəm dilimdə əzbər.
Bilməm nə səbəbdən yeganə gövhər,
Yetişmədi xiridarə, deyən yox.

Bir gülüzlü yara aşiqəm, aşiq
Bir şiringöftara aşiqəm, aşiq.
Mən də bir nigara aşiqəm, aşiq.
Əndəlib tək gülüzarə deyən yox.

**GƏRAYLILAR**

Zahid, bir neçə kəlmə sən,
Eşit şəhri-qiyamətdən.
Gör nə cəfalər gorübdür
Könlüm bir sərvqamətdən.

Nə qəddi sərv, sənubərdir,
Yoxsa şümşadi-Azərdir.
Ya möcüzi-peyğəmbərdir,
Zahirdir çox əlamətdən.

Ya məgər xaliqi-sifat,
Xəlq etmiş bir həbbi-nəbat,
Ləbləridir abi-həyat,
Əmmək olmaz lətafətdən.

Olur mənim kimi hər ac,
Qaşların gəncinə möhtac,
Görsə bu guşəni həccac
Üz döndərər ziyarətdən.

Bax mövsümi-novbaharə,
Əzmi-seyri-gülüzarə
Əndəlibi-bəxtiqarə
Söyləsin bu rəvayətdən.

* * *

Eyləyibdir çox cəfalar,
Məni-binəvayə zülfün.
İncidib, salmış özü tək,
Nə uzun sevdayə zülfün!

Dönüb bir sultani-sədrə,
Təkyə vermiş mahi-bədrə,
Tən eylər leylətül-qədrə,
Həm şəbi-yeldayə zülfün.

Olma eşq əhlinə qatil,
Cahil, sən qədri-qiymət bil.
Necə ki, göylərdən qəndil –
Asmış kəlisayə zülfün.

Sənsən, ey şahların şahı,
Eşq əhlinin qibləgahı,
Bağışlarlar hər günahı,
Tutsa əl duayə zülfün.

Eylə Əndəlibi-zari,
Siyah zülfün giriftari.
Çox aşiqi-biqərari
Döndərsin şeydayə zülfün.

**HEYDƏRİLƏR**

Sanei-qüdrətdən siyəb xalların,
Arizində nə zindanə duşübdür.
Birisi həbəşdir, birisi hindu,
Bəd əməllər xoş məkanə düşübdür.
Əzizim, nə məkani,
Dehqanın nəm əkani,

Eşqinin avarəsi,
Nə yeri, nə məkani?
Aşiq ilen əvvəldən,
Yediyin nəmək hani?

Pərtovi-cəmalın oldu münəvvər,
Təəccüb eylərəm, Allahü-əkbər!
Mehri-rüxsarindən xurşidi-ənvər .
Bir zərrədir asimanə düşübdür.
Əzizim, asimanə,
Zülf üzdən asma yenə.
Verməz fələk hərifi
Şah-cənnət asi mənə.
Həsrətindən fəğanim
Çulğaşıb asimanə.

Qaşların fitnədir, gözlərin cadu,
Xədəngi-müjganın mənə tutdu ru.
Gəlib can almağa kafəri-bədxu,
Ver nəsihət, bəd gümanə düşübdür.
Əzizim bu gümani,
Dərs oxu begu məni,
Fərağında könlümün,
Yox idi bu gümani
Çəkməz hüsnün surətin,
Gəlsə iki yüz Mani.

Hərami gözlərin salıbdır cəngi,
Yay qaşların müjgan olub xədəngi.
Çapdı ingilisi, rumi, firəngi,
İndi fikri İrəvanə düşübdür.
Əzizim İrəvani,
Həccdən İrəvani,
Nə zülm oldu, görmədin
Aşiqə irəvani!
Az qalıb gözüm yaşı
Yıxa, gəl, İrəvani.

Şöleyi-ahimdən tutuşdu aləm,
Nə səbəbdən sənə yetmədi naləm?
Əndəlibəm, şükr eylərəm dəmadəm,
Həsrət gözüm gülüstanə düşübdür.
Əzizim gülüstani,
Oxudum "Gülüstan"i,
Gülşəni-hüsnün görən
İstəməz gülüstani.
Səndə olan lətafət
Bax gör, gül üstə hani?

* * *

Söylə görüm, olum dilin qurbanı,
Nədən vəfa eyləmədin iqrarə?!
Vaxt ikən aşiqə etmədin xəbər,
Bəlkə eyləyəydi dərdə bir çarə.
Əzizim, dərdə çarə,
Durmuşam dərdə çarə,
Dil bilən təbib gərək
Eyləyə dərdə çarə.
Çarəsiz xəstələrə
Bulunur dərdə çarə.

Qorxuram əğyarə olasan həmdəm,
Qədrini bilməyə dilbilməz adəm.
Aşiq gərək ləhzə-ləhzə, dəmadəm
Can qurban eyləyə sən tək nigarə.
Əzizim, nigarə bax,
Nəqşə bax, nigarə bax.
Qanımı güllər alır,
Etdiyi nigarə bax.
Həsrət qalan gözlərim,
Doyunca nigarə bax!

Sən tərk eyləyəli əhdü ilqari,
Qalmayıb könlümün səbrü qərari.

Sənin kimi alagözlü nigari,
Tanrı nəsib eyləməsin əğyarə.
Əzizim əğyarilən,
Bayqular əğyarilən,
Görüm başa getməsin,
Səninki əğyarilən,
Necə görsün gözlərim
Gəzəsən əğyarilən?

Necə rəva gördün, ey mələkzadə,
Döndün aşinadan, dil verdin yadə.
Dərdə tabım yoxdur bundan ziyadə,
Baş götürüb gedim hansı diyarə?
Əzizim bu diyarə,
Yol düşdü bu diyarə,
Gəlsə loğman sağalmaz,
Sinəmdəki bu yarə.
Yetəsən məzarimə,
Deyəsən budu yarə!

Vəsfində çoxların açılıb dili,
Əndəliblər sevər sən qızılgüli,
Nədən tərk edərsən şeyda bülbüli?
Qızügül tək həmdəm olursan xarə.
Əzizim xarə bağlar,
Atlası xara bağlar,
Məgər bülbül ölübdür,
Gül meylin xarə bağlar?
Mən ölləm, yar ağlasın,
Özgələr xarab ağlar.

# LEYLİ VƏ MƏCNUN

*məsnəvi*

## DİBAÇƏ

*...Gənclik günlərində on dörd yaşında ikən Qaracadağ mahalının Əhər qəsəbəsində Leyli kimi bir gözəl sənəmə düçar olub, ona eşq yetirdim. Rəhmsiz eşq o dərəcədə tüğyan elədi ki, onu təsəvvür etmək qeyri-mümkündür. Mənim kamil ustadım eşq oldu. Allah taalanın qüdrətindən mənə söz söyləmək (şeir demək) nitqi verildi və mən aləmdə bülbül kimi tərənnümə gəldim. Əndəlib adı ilə məşhur oldum. İşin əvvəlində məzəli türkülər (seirlər) yazdım. Mənimlə məşuqənin arasında ittifaq düşən şeydən "Leyli və Məcnun " səyağında inşa eləmişəm ki, yadigar olaraq qalsın və oxuyanlar məni bir dua ilə yad və şad eləsinlər.*

Məşşateyi-feyzi-süni-bari
Zinətlədi şahidi-bahari.

Dilbər kimi geydi rəxti-əhmər,
Saldı başa məcəri-muşəccər.

Gülşən geyinib libasi-diba,
Hürani-behişt tək sərapa.

Sərvi-çəmən oldu miri-məhfil,
Geydi qədinə qəbayi-yaşil.

Qumruyü təzərv olub həmavaz,
Ahəngi-müxalif etdilər saz.

Gülşəndə niqab açanda çün gül,
Bu şeri müdam oxurdu bülbül.

MÜXTƏSƏR SAQİNAMƏ

Ey saqiyi-gülüzar, bəsdir,
Naz etmə, keçir bahar, bəsdir.

Ver badeyi-xoşgüvar, içirmə
Zəhri-qəmi-nagüvar, bəsdir.

Tökdü meyi-ərğəvan üçün qan
Bu dideyi-əşkbar, bəsdir.

Ver badəni, rəfi dərdsər qıl,
Öldürdü məni xumar, bəsdir.

Ey saqiyi-səngdil, kərəm qıl,
Azari-dili-fikar, bəsdir.

Qurbanın olum, sən etmə barı,
Qıldı mənə zulm yar, bəsdır,

Hüsnün çəmənində Əndəlibəm,
Ey gül, məni etmə xar, bəsdir.

MƏŞUQƏ HAQQINDA MÜXƏMMƏS

Gördüm Əhərdə bir güli-rəna, əcəb-əcəb,
Cəlladü cansitanü dilara, əcəb-əcəb,
Olmuş nişani-hüsn hüveyda, əcəb-əcəb,
Salmış cahanə şurişü qovğa əcəb-əcəb,
Vəh-vəh, nə xoşmuş büti-ziba, əcəb-əcəb!

Ol bivəfa qılar nə qiyamət qiyaməti,
Hər baxış ilə məhv edər əhli-səlaməti,
Billah, bu zinətin yenə var çox əlaməti,
Hər dilşikəstə kim, görüb ol sərvqaməti,
Fəryad çəkdi, söylədi vah-va, əcəb-əcəb!

Qıldın düçar dərdə, fələk, bivəfaləri,
Gətdin bəlalı başıma yüz min bələləri.
Ey bivəfa, yolunda nə çəkdim çəfaləri,
Tərk eylədim rəfiqləri, aşinaləri,
Oldum qəribü bikəsü tənha, əcəb-əcəb!

Pəjmürdə qıldı sərsəri-qəm novbaharimi,
Əyyami-hicr əlimdən alıb ixtiyarimi,

Kəsdi fəraq rişteyi-səbrü qərarimi,
Bidərdlər eşitdi mənim ahü zarimi,
Tən ilə qıldılar nə tamaşa, əcəb-əcəb!

Ey Əndəlib, gülşəni-hicranü dərdü qəm,
Cövri-bəlakəşideyi-dövranü bəxti kəm,
Göz yaşını gülab kimi tökmə dəmbədəm,
Müşkülguşa Əmiri-ərəb, Xosrovi-əcəm,
Həll eyləsin bu müşgülü mövla, əcəb-əcəb!

Mənzilgəhi-hurdan qayıtdım,
Öz mənzilimdə qərar tutdum.

Gər dəşt mənimçün oldu zindan,
Məhbusu müqəyyədü pərişan.

Hər kimsəyə dərd qıldım izhar,
Gördüm ki, əlac yoxdu, zinhar!

Birisi deyir: Cünun olubdur,
Dindirmə ki, qeyrgun olubdur.

Birisi qılar bu növ tədbir:
"Divanələrə gərəkdi zəncir".

Az qaldı məni-şikəstəvü zar,
Zəncirə düşüb olam giriftar.

Qalmadı nə atəvü, nə anə,
Vurdum qamusin imtəhanə.

Biri mənə olmadı mədədkar.
Hicran günü qəmlərimə qəmxar.

Bica yerə cümlə döndü məndən,
Ayırdı fələk məni vətəndən.

Düşdüm yola bərkənar getdim,
Vəhşilər ilə qərar tutdum.

Əql ayinəsinə daş vurdum,
Məcnun yerinə baş vurdum.

Çəkdim gecələr bəsi fəğani.
Oldu adım Əndəlibi-sani.

Bir gün dolanıb şikar edirdim,
Fikri-qəmi-ruzigar edirdim.

Tikdim gözümü səvadi-rahə,
Söylərdim o badi-sübhgahə:

- Key badi-səba, apar pəyamim,
Dildarə yetir mənim səlamim.

Dərgahinə Əndəlibi-şeyda,
Söylə, neçə beyt etdi inşa.

## MİRZƏ MEHDİ NACİ

*Mirzə Mehdi Naci 1805-ci ildə Gəncədə doğulmuşdur. "Divani-hikmət'in fəal üzvlərindən olan Naci dövrünün tanınmış şairi, xalq təbabətini gözəl bilən həkimi həm də mahir həkkak-xəttatı olmuşdur. Onun hazırladığı gözəl ornamentli qəbir daşları indi də Gəncə qəbiristanlığında qalmaqdadır. Naci Qarabağ, Şəki, Qazax, Şamaxı şairləri ilə yaxından əlaqə saxlamış, tez-tez onlarla məktublaşmışdır. O, 1882-ci ildə Gəncədə vəfat etmiş, şəhərin İmamzadə qəbiristanlığında, hələ sağlığında özü üçün hazırladığı məqbərədə dəfn edilmişdir.*

*Bəzi cünglərdə şeirləri qalmışdır. Burada verilən nümunələr Firidun bəy Köçərlinin "Azərbaycan ədabiyyati"(IIcild, 1981) və "Yazıçı"'nəşriyyatının çap etdiyi "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Yandı canım hicrdən, ruhi-rəvanım gəlmədi,
Çıxdı əflakə fəğan, ol əl-amanım gəlmədi.

Keçdi-ömrüm, natəvan oldu tənim də, vay kim,
Bu təni-rəncurimə bir dəxi canım gəlmədi.

Keçdi əyyami-baharım, gözlərim gözlər yolu,
Noldu, yarəb, bülbüli-şirinzəbanım gəlmədi?

Gəlmədi, aya, səbəb noldu, vücudim səhhəti?
Deməyə bir kimsə yox sirri-nihanım gəlmədi?

Dinü imanım nə müddətdir gedib məndən uzaq,
Çünki yarım gəlmədi, dinü imanım gəlmədi.

Seyli-qəm peyvəstə qıldı, münhədim dil mülkünü,
Mülki-dil təmirinə ol mehribanım gəlmədi.

Getdi tab ilə təvanım cümlə əldən, Naciya,
Bu təni-zarə neçün tabü təvanım gəlmədi!

* * *

Könül mürği səri-kuyindən özgə bir məkan tutmaz,
Bu sirri xəlqdən kim, eşq asari nihan tutmaz.

Nigəhbanlar kimi xalisiyəhlər tutdu damanim,
Deyil adət qulami-xanəzadı pasiban tutmaz.

Tüyurin bəççəsi öz aşiyanində bulur rahət,
Onunçun mürği-dil zülfundən özgə aşiyan tutmaz.

Könül şəhbazi meyli-kəbkü türacü təzərv eylər,
Əzizim, meyl edib hərgiz o, mürği-makiyan tutmaz.

Verən can nəqdini bazari-eşqi-dilrübalərdə
Əyandır hiç tacir böylə sövdadən ziyan tutmaz.

Olub viranə dil mülkü, çıx ondan, yığ büsat, ey dil,
Xərab olmuş məkanda hiç aqil xaniman tutmaz.

Qulamın olmasa mövlasına ixlası kamiltər,
Bu rövşəndir, onu mövlası bir dəm kamran tutmaz.

Əgər tökdünsə qanım qəhr ilə, bir cürə nuş eylə -
Ki, derlər böylə olsa qanlını, əlbəttə, qan tutmaz.

Mənə derlər ki, tərki-eşqi-yar et, özgə yarı tut,
Şikari-rubəhi haşa, gedib şiri-jəyan tutmaz.

Deyir xəlqə həmişə zahidi-zahirpərəst iman,
Özü fail olan feli, əzizim, rahban tutmaz.

Təriqi-eşqdə, Naci, ayağın kəsmə qəflətdən,
Xilafi-rahi-eşqi, bigüman, bir nüktədan tutmaz.

* * *

Dila, hər bir cəfa kim, yardəndir, eyni-rahətdir,
Gədayə hər nə gəlsə şahdan, eyni-inayətdir.

Cigər qanı gözümdən gəldiyiçün dəmbədəm artar,
Əgər olsaydı dərya,qurtarardi, bu nə hikmətdir?!

Hədisi-Qeysü Fərhadü Züleyxa, Vamiqü Əzra
Mənim hali-pərişanım yanında bir hekayətdir.

Qoyanda - yaxşı saxla - dedilər - təndə dilü canı –
Ki, təndə nəqdi-canın bir pərinindir, əmanətdir.

Soruşdum:   Ey büti-şirinləbü şəkkərdəhən, aya
Bu istiğnalı olmaq xubrulərdə nə adətdir?

Dedi: - Aşiq olan lazımdı tab etsin qəmi-yarə -
Ki, məşuq aşiqə hər nə rəva görsə, inayətdir.

Dedim: - Dilbər, müəmmayi-dəhanın aşikar eylə!
Dedi: - İma əgər əbrudən etsəm çox kifayətdir.

Dedim: - Məqsudin, ey, can isə minnətdir dilü canə,
Dedi: - Məhvəşlərin sevdası əvvəldən xəsarətdir.

Dedim: - Pərvanə tək, cana, sərasər cismimi narə
Əgər yaxsan, məni-dilxəstəyə lütfü səadətdir.

Züleyxa başinə gör kim, nə işlər gəldi Yusifdən,
Əgər peyğəmbəri-həqq isə, həqqa, bidəyanətdir.

Qərəz kim, məqsədi-məqsudə yetmək istəsən,
Naci, Fəna sərmənzilin istə ki, ol, möhkəm imarətdir.

* * *

Şanə hər dəmdə ki, ol zülfi-pərişanə dəyər,
Tari-mulər dağılıb hər biri bir yanə dəyər.

Şövkətü şan ilə cahın sənin, ey şahənşah,
Rüfəti-dəbdəbeyi-cahi-Süleymanə dəyər.

Atma qəmzən oxunu, xövf elə zülm etməkdən –
Ki, atan dəmdə gəlib hər biri bir canə dəyər.

Könlümə vurdu cəfa oxlarını müjganın,
Afəti-dəhr dəxi bir gün o müjganə dəyər.

Zahida, olma məlul əldəki peymanəmdən,
Əqdəmi-sidqin ilə səndəki peymanə dəyər.

Dili-zarımda bəsi sancılıdır peykanın,
Atasan yüz kərə peykanını peykanə dəyər.

Daneyi-xali-ruxi-yarə nəzər qıl, zahid,
Billah ol sübheyi-səddanənə bir danə dəyər.

Naciya, salma nəzər mahliqalər yüzünə,
Atəşi-məsiyətin pənbeyi-imanə dəyər.

## AŞIQ PƏRİ

*Aşıq Pəri Azərbaycan aşıq şerinin görkəmli nümayəndələrindən biridir. O, təxminən 1810-1811-ci illərdə Qarabağda Maralyan kəndində anadan olmuş, çox gənc yaşlarında vəfat etmişdir.*

*Gözəl, rəvan təbli, ağıllı və hazırcavab qız olan Aşıq Pəri müasirləri arasında dərin hörmət qazanmışdır. Onun Mirzəcan bəy Mədətov, Cəfərqulu xan Nəva, Məhəmməd bəy Aşiq və başqaları ilə deyişmələri ədəbiyyat aləminə məlumdur. Əsərlərinin yalnız az bir hissəsi bizə gəlib çatmışdır. Verilən nümunələr "Azərbaycan Klassik Ədəbiyyatı Kitabxanası"nın VIII cildindən (1988) götürülmüşdür.*

### QOŞMALAR

Mürşidi-kamildən dərsimi aldım,
Can götürüb bu meydana gəlmişəm.
Mürği-Səməndərin aşinasıyam,
Od tutuban yana-yana gəlmişəm.

Müxtəsər, nə deyim, naşısan naşı!
Tutubdur yaxanı eşqin ataşı,
Bu tariflər zənənə nə yaraşı?
Həqq bilir ki, mən mərdanə gəlmişəm.

Pünhanda bir azanım var mənim,
Gözlər yolda, intizarım var mənim,
O kəlməndən xəridarım var mənim,
Sən sərrafsan, mən də kana gəlmişəm.

Zənbur olar şanda belə məkanda,
Çox ariflər məndə gənci-pünhanda,
Bülbül - abadanda, bayqu - viranda,
Əndəlibəm, gülüstana gəlmişəm.

Pərizadə əl götürməz canından,
Dərsin alıb sahibkamal yanından,
Külli-işin, mərifətin kanından,
Bəzm içində mən fəğana gəlmişəm.

* * *

Eşitmişdik, qulluğuna yetişdik,
Gördük ki, düşmüsən dildən-dilə sən.
Unutmayıb müsəlmanlıq şərtini,
Matəm tutub bir insafa gələsən.

Bu işdə Qədirin varıdır rayı,
Yetən kəslər ona deyir sevdayı
Aralığa düşüb məhərrəm ayı,
Layiq deyil onda deyib-güləsən.

Yaxşı yetər imamı fəryadına,
Belə işin ləzzəti nə, dadı nə?
Adam bildik biz də gəldik adına,
Adamlığı qanmayıbsan hələ sən.

Ey Pəri, təcil et sualında sən,
Nöqsan yetiribsən kəmalında sən,
İmdi zurna çalmaq xəyalındasan,
Onu gərək axirətdə çalasan.

* * *

Katiblərin şahı dəftər içində
Qələm ilə nazik əllər oynaşır.
Fitnəli, fellisən, nazü qəmzəli,
Dəhanında şirin dillər oynaşır.

Eşqinin əlindən gedərəm bada,
Dərdim olur gündən-günə ziyada,
Şiveyi-rəftarın düşəndə yada
Bağrımın başında millər oynaşır.

Dad elərəm, haray naşı əlindən,
Yandı cigər eşq ataşı əlindən,
Mən nə deyim gözüm yaşı əlindən,
Üzüşür sonalar, göllər oynaşır.

Adam var dolanır məkrin içində,
Adam var dolanır zikrin içində,
Sənin kamalında, fikrin içində
Əcaib-qəraib hallar oynaşır.

Pəriyəm, xəlq ara olmuşam bacı,
Kimsənin kimsəyə yox ehtiyacı,
Bəlxü Buxaranın, Hindin xəracı
Zənəxdanda siyəh xallar oynaşır.

* * *

Nə yatıbsan ləhaf bəstər içində,
Bimarmısan, nədir bəs halın sənin?
Eşqin mərəzinin mən təbibiyəm
Bəyan eylə mənə əhvalın sənin.

İsmi-şərifiniz dada yetişsin,
Mətləb alıb hər murada yetişsin.
Xaliq özü bir imdadə yetişsin.
Hifzində saxlasın zavalın sənin.

Bar ilahım gülzarına qıymasın,
Xəstə olan bimarına qıymasın,
Şirin-şirin göftarına qıymasın,
Bağışlasın qaşi-hilalın sənin.

Bir məsəldir: Bağban olan bar çəkər,
Əndəlibin hər meyli gülzar çəkər,
Allahına bəndə ahü zar çəkər,
Qəm çəkmə, kamildir kamalın sənin.

Mən Pəriyəm, eşqə zaram neyləyim,
Dərdi-dildən xəbərdaram neyləyim,
Burdan ora intizaram, neyləyim,
Şəfalansın nuri-vüsalın sənin.

**GƏRAYLI**

Zalım Şəcər dad əlindən,
Sən ha nahaq qan eylədin.
Zülm ilə könlüm şəhrini,
Gör necə viran eylədin.

Saymadın sultanı, xanı,
Eyləyibsən nahaq qanı,
Badam kimi növcavam,
Yer ilə yeksan eylədin.

Necə qıydın gülzarına,
Punhan keçən iqrarına,
Saldın yollar kənarına,
Dörd yanı al qan eylədın?

Pərinin dərdi tüğyandı,
Sakin yeri Maralyandı,
Gülüm qonçasında yandı,
Bülbüllər əfqan eylədi.

## MİR MEHDİ XƏZANİ

*XIX əsr Azərbaycan tarixşünaslığında "Kitabi-tarixi-Qarabağ" əsərinin müəllifi kimi tanınan Mir Mehdi Xəzani həm də görkəmli şair olmuşdur. Onun tərcümeyi-halı haqqında ətraflı və dəqiq məlumat yaxdur. Təxminən 1811-ci ildə Zəngəzurda Bərgüşad mahalının Məmər kəndində doğulduğu və 1893-cü ildə öldüyü güman edilir. Məzarı Qarubağın Tuğ kəndindədir.*

*Bədii yaradıcılığında Füzuli ənənələrinə və xalq ədəbiyyatı üslubuna söykənən Mir Mehdi Xəzaninin qəzəl, qəsidə, müxəmməs, müstəzad, qoşma, gəraylı, bayatı janrlarında yazılan şeirləri tapılmış və 1989-cu ildə "Əsərləri" Bakıda çap olunmuşdur. Burada verilən məlumat və bədii nümunələr həmin kitabdan gotürülmüşdür.*

### QƏZƏLLƏR

Genə dildar səri-kuyi bu gün yadə düşüb,
Dili-üftad olub üftadəvü üftadə düşüb.

Gər alır canımı öldürmək üçün, eyb deyil,
Qüreyi-eşqdə can ol gözü səyyadə düşüb.

Bağban, sərvlər övsafını çox söyləmə kim,
Sərvlər çoxdu və lakin bu bir azadə düşüb.

Mürği-dil rəşki-gülüstani-rüxünlə daim
Şurü əfganə gəlib, naləvü fəryadə düşüb.

Xahişi-röyət ilə gər yanıram atəşə mən,
Bu təmənnayə ki, mən düşdüm, o Musa də düşüb.

Ey Xəzani, rəhi-eşq içrə məni mən etmə
Ki, bu sevdayə könül aləmi-baladə düşüb.

* * *

Yetişdi cana könül, ey nigar, rəhm eylə,
Qalıb yolunda gözüm intizar, rəhm eylə!

Fəğanü nalə-işim, əndəlibi-şeydayəm,
Açılmadı mənə bir növbahar, rəhm eylə!

Xumar gözlərinin çün məriziyəm, ey gül,
Rəva deyil ki, qalam böylə zar, rəhm eylə!

O qədər möhnəti-hicranını çəkib könlüm
Ki, qalmayıb dəxi səbrü qərar, rəhm eylə!

Cəmal həsrətiyəm, daima odur fikrim,
Olubdu dərdü qəmim sədhezar, rəhm eylə!

Nə dərdməndü nə bir munisü nə yarım var,
Nə bir ənisü nə bir qəmküsar, rəhm eylə!

Məlali-rəşgü vüsalü hücumi-firqətdən
Olubdu didələrim əşkbar, rəhm eylə!

Xəzani xəstə dərində həmişə saildir
Ki, yox əlində dəxi ixtiyar, rəhm eylə!

* * *

Genə biçarə könül düşdü bir əyyar əlinə,
Rəhmi yox, möhnəti çox, şuxi-sitəmkar əlinə.

Zülfi xəttü qaşu göz dəstinə düşmüş könlüm,
Necə bir fərdi-müsəlman düşə küffar əlinə.

Həsrəti-ləli-ləbi bağrımı pürxun etmiş,
Hiç kim düşməyə, ya rəb, belə xunkar əlinə.

Cümleyi-mətləbü məqsudu olurdu hasil
Yar düşsəydi əgər aşiqi-didar əlinə.

Bülbülün böylə ki, daim işi fəğan olmuş,
Nalə etməz, düşə gər bir dəxi gülzar əlinə.

Daima xubların ülfəti əğyar ilədir,
Gül vüsalı, budur adət ki, düşər xar əlinə.

Gərçi Məcnun dedi kim, Leylini bir dəxi görə,
Sariban dəxi buraxmaz, düşüb əfsar əlinə.

Yapışar daməninə, bir dəxi əldən qoymaz,
Gər düşə xəstə Xəzaninin o dildar əlinə.

* * *

Yoxdur aləmdə o şuxi-məhi-tabanə əvəz,
Səri-kuyidir onun rövzeyi-rizvana əvəz.

Can əgər çıxsa olur ki, ola mövcud əvəzi,
Leyk mövcud deyil dəhrdə canana əvəz.

Çox pərişandı könül zülfi-pərişanın üçün,
Bu pərişanlığı qoydum o pərişana əvəz.

İstəməm müshəfi-rüxsarına qarşı ayət,
Tutaram ol xəti-rüxsarını Qurana əvəz.

Dilü dildarımı gər dust tutam mən etmin,
Yoxdur aləmdə, nedim, bu evi virana əvəz.

Bu Xəzani qəmi-hicran ilə yanmış, ya rəb,
Tut bu yanmağı sən ol atəşi-neyrana əvəz.

* * *

Dedim mərqum edəm ol yarə kağız,
Mənə bəlkə qıla bir çarə kağız.

Səvadi-çeşmim ilə namə yazdım,
Baxa ta ol gülruxsarə kağız.

Yazıb bu kağızı, qıldım həsədlər
Ki, məndən tez yetər didarə kağız.

Dilərsən rəf ola bu intizarım,
Yazıb tərsim qıl həmvarə kağız.

Əcayib ncməti-biintəhadır,
Gələ dildardan dildarə kağız.

Nə müddətdir o dilbərdən yetişməz
Xəzani, xəstəvü bimarə kağız.

## MƏHƏMMƏD XƏLİFƏ ACİZ

*Məhəmməd Xəlifə Aciz XIX əsrin birinci yarısında yaşayıb-yaratmış sənətkarlardandır. O, Sərabda anadan olmuşdur. Təvəllüd və ölüm tarixi məlum deyildir, 72 yaşında vəfat etdiyi güman edilir. Şeirlərindən nümunələr "Cənubi Azərbaycan ədəbiyyatı antologiyası "nın I cildindən (1981) götürülmüşdür.*

### QƏZƏLLƏR

Al şanə dəstinə, sənəma, darə tellərin,
Könlüm kimi dağıt yenə rüxsarə tellərin.

Tutmuş günün qabağını zülfün, kənarə çək,
Etmiş əcəb qəra günümü qarə tellərin.

Bimari-eşq, xöstəvü rəncurəm, ey təbib,
Etməz nədən bu dərdimə bir çarə tellərin?!

Axırda aşikar olub, sirri-eşqə bax,
Yusif kimi salıb məni bazarə tellərin.

Bülbül kimi nəvayə gəlib, eylərəm xüruş,
Etmiş əsir hər gülü bir xarə tellərin.

Ey mahi-gülüzarü ey şuxi-dilrüba!
Qoymuş məni bu dəhrdə avarə tellərin.

Od tutdu pərlərim bu zaman, nıahi-gülüzar,
Salmış məni nə növ ilə, gör, narə tellərin.

Əbruyi-tiğ, qəmzeyi-tir, afəti-cahan,
Əzbəski vurdu sinəmə, ol yarə tellərin.

Bilməm səbəb nədir genə, ey yari-mehriban,
Mənsur tək çəkib məni ol darə tellərin.

Bilməm yovuncu eyləyək axır, ey sənəm,
Sənan kimi bu Acizi, zünnarə tellərin.

* * *

Mənzur budur: Ol dili-divanə dağılsın,
Bir şanə çək ol zülfi-pərişanə, dağılsın.

Könlüm quşu seyd olmağa gər olsa muradı,
Tök tellərini, hər biri bir yanə dağılsın.

Bir daneyi-xali-siyəhin sevmədin axır,
Zahid, görüm ol səbheyi-səddanə dağılsın.

Göstər qaşını, aç ləbi-meygunə dəmadəm,
İstərsən əgər məscidü meyxanə dağılsın.

İçdikcə mənim bağrımı qan etdi bu badə,
Bir dövr elə, saqi ki bu peymanə dağılsın.

Hər cövr ki çəkdin şikəni-zülfdən,
Aciz, Sən yaz onu, qoy səfheyi-İranə dağılsın.

* * *

Çəkəndə zülfünü, ətrafə, mahitab çıxar,
Qürub göydən edər, yerdən afitab çıxar.

Bu bəzmə qoysa qədəm afitabi-aləmtab,
Edər bu bəzmi münəvvər ki, biniqab çıxar.

Gələndə naz ilən ol sərvnazü bəndənəvaz,
Bir əldə zülf bir əldə şərabi-nab çıxar.

Əgər cəmalını bir ləhzə görməsə, dindən –
Təmami-zahidü abidlə, şeyxü şab çıxar.

Tökübdü zülfünü çin-çin o mah rüxsarə,
Misali-türreyi-şəbrəng bir üqab çıxar.

O məst gözlərinə, dilbəra, fəda Aciz –
Ki, məst xaneyi-xəmmardan xərab çıxar.

**GƏRAYLILAR**

Ey zalım, navəki-qəmzən,
Vurubdur yarə könlümə,
Gözlərimdən axar qanı,
Gəl eylə çarə könlümə.

Vurub qəmzən zəxmi-karı
Qoyma olsun qanı carı,
Gətir zülfi-miskbarı
Basgilə yarə könlümə.

Sallanıb naz ilən gedən,
Mənə rəhmin gəlməz nədən?
Səndən qeyrı çarə edən,
Yoxdu biçarə könlümə.

Gəl insafa səni tarı,
İncitmə Acizi-zarı,
Göstər xurşidi-rüxsarı,
Bu günüqarə könlümə.

* * *

Xalxal Siyəhkəmərdə bir –
Siyəhtelli pəri gördüm.
O gözlərə Ayı, Günü,
Zöhrəni, Müştəri gördüm.

* * *

Bir məlləkdir enib yerə,
Bənzəməz hərgiz bəşərə,
Pəri göründü nəzərə,
O mələkmənzəri gördüm.

Nə Şamda, var, nə Hələbdə,
Nə əcəmdə, nə ərəbdə.
Müxtəsər zülməti-şəbdə,
Xurşidi-ənvəri gördüm.

Demə, o sərvi-qaməti,
Qiyamında qiyaməti,
Qiyamətdir əlaməti,
Şurişi-məhşəri gördüm.

Ox kirpiyin, zülfün pürçin,
Acizin qanına rəngin,
Həmi bir alıcı laçin,
Həmi kəbki-dəri gördüm.

* * *

Haçanacan aman çəkim,
Bu zalım hicran əlindən.
Bu ev yıxan sitəmkarın
Aman, əlaman əlindən.

Qəm evində xəstə qaldım,
Bərgi-xəzantək saraldım,
Könlümü zülfündən aldım,
Qurtardım ilan əlindən.

Sevdim bir zülfi-kəməndi,
Olubdur könlümün bəndi,
Qocaldım, ömrüm tükəndi,
Bir tazə cavan əlindən.

Sevdim bir yari-bivəfa,
Sitəmi Acizə rəva,
Yemişəm yüz tiri-cəfa,
Bu qaşı kaman əlindən.

## ƏBÜLQASİM NƏBATİ

*Seyid Əbülqasim Nabati XIX əsr Azərbaycan ədəbiyyatının görkəmli simalarındandır. Onun "Nəbati", "Xançobani", "Məcnun" və başqa təxəllüslərlə yazdığı əsərlər hələ öz sağlığında əldən-ələ gəzir, eldən-elə yayılırdı. Şairin bir çox şeirləri Azərbaycan sərhədlərini aşıb, İran, Türkiyə, Orta Asiya ölkələrinə də gedib çatmışdır.*

*Nəbatinin doğum və ölüm illəri dəqiq müəyyənləşdirilməmişdir. Tədqiqatçılardan F.Köçərli, B.Behcət və F. Qasımzadə onun 1812-ci ildə, M.Tərbiyət XVIII əsrin sonlarında, Ə.Hüseyni isə XIX əsrin ilk illərində doğulduğunu qeyd edirlər. Məlum həqiqət budur ki, Nəbati Cənubi Azərbaycanın Üştibin kəndində anadan olmuş, bir müddət Əhər şəhərində, sonra Muğanda yaşamışdır, Qoca yaşlarında doğma yurdu Üştibinə gayıtmış və orada vəfat etmişdir.*

*Həm doğma Azərbaycan türkcəsində, həm də fars dilində yazıb -yaradan Nəbatinin əsərləri pərakəndə olsa da, hələ öz sağlığında divan şəklində hazırlanınış, şairin ölümündən sonra bu divan Təbrizdə daşbasma üsulu ilə çap olunmuşdur. 1935-ci ildən başlayaraq Nəbati irsi "Seçilmiş əsərlər" adı ilə Bakıda bir neçə dəfə çap edilmişdir. XX əsrin 60-cı illərində Nəbatinin "Əsərləri" müxtəlif əlyazma nüsxələri və çap kitabları əsasında tərtib olunaraq nəşr edilmişdir (1968). Həmin kitab digər nəşrlərlə müqayisədə daha mükəmməl olduğu üçün hazırkı antologiyada verilən nümunələr və şair haqqında məlumat oradan götürülmüşdür.*

### QƏZƏLLƏR

Səhər meyxanə ətrafın gəzirdim məstü bipərva
Ki, görüm onda nagəh bir əcayib surəti-ziba.

Miisəlsəl zülf çiynində, mürəssə tövq boynunda,
Firəngi ətləs əynində, başında məcəri-həmra.

Mələkmənzər, pəri-peykər, süxəngüstər, vəfapərvər,
Büti-məhru, güli-xəşbu, sözü şəkkər, gözü şəhla.

Səmənrüxsar, müşkinmu, şəlayin qaməti-dilcu,
Dağıldı əql başımdan, alışdı atəşi-sevda.

Pərişan oldu əhvalım, tükəndi səbrü aramım,
Giriban çak edib durdum yerimdən valehü şeyda.

Məni görcək bu halətdə o sərvi-baği-dilbəndi,
Gəlib yanımda əyləşdi əlində sağəri-mina.

Kərəm qıldı mənə bir cam, alıb mərdanə nuş etdim,
Durub öpdüm ayağından, dedim: ey saniyi-Leyla!

Əgər görmək dilərsən surəti-Məcnuni-şeydanı,
Uzaq gəzmə, tamaşa qıl, budur ol aşiqi-rüsva!

Şikəstəxatirü məhzun, sözü aşüftə, digərgun,
Tutub nəqşi-rəhi-Məcnun, gəzər vəhşi kimi səhra.

Nəbati, həmd qıl Allahə, min şükrü səna eylə
Ki, Məcnunun məqamatın sənə ruzi edib mövla.

* * *

Gətir, saqi, meyi-gülgun, bu bəzmi bir bahar eylə!
O cami-ləlfam ilə bu xamı bir xumar eylə!

İrəm bağın tamaşa eylədim deyri-müğan içrə,
O darül-eyşi sən, yarəb, həmişə laləzar eylə!

Vərə vaxtı deyil, zahid, bu təsbihi qoy əldən bir.
Gətir səccadəni, ver meyfüruşə bir qərar eylə!

Ləbi-meyguni-saqi, sağər ilə həlqeyi-rindan,
Bu cəmin içrə, yarəb, sən məni bir meygüsar eylə.

Qüruri-ruzə xüşk etmiş səni, zahid, nə qafilsən,
Bu təzviri riyadən keç, xudadan bircə ar eylə.

Bihəmdillah, gözün var, kor deyilsən, cənnət istərsən,
Qədəm qoy bir xərabətə səhərdən, bir nahar eylə.

Nəbati, aşiqəm mən rindlər bəzmindəki halə,
Bəli, billah, bu qövmün itlərinə can nisar eylə.

* * *

Sərməst yıxıldım genə meyxanələr içrə,
Oldum genə rüsva neçə fərzanələr içrə.

Yaxdım oda səccadəvü dəstarü ridanı,
Bir ad elədim mən dəxi pərvanələr içrə.

Ey şuxi-pəritələtü, ey sərvi-güləndam,
Gəzmə, səni tari, belə biganələr içrə.

Ol nərgisi-məstin nə füsungərdi, xudaya,
Saldı məni Məcnun kimi divanələr içrə.

Gəl ver mənə bir cam də, ey saqiyi-gülfam,
Ta məst yazım bu sözü əfsanələr içrə.

Billah, bu büti-lalərüxün yoxdu naziri,
Baxdım neçə min surətə bütxanələr içrə.

Ol gənci-xəfidən bir əsər bilmədim axir
Canım çürüdü heç yerə viranələr içrə.

Ey kövsər üçün ah çəkən zahidi-əbləh,
Meyxanədə gəl gör onu peymanələr içrə.

Qəvvas kimi qutə vurub bəhrə Nəbati,
Ol gövhəri istər tapa dürdanələr içrə.

* * *

Eşq camından içən kimsə huşyar olmaz,
Nə bu dünyadə, qiyamətdə də bidar olmaz.

Qorxu bilməz, eləməz şahü gədadən pərva,
Məsti-məstanə gəzər, kağəzü tumar olmaz.

Buteyi-hicrdə bülbül kimi əfğanə gələr,
Qeysi-biçarə kimi vəslə xəridar olmaz.

Tərk edər ləzzəti-dünyanı, keçər canından,
Sikkəni dağ qılar, talibi-dinar olmaz.

Göstərər mehrü vəfa yarinə, gördükcə cəfa,
Zilləti fəxr bilər, zərrəcə bizar olmaz.

Alışı şəm kimi, odlaşı pərvanə kimi,
Can verər yarə Nəbati kimi, biar olmaz.

## RÜBAİLƏR

Ey badi-səba, güzar qıl Təbrizə,
Aləmdə qalıb ümidimiz bir sizə,
Ol sərvqədin kuyinə düşsə güzərin,
Bu naməni ver o zülfi ənbərrizə.

* * *

Saqi, gətir ol cami-zərəfşanı görək,
Sal gərdişə bir o rahi-reyhanı görək,
İsgəndərə söylə getməsin zülmatə,
Göstər ona bir o abi-heyvanı görək.

* * *

Divanə könül, bəsdi fəğan eyləmə çox,
Razi-dilimi xəlqə əyatı eyləmə çox.
Xamuş otur, feyzi-əzəl tap, özünü
Əbnayi-zəmanə həmzəban eyləmə çox.

* * *

Saqi, genə əyyami-gülüstan oldu,
Gül təxtə çıxıb, çəməndə sultan oldu.
Hər rindü gəda deyir mənəm şahi-cahan,
Hər qübbərə bir bülbüli-xoşxan oldu.

* * *

Saqi, mənə bir cam o meydən ver, ver,
Bir türfə xəbər o bəzmi-Keydən ver, ver,
Mütrüb, dur əyağə, rəqs qıl məstanə,
Dadi-dilimi nəvayi-neydən ver, ver.

**QOŞMALAR**

Susuyubdur genə kimin qanına,
Xumar-xumar baxar hara gözlərin?
Nola bir də dolanaydım başına,
Qurbanı olaydım qara gözlərin!

Müqəvvəs qaşların etginən kaman,
Çəkginən müjgandan tiri-cansitan,
Bu xəstə canımı qılginən nişan,
Qoy etsin köksümü para gözlərin.

Sənubər qamətin, ey sərv rəftar,
Şümşadü ərəri etdi şərmsar,
Nə yalqız etmisən məni xarü zar,
Çoxları gətirib zara gözlərin.

Arizin dövründə zülfi-müşginab,
Qoymaz şəfəq salsın türsi-afitab,
Hökm qıl götürsün sayəsin səhab,
Bu dərdə eyləsin çara gözlərin.

Üzün şəşəəsi ey şəmi-Çəkil,
Xurşidi-xavəri etdi münfəil,
Belə ki, eşq odu oldu müştəil,
Çəkdirə həqq məni dara gözlərin.

Xədəngi-xunrizin, ey şirin mənzər,
Xosrovu təxtindən etdi dərbədər,
Həlqə edib əldə zülfi-müənbər,
Nə sehr oxur genə mara gözlərin?

Təzə gültək açılıbsan səhərdən,
Müzəyyən olusan ləlü gühərdən,
Yaxşı saldın Nəbatini nəzərdən,
Əcəb mail olmuş xara gözlərin!

* * *

Səba, məndən söylə o gülüzara,
Bülbül gülüstanə gəlsin, gəlməsin?
Bu hicran düşgünü, illər xəstəsi
Qapına dərmanə gəlsin, gəlməsin?

Mən qurbanı olum ənbər tellərin,
Qönçə dodaqların, püstə dillərin,
O lalə rüxsarın, mişkin xalların
Oduna pərvanə gəlsin, gəlməsin?

Gözüm çox həsrətdir xumar gözünə,
Günəş camalına, şəkər sözünə,
Utanıram, necə deyim üzünə,
Dərdin xəstə canə gəlsin, gəlməsin?

Dolaşdır boynuma şümşad qolunu,
Qucaqlayıb qucum incə belini,
Ləli-ləbin əmim, sorum dilini,
İstər ölü canə gəlsin, gəlməsin?

Nəbati istəməz sənsiz dünyanı,
İzzəti, hörməti, şövkəti, şanı,
Bir zada qalmayıb daha gümanı,
Bu baş o meydanə gəlsin, gəlməsin?

## TƏCNİSLƏR

Başına döndüyüm, bu necə haldır,
Dinməmiş deyirsən: ay nədir, nədir?
Başım çıxmaz mənim sənin dilindən,
Buyurginən görüm ay nədir, nədir?

Qurban olum üzündəki həyayə,
Qəmzə oxun mindirginən hey yayə,
Nə baxırsan maral kimi hey ayə?
Cəmalın yanında ay nədir, nədir?

Gözüm qan kasası, ürəyim şişə,
Məni kabab kimi çəkmisən şişə,
Rəqibi görüm ki, dam kimi şişə!
İllər-illər çəkə, ay nədir, nədir

Nə baxırsan o sultanə, bu xanə?
Çox adamlar gəldi getdi bu xanə.
Genə bu gün işıqlanıb bu xanə,
Bilmirəm görünən ay nədir, nədir?

Həmd olsun Allaha, getdi a çillə!
Nəbati, az qaldı güllər açılə,
Bu müşgülüm, yarəb, kimdən açılə?
Yar dəstində tutan iynədir nədir?

* * *

O tərlan baxışın qurbanı canım,
Boy çəkib gözlərin gözlər, nə gözlər!
Amaci-sinəmi novki-müjganın
Qoyub nişanəyə gözlər, nə gözlər!

Nə qələtdir düşüb üz arasına,
Onu bilmək olmaz üz, arasına,
Əgər qəvvas isən, üz arasına,
Bir gör axır ondan gözlər, nə gözlər!

Təcəllasan, buyur Sina dağına,
Əğər görsən məni, Sinada, qına,
Qoyma rəqib baxsın sinə dağına,
Yamandır gözləri, gözlər, nə gözlər!

Yeni aydı, amma nə sövdası var,
Nöqsanına bax, gör nə sovdası var,

Heç bilmənəm başda nə sevdası var,
Ağlar-ağlar, deyər gözlər, nə gözlər!

Nəbati kül oldu, yandı Sinada,
Bu alovdan bir od düşsün sana da,
Deyəmməzəm, necə deyim sına da,
De görüm görmüsən, gözlər, nə gözlər!

Əhvəl olma, bir nöqtədir hər ucu,
Bir dövrdə dolanırlar hər üçü,
Nəbatinin sultanıdır hər üçü,
Bu idi mən deyən gözlər, nə gözlər!

**GƏRAYLILAR**

Genə fələklər ünüşdü
Qurban-qurban sədasından.
Məəttəl qalmışam, billah,
Aşiqlərin ədasından.

Mövcə gəldi gözüm yaşı,
Alışdı bağrımın başı.
Səs götürüb dağı-daşı,
Bu Məcnunun nəvasından.

Getdi gözümün qarası,
Getməz sərimdən havası,
Elə bil, tərlan balası
Cüda düşüb yüvasından.

Kəsildi könlümün zarı,
Tükəndi səbrü qərarı,
Bir yol öldür qurtar bari,
Bu hicranın bəlasından.

Gəldi Nəbati divanə,
Kənar durun, qaçın yanə,
Baxmaz o xanü sultanə
Həzər qılın xətasından.

* * *

Genə gəldi bahar fəsli
Bülbül gəldi dadə, dadə,
Əhməri güllər açıldı,
Saqi, gətir badə, badə!

Genə səbz oldu çəmənlər,
Güldən bəzəndi gülşənlər,
Cıxmış seyrə gülbədənlər
Hamı üzü sadə, sadə.

Vəh vəh güldür bu ya lalə,
Gül üzünə qonub jalə,
Saqi, dur, ver bir piyalə
Dəli Fərhadə, Fərhadə.

Yar yolunda verdim başı,
Yastıq etdim qara daşı,
Döndü, billah, gözüm yaşı
Şətti-Bağdadə, Bağdadə.

Dəli könül, qəm zamanı,
Çox etmə ahü fəğanı,
Çağır Şahi-lafətanı,
Yetsin fəryadə, fəryadə.

Saqi, dur, ver bircə cağər,
Dindən döndüm, oldum kafər,
Tapammadım, qaldı gövhər,
Qəri-dəryadə, dəryadə.

Nəbati, dur hər səhərgah,
Oxu həmdü qülhüvvəllah,
Qalmadı əlhəmdülillah,
Arzun dünyadə, dünyadə.

## MƏHƏMMƏD ƏMİN DİLSUZ

*XIX əsrin məşhur şairlərindən olan Məhəmməd Əmin Dilsuzun həyat yolu, doğum və ölüm tarixi haqqında ətraflı məlumat yoxdur. F.Köçərlinin yazdığına görə 1834-cü ildə "hali-həyatda imiş və özü dəxi müsinn halında vəfat edibdir".*

*"Ustad" ləqəbi ilə tanınan Dilsuz əsərlərini Azərbaycan və fars dillərində yazmışdır. Onun divanı Təbrizdə dəfələrlə çap olunmuşdur. Şeirləri qəzəl, qəsidə, müxəmməs;, rübai, saqinamə, növhə və sinəzənlərdən ibarətdir. Buradakı nümunələr F.Köçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981) və "Cənubi Azərbaycan ədabiyyatı antologiyası" (I cild, 1981) kitablarından götürülmüşdür.*

### QƏZƏLLƏR

Sənə mənzil cahanda, ey Fəlatun, Dilməqan olmuş,
Mənim darün-nişat içrə işim ahü fəğan olmuş.

Misali-əndəlibəm düşmüşəm mən ayrı gülşəndən,
Gül üzlüm, firqətindən bu əlif qəddim kəman olmuş,

Çıxan gündən yəqin et xitteyi-Təbrizdən guya
Dağılmış zülmdən bu xaneyi-eyşim, viran olmuş.

Gecəm il, gündüzüm qarə, kəsim yox, həmdəmim nalə -
Ki, bir badi-səba guya mənimlə həmzəban olmuş.

Xəyal etmə deyil Təbrizdə sən gördüyün Dilsuz,
Çəkib əzbəs qəmü möhnət, bu yerdə nimcan olmuş.

* * *

Nola, bir əl yetə ol zülfi-mütərra əlinə,
Bəlkə, sərriştə düşə aşiqi-rüsva əlinə.

Qeys tək kuhü biyabanidə sərgərdanəm,
Yoxdu bir mərd, əlimi ta verə Leyla əlinə.

Çox səadətdir, əzizim, ola bir fəsli-bahar,
Yetişə daməni-gül bülbüli-şeyda əlinə.

Dinü imanım əlimdən gedib, ol Sənan tək,
Düşmüşəm şəhri-müsəlmanidə tərsa əlinə.

Bişəkü şübhə olar hər iki dünyada əziz,
Verə gər Yusifi hər kimsə Züleyxa əlinə.

Əl-ayağım titrər, görcək o şuxun gül üzün,
Necə xummar alar sağəri-səhba əlinə.

Verməz əlbəttə könül, arif olan, aləm ara,
Hər pəriçöhrə və hər şuxi-dilara əlinə.

Niyə yüz min dili-divanəni zəncirə vurub,
Tapşırıb tar o iki zülfi-çəlipa əlinə?

Künci-meyxanəni məskən elə hər şamü səher,
Vermə, Dilsuz, yaxanı zahidü molla əlinə.

* * *

Ey məh, nolu, bir bax mənə san, səni-tarı,
Salma nəzərindən məni-zan, səni tarı.

Əğyar ilə yar olmagilən, durma, oturma,
İncitmə məni-zan, fikarı, səni-tarı,

Gül arizinin aşiqiyəm, ey şəhi-xuban.
Həmdəm özünə eyləmə xarı, səni-tarı,

Gəl, saqi əlindən içəlim badeyi-gülnar,
Bihudə keçirtmə bu baharı, səni-tarı.

Bir fəslidi bu, hər kim içə badeyi-gülrəng,
Dildən götürər, zəngü qubarı, səni-tarı.

Pərvanəsifət başına har ləhzə dolanım,
Tərk etməgilən məskəni barı, səni-tarı.

Hər bisərü bipayilə, gəl, eyləmə ülfət,
Pamal eləmə qeyrətü an, səni-tarı.

Naz ilə keçib, bəndəyə xəsmanə baxanda,
Bir kəlmə danışdır məni-yarı, səni-tarı.

Gəl, görmə rəva aşiqi-Dilsuza ki, hərdəm,
Mənsursifət çəkdirə darı, səni-tarı.

* * *

Qoydu məni bu dəhrdə avarə gözlərin,
Saldı məni bu qəmlərə ol qarə gözlərin.

Ey gül, işim olub gecə-gündüz fəqan mənim,
Bülbülsifət, gətirdi məni zarə gözlərin.

Ey leylivəş, harayıma yet, olmuşam cünun,
Məcnunsifət, salıb məni kuhsarə gözlərin.

Eşqin məni bu dəhrdə bimar eyləyib,
Əmr et ki, eyləsin mənə bir çarə gözlərin.

Bir vəhşi baxış ilə alıb ixtiyarımı,
Bəxtim tək eyləyib günümü qarə gözlərin.

Şəmi-rüxün fədası olum, rəhm qıl mənə,
Pərvanə tək salıb məni odlarə gözlərin.

Kami-dilim hər ikı cahanda rəva olur,
Bir ləhzə eyləsə mənə nəzzarə gözlərin.

Yusif kimi bu dəhrdə, ey şuxi-dilrüba,
Çəkdi məni nə şövqilə bazara gözlərin.

Hərdəm xədəngi-qəmzə ilə qıldı çak-çak,
Zülm ilə etdi sinəmi səd parə gözlərin.

Bir baxmaq ilə aldı əlimdən qərarımı,
Saldı məni bu bəstəri-bimarə gözlərin.

Səbrim alıb, tükəndi qərarım, haray, hay!
Dilsuzu gətdi dəhrdə zinharə gözlərin.

* * *

Olmuşam mən yenə bir şuxi-güləndamə düçar,
Püxtəlikdən olubam bir sənəmi-xamə düçar.

Bir gözəl arizinin xal ilə zülfünü sevib,
Mürği-dil yaxşı olub, danə ilə damə düçar.

Qorxuru yarım ola mən kimi rüsvayi-cahan,
Vəhci var olmuru bu aşiqi-bədnamə düçar...

Gorüm ol şux özü tək bir gözələ tuş olub.
Ola ta, mən kimi; bu möhnəti-əyyamə düçar.

Saqiya, bəhri gətir meykədədən bu bəzmə,
Səni tanrı, məni etmə bu tünük camə düçar.

Məni qılsa məni bu qaşı kamandarı hər kəs,
Olsun aləmdə o kəsgin dəmi-səmsamə düçar.

Hiç aşiq görüm aləmdə, mənim tək, yarəb,
Olmasin təneyi-biganəvü əqvamə düçar!

Şükrilillah, bu pərizadəyə aşiq olalı,
Şükrdən qurtulub oldum, əcəbistanə düçar.

Mən bu il başə düşüb, anlamışam eşq yolun,
Kaş olaydım keçən il mən bu dilaramə düçar.

Yazma, Dilsuz, dəxi dəftəri-eşqin hərfin,
Olmasm atəşi-dərdü qəmə bu xamə düçar.

## QƏSİDƏ

Bilmirəm, ya rəb, yenə qəlbimdə bu qovğa nədir,
Axiri-ömrümdə bu başımdakı sövda nədir,

Gəh çəkər deyrə, gəhi bütxanə, gah məscidə,
Bilmirəm məscid nədir, deyrü kəlisa həm nədir,

Hər nə gəzdim məscidü meyxanəvü bütxanədə,
Bilmədim kimdir müsəlman, kafərü tərsa nədir.

Aqiləm ya cahiləm ya möminəm ya kafirəm,
Bilmədim cahil nədir dünyada ya dana nədir.

Zahidü müftiyü şeyx şəhnəvü ya zöhdü fisq,
Nurü zülmət, xeyrü şər ya ziştü ya ziba nədir.

Eşq Məcnun eyləyib saldı məni səhralərə,
Bilmədim Məcnun nədir, Leyla nədir, səhra nədir.

Güldə nə hüsnü təravət, ya nədir bülbüldə şur,
Gül nədir, gülşən nədir, ya bülbüli-şeyda nədir.

Neçə müddətdir təkəlüm eylərəm mən nikü bəd,
Bilmədim bu dil nədir, ya dildəki guya nədir.

Ey məni xəlq eyləyən xaliq, özün imdad qıl,
Qalmışam valeh ki, bu dünya nədir, üqba nədir.

Gündə yüz yol kafir ollam, yüz yol iman istərəm,
Bilmədim Firon kimdir, həzrəti-Musa nədir.

Turi-Sinadə münacat eylərəm xəllaq ilə,
Gəh əsanı əjdəha etmək yədi-beyza nədir.

Gah nəfsə əql olur qalib deyir: key nəfsi-şum,
Munca gəl sərkeşlik etmə, xahişi-bica nədir.

Bircə insaf eylə sən də zahidi-bidin tək,
Bir belə hər gündə nahəq verdiyin fitva nədir.

Bir gecə bu fikr ilə yatdım dedim: Ya zülcəlal,
Sən mənə bildir görüm surət nədir, məna nədir.

Hatifi-qeyb ol zaman verdi cavab; - Ey bixəbər,
Bir belə bihudə fikrü-zahirü ixfa nədir.

Bilməsən kimdir bu övzayə səbəb ruzi-əzəl,
Bəsi-icadi-aləm, Adəmü Həvva nədir.

Sirri-həq damadi-peyğəmbər əmirül-möminin,
Görmüsən sən ol Əliyyi-aliyü əla nədir.

Dilsuza, qıl müxtəsər bu qisseyi-dilsuzi sən,
Əcz ilə ərz et xudayə bu qəmi-üzma nədir.

Lənət eylə sən Yəzidə həşr olunca dəmbədəm,
Zülmi-bihədd etdi zalim, bilmədi fərda nədir.

## MİRZƏ MƏHƏMMƏD TAĞI QUMRİ

*XIX əsr Azərbaycan poeziyasının ən istedadlı nümayəndələrindən olan Məhəmməd Tağı İbrahim oğlu Qumri 1819-cu ildə Dərbənd şəhərində doğulmuşdur. O, məktəb təhsili almış, ana dilindən başqa fars va ərəb dillərini öyrənmişdir. Gənc yaşlarından ticarətlə məşğul olmuş və "mötəbər tüccarlardan biri" (F.Köçərli) kimi tanınmışdır.*

*"Cavanlıq əyyamını bir müddət eyşü işrətdə keçirib, ömrünü gözəllərin xəttü xulına və əbruyi-hilalına və naz-işvəsinə sərf edən" Qumri təxminən 30 yaşında Kərbəla ziyarətinə gedərək, özünü "İmam Hüseynə dəxil salır və ona növhəgər olub", yaradıclığını Kərbəla şəhidlərinin vəsfinə həsr edir. Onun "Kənzül-məsaib" əsəri, mərsiyə və növhələri XIX əsr Azərbaycan şerinin ən gözəl nümunələrindəndir.*

*Lakin şairin bədii iri XX əsrdə uzun müddət geniş oxucu kutləsinə naməlum qalmışdır. Bu kitabda verilən örnəklər şairin XIX əsrdə çap olunmuş "Divan "ından və Firidun bəy Koçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Bu sevdadən keç, ey qafil, dəxi ömri-cəvan keçdi.
Şəbab əyyami getdi, zövqi-sövdayi-cahan keçdi.

Qivami-ünsüriyyətdən qivayi-xəmsə süst oldu,
Yəqin abai-ülvi iltifatından əyan keçdi.

Yavuqlaşdı dəmi-rehlət, təravətdən düşüb qamət,
Olub əfsürdə bərgi-tari çün sərvi-rəvan keçdi.

Ağardı muyi-sər, qaldı ziyadən çeşmi-nurani,
Məqali-söhbəti-əhli-ləbi-şəkkərfişan keçdi.

Münadi qeybdən eylər nida, ey bixəbər, yatmış,
Oyan bir xabi-qəflətdən, yatıbsan çox, zaman keçdi.

Cərəs fəryad edər, qom-qom vurarlar kus peydərpey,
Qətari-köç yükləndi sərasər, karivan keçdi.

Sərayi-ariyətdə hər gələn beş gün qalır mehman,
Rəfiqü aşina getdi, təmamən həmzəban keçdi.

Rəcul səyyadi müstəhzər durubdur can sorağında,
O vaxt agah olursan kim, çıxıb əldən inan keçdi.

Dayanmaz masələf gəl ma-sə-yəti üstə fikr eylə,
Görürsən bir zaman əldən behişti-cavidan keçdi.

Gedər dünyayi-fani, axirət əmrində qıl çarə,
Keçənlər ya qəminü ya həzin, ya şadiman keçdi.

Gəlir bir gün deyər qədrin bilənlər heyf dünyadan,
Qoyub nəzmi-dürəfşan Qumriyi-şirinzəban keçdi.

* * *

Məgər divanədir üşşaq, eşqi-yardən, keçsin,
Həvayi-vəslü sevdayi-ruxi-dildardən keçsin?!

Rəvadır təşneyi-cami-məhəbbət meydən əl çəksin,
Qoyub zövqü səfani, badeyi-gülnardan keçsin?!

Ol anda fəsli-gül tər qönçənin arayiş əyyami,
Qoyarmı eşq şeyda bülbülü gülzardən keçsin?!

Keçər nazü nəimi-cavidandan aşiqi-sadiq
Və lakin müşkül işdir ləzzəti-didardən keçsin.

Olur keçmək Bədəxşanləlinin alafü əlfindən,
Çətindir aşiqə ləli-ləbi-göftardən keçsin.

Mənim mehrabü qibləm taği-əbruyi-bütan olmuş,
Məazəllah ki, zabid qibleyi-əxyardən keçsin.

Olub Qumridən ötrü rişteyi-can gisuyi-canan,
Məgər candan keçib ol türreyi-tərrardən keçsin?!

* * *

Ey dil, vəfası yoxdu dilara gözəllərin,
Cövrü cəfası çoxdu bu rəna gözəllərin.

Yüz nazü qəmzə ilə can almaqdır adəti,
Ahu baxışlı gözləri şəhla gözəllərin.

Hər tarı bir kəmənd kimi xəlqi bənd edər,
Dami-bəlayə zülfi mütərra gözəllərin.

Tavus tək bəzər özünü, xəlqi aldadar,
Çün fikrü zikri məkrdi qəta gözəllərin.

Bir dəfə güldürər səni, min dəfə ağladar,
Şənində gəlməyibdi təvəlla gözəllərin.

Çox imtahan elibdi kəma-keyf haqqına,
Arifdi çünki, Qumriyi-şeyda gözəllərin.

* * *

Çıxmaz başımdan eşq ilə sevdası dilbərin,
Könlümdə var həmişə təmmənnası dilbərin,

Nuş etmişəm şərabi-məhəbbət ələstdə,
Getməz ölüncə nəşeyi-səhbasi dilbərin.

Vaiz, məlamət etmə məni, həq mənimlədir,
Gəl bax, bu mən, bu sən, bu tamaşası dilbərin.

Cənnətdə hər nə vardı, sənin, qoy mənim ola
Bir kəlmə söhbəti-fərəhəfzası dilbərin.

Yox özgə məşqi vəsli-raxi-yardən səva,
Qumri olubdur aşiqi-şeydası dilbərin.

* * *

Cana, məhəbbət aləmi pürinqilab olur,
Əhli-məhəbbətin işi daim əzab olur.

Aramü taqəti kesilir əhli-nəşənin,
Bisəbrü bitəhəmmülü büxürdü xab olur.

Əncüm sayar sabaha kimi aşiqin gözü,
Hicranda hər gecə ona yövmül-hesab olur.

Bir tarmuy ilən dağıdır can binasını,
Ol kakilin ki riştəsi pürpiçü tab olur.

Əhli-günahə nari-cəhənnəm verir əzab,
Üşşaqı dilkəbab eləyən ləli-nab olur.

Ruxsari-mahtələtə baxmaq deyil rəva,
Çox baxsa aftabə əgər göz, xərab olur.

Abi-həyat tək görünür vəsli-məhvəşan,
Təhqiqi-nəfsül-əmrdə baxsan sərab olur.

Vermə könül o taifeyi-bədməzacə kim,
Kirdari nazü kəlmeyi-nitqi itab olur.

Bir nuş versə qəlbüvə yüz nişi-qəmə urar,
Cövrü cəfası aşiqinə bihesab olur.

Yoxdu kitabi-məzhəbi kafir gözəllərin,
Kafir bulardan əsldə əhli-kitab olur.

Aldanma hüsni-surətə, bu xudfüruşlər
Surətdə bülbül olsa da, batin qürab olur.

Zahirdə Müştəridir, əgər batinən Zühəl,
Axır Zühəldən aləm ara ictinab olur.

Bu növdür vəfalarının istiqaməti,
Guya ki, filməsəl, su üzündə hübab olur.

Qətən əqidəsində bu zalimlərin yəqin
Aşiqlərə cəfa eləmək çox savab olur.

Qumri, bu qövlə mötərif ol, qılma etiraz,
Bəsdir dəxi, nə qədər sualü cavab olur?!

**QƏSİDƏLƏR**

Məhbubumun mənimlə məhəbbət binası var,
Məlum olur şəfəqqətü mehrü vəfası var.

Məşuqdən gərək yetişə aşiqə bəla,
Aşiq deyil o kəs ki, bəladən hərası var.

Hər nə bəla gələ, edərəm canıma qəbul.
Əlbəttə, bu bəlalarımın müddəası var.

Canan yolunda hər yara bir güldü aşiqə
Gülzari-sinəsin nə əcaib səfası var.

Dörd min yarə dəyib, yenə azdı sinəmə,
Min dəfə can ilə çəkərəm, hər cəfası var.

Qıl bircə qətlga tamaşası, Cəbrail,
Bax gör Hüseyn təşnələbin nə əsası var?

Qurbangaha Xəlil aparıb bir fəda əgər,
Amma Hüseynə bax, necə yetmiş fədası var.

Abbasi-namidarımı qurban kəsibdilər,
Qolsuz düşüb, qana boyanmış libası var.

Toy tutmuşam bu dəştdə şahzadə Qasıma,
Yaxmış əlinə qan ilə əlvan hənası var.

Səd parə doğranıbdı Əli Əkbərim susuz,
Torpaqlar üstə nəşi düşüb, çox yarası var.

Mən qoy yanım bu gün qabağında kabab tək,
Sal Əkbər üstə sayə, oğulsuz anası var.

Bilməm səbəb nədir məni gözdən salıb anam,
Meydana Zeynəbim gələ bilməz, həyası var.

Durma, özüvü yetir Nəcəfə, söylə, ya Əli,
Oğlun Hüseyn ölür, sənə çox-çox duası var.

Gəl Kərbəlayə başını al bir diz üstünə,
Görsünlər əhli-Kufə Əli tək atası var.

Qəm gülşənində Qumriyi-gülzari-xəstənin,
Fəryadı-"va Hüseyn" ilə şuri-nəvası var.

* * *

Üşşaqə məşq, eşqdə tumari-Kərbəla,
Əhli-məzaqə gərmdi bazari-Kərbəla,

Çox zövq ilən səfası, əcəb xoş həvası var,
Güllər açıb bahardə gülzari-Kərbəla.

İbrətlə hər kim etsə tamaşa yəqin görər,
Qılmış əhatə aləmi ənvari-Kərbəla.

Hər gülsitanda nəğmeyi-bülbül səbahü şam,
Bica əbəs deyil çəkilir cari-Kərbəla.

Çeşmi-bəsirət açsa, nümayandı hər kəsə,
Amadədir o dəştdə asari-Kərbəla.

Nəhri-Fəratın üstə olub qolları qələm,
Əbbas, namidari-ələmdari-Kərbəla.

Naz ilə qətlgahda yatıb Əkbəri-cəvan,
Cismində zəxmi-xəncəri-xunxari-Kərbəla.

Damad otağı hicleyi əlvani-növ ərus,
Olmuş əcəb səfayi-çəmənzari-Kərbəla.

Hülqində Əsğərin yenə qanı kəsilməyib,
Çıxmış səmayə ahü şərərbari-Kərbəla.

Həsrətilə imdi də baxıri toy otağına,
Nakam ölən o Qasımi-sərdari-Kərbəla.

Yetmiş səhabə peykəri qan, cismi zəxmdar,
Gözəllə təşnələb rəhi-zəvvari-Kərbəla.

Başında qırx nəfər qolu bağı əsirlər
Ağlar başında möcüzi-gülnari-Kərbəla.

Qumri kimi fəğanə gəlib, ya Hüseyn deyər,
Guya o çöldə Abidi-bimari-Kərbəla.

**NÖVHƏ**

Salma gözdən bu zaman, ey şəhi-əbrar məni,
Qılma ənduhü qəmü dərdə giriftar məni,
Eyləyib çərxi-fələk didəsi xünbar məni,
Xəstəvü xuncigərü bikəsü biyar məni.

Nari-hicrana yanan sinəyi-suzanıma bax,
Əşki-xunin tökülən dideyi-giryanıma bax,
Möhnətü dərdü cələmdən üzülən canıma bax,
Qoyma firqətdə bu növ ilə giriftar məni.

Al sınıq könlümü, ey yari-şəhi-mülki-Hicaz,
Yandırır qəlbimi, vallahi bu suz ilə güdaz,
Nə anam var, nə bacım var eləyim onlara naz,
Oldürər axın bu möhnətü ahzar məni.

Rəməqim şiddət edəndə kim edər dərmanı,
Kim qılar nalə açib türreyi-müşkəfşanı,
Əgər ölsəm, məni-zarə kim oxur Quranı,
Bir kəsim yoxdu, dəxi etməgilən xar məni.

Yoxdu bir kimsə ola kim, məni-biyarə pənah,
Həmdəmim guşeyi-qəmxanədə var şöleyi-ah,
Haçanacan eyləyim yollara həsrətlə nigah,
Vətənimdə elədin həsrəti-didar məni.

Bir Əli Əkbər idi dərdimə dərmanü təbib,
Qaldı canım bu vilayatdə diləfgarü qərib,
Qorxuram həsrət öləm, olmaya didarı nəsib,
Salmaya yadına axır o vəfadar məni.

Rəhm qıl halıma, ey şiələrin mövlası,
Canımı aldı qəmü dərdü ələm sevdası,
Qoy yanımda Əli Əkbər ilən Abbası,
Vergilən can ilə onlara pərəsdar məni.

Gər qəbul eyləyəsən ərzimi, ey ərşü fəraş,
Razı olma yana əhvalıma bəm dağ ilə daş,
Gəl məni də aparıb qızlaruva qoy qaravaş,
Arayıb qoyma özündən belə biyar məni.

Canımı mərdüməki-dideyi-xunab edərəm,
Göz yaşımla o biyabanları sirab edərəm,
Razıyam, hər nə cəfa eyləsələr tab edərəm,
Çəksə zəncirə əgər Şümri-sitəmkar məni.

Bu fəna dəhrdə çün bikəsü biyarəm mən,
Dərdimə yoxdu dəva, aləmara xarəm mən,
Bir pərü balı sınan Qumriyi-gülzarəm mən,
Görməyin möhnətü hicranə sərdar məni.

## MOLLA HÜSEYN DƏXİL

*Molla Hüseyn Dəxil XIX əsrin ortalarında yaşayib yaradan ustad sənətkarlardandır. Marağa şəhərində dünyaya göz açmış Dəxilin tərcümeyihalı haqqında ətraflı məlumat yoxdur.*

*"Yazdığı asarın cümləsi İmam Hüseynin müsibətinə məxsus, Kərbəla faciəsinə dair əhvalatdır" (F.Köçərli), Din xadimlərinin və "mərsiyəxanların əlində ən mötəbər kitab " olan "Divan "ı Təbrizdə dəfələrlə nəşr olunmuş və geniş yayılmışdır, Burada verilən nümunələr "Dahilərin gözyaşı" və "Necə qan ağlamasın daş bu gün " kitablarından götürülmüşdür.*

### QƏZƏLLƏR

Xalın görəndə mürği-dilim biqərar olur,
Kim quş görəndə danəni, biixtiyar olur.

Gizlin görüb cəmaluvi mən gizlin ağlaram,
Zülfin açılsa, nalələrim aşikar olur.

Eşqində kim mən əsirə məlamət dilin açar,
Bu hüsnilə görəndə səni şərmsar olur.

Vəslin xəyalı Şümrə məni eyləyib əsir,
Bülbül güldən ötrü bəli, xarə zar olur.

Zənciri-kakilin məni xəlq içrə saxlayıb,
Gər olmaya bu riştə, yerim kuhsar olur.

Zülfündə könlümün quşunun aşiyanı var,
Vermə sabah yelinə, evim tarümar olur.

Qoy ağlayım ki, ta deməsinlə xəzan gəlir,
Bülbül səsi gələndə deyəllə, bəhar olur.

Mən bir sənə əsirəm, əmoğlu, yoxumdu bak,
Qoyma bu adı özgəsi qoysun ki, xar olur.

Mümkün deyildi Şümr məni eyləsin əsir,
Ahu nə vəqt rubəh əlində şikar olur?

Amma tutanda ovçu iki ahunun birin,
Labüd kəməndinə o biri tez düçar olur.

Xamə yazanda qisseyi-ləbtəşnə aşiqi
Ab ilə çün dolar gözü-söz abdar olur.

Üşşaq sərgüzəştəsini çün yazır Dəxil,
Başdan aşar sirişki, çü gövhər nisar olur.

* * *

Ey şəmi-bəzmi-matəmə pərvanə, ya Hüseyn!
Ey od salan müsibəti hər canə, ya Hüseyn!

Abbas xatirinə o qanlı cəmaluvi,
Ver bir nişan bu qəlbi-pərişanə, ya Hüseyn!

Ta bir yerə yığım bu pərişan xəyalımı,
Bais olum bir də çün əfğanə, ya Hüseyn!

Bişək salır təvəccöhə insani-kamilin,
Cismi-cəmadi surəti-insanə, ya Hüseyn.

İnsafdır üzümə gözüm yaşı axmaya,
Amma sənin qanın axa hər yana, ya Hüseyn?!

Hansı imam şiəsin istər sənin kimi,
Razı olub bu zülmi-nümayənə, ya Hüseyn?

Əkbər kimi cəvan oğula geydirər kəfən,
Zülfünə öz əliylə vurar şanə, ya Hüseyn.

Min üzr ilə anası əlindən alır onu,
Yollar başı kəsilməyə meydanə, ya Hüseyn.

Hansı imam xeymələrin odlayıbdılar,
Övladını töküblə biyabanə, ya Hüseyn.

Övrət, uşaq, gəlin, qız əyalı ayağ yalın,
Qaçdılar qorxudan hərə bir yanə, ya Hüseyn.

Bir iltifat qıl bu zəlilə, Dəxilinəm,
Misgin gəlib bu xaki-giranmanə, ya Hüseyn?

* * *

Çün gördülər bu çöldə verib üz bəla mənə,
Biganə oldular bər kim ola aşina mənə.

Dünya məhəbbətiylə gələnlər dağıldılar,
Rəhm etməyib bu taifeyi-bihəya mənə.

Dünya tələb ki, yoxdu bu dünyada etibar,
Bəsdir əgər tapılsa, bir əhli-vəfa mənə.

Hər qədr müşgülüm ola, müşküldə qalmaram,
Bəsdir Nəcəf çölündəki müşgülgüşa mənə.

Bir kimsə olmaya qabağımda qılıc vura,
Bəsdir bu Zülfiqari-şahi-lafəta mənə.

Qismət deyil Mədinəyə getmək yəqin bizə,
Cəddim deyibdi, məskən olar Kərbəla mənə.

Rüsxətdi hər cəvanə ki, toy arzusu var,
Qalsın bu çöldə Qasım növ kəndxuda mənə.

Yoxdur işim cavanlar ilə nüsrət etməyə,
Bir dil deyibdi Əkbəri-gülgünqəba mənə.

Heç kəs bu çöldə beyət əlin verməsin mənə,
Abbas var ki, əllərin eylər fəda mənə.

Düşmən içində çünki köməksiz görər məni,
Eylər Səkinə zülfü əlində dua mənə.

Mən heç kimin inayetinə təkyə etmərəm,
Bəsdir təvəkkül eyləməyə bir xuda mənə.

Məndən sonra Dəxilimə fürsət ver, ey xuda,
Dutsun fərağət ilə həmişə əza mənə.

QƏSİDƏLƏR

Xərabə mənzil olub çün əyali-tahayə,
Yetişdi nalə səsi övci-ərşi-əlayə.

Hənuz hər yeri bir yanda tutmamış aram,
Bir özgə qəm verib ali-əbli-beyti-Zəhrayə.

Bir-birinə xəbər eyləyib əhaliyi-Şam,
Ki, dəstə-dəstə gəliblər o dəm təmaşayə.

Bu az cəfadı ki, ol bikəsani-xam tamah,
Baxıb əsirlərə, düşdülər təmənnayə.

Tamahlanıb birisi istədi imamı qulam,
Həzar mən bu biabiruyi-dünyayə.

Biri deyirdi satarlar təmamini allam,
Yezidi razı əgər eyləyəm bu sövdayə.

O vaxtda Zeynəbi-nalənə üz verib riqqət,
Gümanı çox var idi çün Əliyyi-əlayə.

Buyurdu kur olasız, baxmayın, kənarə durun,
Nə tənədir, nə tamaşa hərimü alayə?

Zənanü mərdü, kənizü qulamsız bizə siz,
Qəsəm cənabi-Bətulü Rəsuli-bəthayə.

Həmin xərabədə Adəmdi bizlərə dərban,
Görübdü çün bizi xatun insi-Həvvayə.

Böyük hərəmlərə xadim cənabi-Məryəmdir,
Bu xırda qızlara Həvvadır aqibət dayə.

Yenə qoyub üzünü bəski aftab göyə,
Bizik ki, başımıza salmamışdı gün sayə.

Haman cavan ki, sınıq payəyə edib təkyə,
Onun adı yazılıb ərşə, ta tapıb payə.

Özü mərizdü amma bununla Ruhullah,
Əbəd həyat verir bir nəfəslə mövtayə.

Zəif can ilə çün əllərin öpübdü əsa,
Odur əsası verir can əsayi-Musayə.

Çəkiblə darə tənab ilə dari-dünyada,
Veribdü dari-bəladən nicat İsayə.

Yetişmişık təzə, bir dəm qoyun olaq rahat,
Salublə bizləri müddətdi kuhü səhrayə.

Qərib ölkə, xərabə məkan ki qırxa yavuq,
Əsir övrət-uşaq kim düşüb bu səhrayə.

Açıqdı başlarımız, baxmayın sizi Tarı,
Gedin dəxi dağılın, durmayın təmaşayə.

Nə müşrikü nə yəhudü nə əhli-zünnarıq,
Nüzul edib bizə Quran ayəbəayə.

Hicab edin, üzümüzdə nə pərdə var, nə niqab,
Qənaət eyləməyin türreyi-səmənsayə.

Əgər bizi tanısaz hətki-hörm0ət eyləməyin,
Bizik ki, nisbətimiz var Bətuli-Üzrayə.

Edibdi xalqa təvəllanızı xuda vacib,
Necə rəvadı Xudayə qalam təvəllayə.

Nəvayə gəlməyə var gülşəni-əzadə Dəxil,
Nə ehtiyac dəxi əndəlibi-şeydayə.

* * *

Tutmuş cahanı naleyi-va qürbəta qərib,
Güya gəlibdü naləyə bir binəva qərib.

Bilməni nə şüurdur ki, tutub əhli-aləmi,
Məclis qərib, növhə qərib, həm əza qərib.

Bilməm nədir cəzası bu qürbətdə ölməyin,
Həm ənbiya qərib olub, həm övliya qərib.

Əvvəl bu möhnəti eləyib şövq ilə qəbul,
Can verdi Kufədə Əliyü Murtəza qərib.

Qoydu Əli dalınca qədəm nayibi-Əli,
Oldu şəhid zəhr ilə ol Müctəba qərib.

Heç kəs qərib olmadı billah Hüseyn kimi,
Ölkə qərib, əyal qərib, əqrəba qərib.

Nəşi qərib, fərşi qərib, ölməyi qərib,
Həncər qəribü xəncəri-Şümri-dəğa qərib.

Yeddi bacı, beş-altı hərəm, xeymədən çıxıb,
Həsrətlə can verirdi şəhi-Kərbəla qərib.

Şümri-ləin kəsib başını nizəyə vurub,
Peykər qəribü baş qəribü cüda qərib.

Dörd dövrəsində nəşi-cavanani-gülüzar,
Əkbər qəribü Qasimi-növkədxuda qərib.

Qolsuz düşüb Fərat kənarında bir cavan,
Qollar qəribü məşki qəribü ləva qərib.

Zeynəb çəkərdi nalə ki, ya ümmətür-rəsul,
Öldü bu çöldə sibti-rəsuli-xuda qərib.

Bir kimsə yox məgər edə möminlərə xəbər,
Ya qövmüs-səlat və nahahüna qərib.

Cəbril tacını götürüb eylədi səda,
Öldü bu çöldə şəfeyi-ruzi-cəza qərib.

Nə qüsl, nə hənut, nə tabut, nə bir məzar,
Harda qalıb bu növ ilə bir binəva qərib?

Hansı qərib nəşi qalıb üç gün, üç gecə?
İsti qum üstə bikəfənü birəda qərib.

Bəs olmadı, əyalini Şamə apardılar,
Mənzil qəribü nalə qəribü nəva qərib.

Bağdadə get, sorağ elə Musi ibn Cəfəri,
Zindan qərib kündəvü zənciri-pa qərib.

On yeddi il soruşmadı bir kimsə halını,
Ümmət qərib, İmam qəribü cəfa qərib.

Qürbət qəmini bir-birinə irs qoydular,
Ta zülət ilə öldü imam Rza qərib.

Bu gün özünü şahi-Xorasanə sal Dəxil,
Ağla ki, olsun ağlamağından riza qərib.

## MƏHƏMMƏDƏLİ BƏY MƏXFİ

*Bədii əsərlərini "Məxfi " təxəllüsü ilə yazan Məhəmmədəli bəy Vəlizadə 1821-ci ildə Şuşada doğulmuşdur. Orada yeni tipli məktəbdə oxumuş, fars və rus dillərini öyrənmişdir. Şuşada və İrəvanda dövlət idarələrində çalışmış, dövrün qabaqcıl ziyalıları ilə dostluq etmişdir.*

*1891-ci ildə dünyasını dəyişən Məxfinin Azərbaycan və fars dillərində gözəl şeirləri qalmışdır. Filologiya elmləri namizədi Raqub Kərimov onun əsərlərini toplayaraq Bakıda "Qəzəllər" (2001) adı ilə nəşr etdirmişdir. Burada verilən örnəklər həmin kitabdan gotürülmüşdür.*

### QƏZƏLLƏR

Mətləbim kuyində didari-cəmalındır sənin,
Zindəganlıqdan qərəz əlhəqq vüsalındır sənin.

Çeşmeyi-heyvandan sönməz bu könlüm yanqusu,
Arizuyi-xatirim abi-zülalındır sənin.

Gəl məzarım üstə, sərvim, bir qədəm bas sinəmə,
Bu sərü tən xaki-payin paymalındır sənin.

Əhli-üşşaqın səlamət olmağı mümkünmüdür?
Hər qiya baxdıqda can almaq xəyalındır sənin.

Qaşların tağın qoyub, mehraba meyl etməz könül,
Səcdəgahım eşq ara ol künc-hilalındır sənin.

Söhbəti-xəlqi-cahan yanımda bir əfsanədir,
Mətləbim şəkkərşekən şirin məqalındır sənin.

Daneyi-əngurudur düşmüş meyi-gülfam ara
Ləblərində, yoxsa ol hinduyi-xalındır sənin.

Urmusan, ey məh, deyirlər dəm kəmali-hüsndən
Bu müşəxxəs oldu nöqsanü zəvalındır sənin.

Gəl, gəl, ey arami-can, can verməyim oldu əyan.
Məxfiyi-dilxəstə müştaqi-cəmalındır sənin.

* * *

Rəhm qılmaz məni-dilxəstəyə, cananıma bax,
Böylə birəhm yolunda bu çıxan canıma bax.

Ey məni xəstə qılıb halıma rəhm eyləmiyən,
Səri-kuyindəki bu naleyi-əfqanıma bax.

Ey deyən duzəx odun hicr ilə yeksan, bir gül
Çak edib köksümü, bu sineyi-suzanıma bax.

Könül, əhvalını sordum, rupərivəş söylədi,
Bu qara telləri gör, zülfi-pərişanıma bax.

Ey düşən eşqinə gülçöhrələrin, bir göz açıb,
Laxta-laxta cigərimdən tökülən qanıma bax.

Sorma, ey şux, könül halətini hicran gecəsi,
Qanlı göz yaşımı gör, dideyi-giryanıma bax.

Qılmadın şükrünü ol neməti-vəslin bir dəm,
İndi, ey Məxfi, gəlib bu şəbi-hicranıma bax.

* * *

Olmasın bir ləhzə kəm, yarəb, başımdan şuri-eşq,
Çıxmasın bu mülki-dildən bir zaman qovğayi-eşq.

Çəkməz dünya qəmin gər getsə əlindən varü yox,
Çun pənahımdır mənim ölüncə mavayi-eşq.

Ey könül, bu şövkət dünyası sitəmdir bana,
Rəğbət etməz padşahlar təxtinə şeydayi-eşq.

Sanma ey qafil ki, zəhmətdəndir bu zarlıq
Aşikar bir ləzzəti-candır bu ahü vayi-eşq.

Bəhri-eşqə, ey könül, gər məb sağini Yunis misal,
Kamə çəkmiş çoxların ol mahiye-dəryayi-eşq.

Eşq ara məqsuduna, Məxfi, yetərsən, səbr qıl,
Rahbərdir çün sənə bu yolda ol movlayi-eşq.

* * *

Xeyr edərmi mən mərizə heç bir qan, ey təbib?
Eşq dərdidir canımda bunu bir qan, ey təbib.

Dərdimin yox çarəsi səndə, nə izhar edəlim,
Saxlamaq xoşdur anı can içrə pünhan, ey təbib.

Səhhətimdən ötəri zəhmət çəkmə axər sən əbəs,
Gəlməyə ta yar özü müşküldü dərman, ey təbib.

İstəsən cəhhət bulam, vəsli-nigara çarə qıl.
Öldürür billah məni bu dərdi-hicran, ey təbib.

Çıxsa yarın möhnətü dərdi bu canımdan mənim,
Nə gərəkdir ta mənə bu cismü bu can, ey təbib.

Çıxmaz ol sevdayi-zülfü yar başdan, çıxsa can,
Əl götür, əhvalımı etmə pərişan, ey təbib.

Saxlaram dərdi-dili mən Məxfi, izhar etmərəm,
Faş əgər ta etməyə bu çeşmi-giryan, ey təbib.

* * *

Dən-dən ərəğ düşəndə rüxi-əhmər üstünə,
Şəbnəmdi guya kim tökülüb güllər üstünə.

Ləl ləbin kənarına çıxmış xətinmidir?
Murbəççələrmi yoxsa düşüb şəkkər üstünə?!

Yarəb, bir nurdu kim, tökülüb yar türrəsi,
Ya Kəbədir ki, gəlmiş anın kafər üstünə?!

Ətrafı-ləblərində o xali-siyahıdır?
Ya ləşgəri-həbəşmi gəlib Kövsər üstünə.

Şəhla gözün təkyə verib taği-əbruya,
Bir məstdir ki, meyl qılır minbər üstünə.

Əfşan olan o qamətinə saçlarınmıdır?
Şahmarlarmı yoxsa çıxıb ər-ər üstünə?!

Bilməm, əzizim, eşqin ara Məxfi neyləmiş,
Hər yan gəlibdi dərdü qəmin ləşgər üstünə.

* * *

Müftiyi-şəhr ki yol tapmadı meyxanəmizə,
Rəşkidən urdu sitəm daşını peymanəmizə.

Fəxr qıl, ey dili-divanə ki, bu şəhr içrə,
Yoxdu bir şux ki, yol bulmaya kaşanəmizə.

Əql idi eşq ilə baziçə dögül kim girələr,
İki sultani-müxalif dili-viranəmizə.

Bunca dad etdim o şuxun sitəmindən bir kəs,
Yoxdur axər ki, qulaq verə bu əfsanəmizə.

Gecələr mənzili təğyir edərəm, şayəd o dust,
Səhv edib bir qədəmin basa bizim xanəmizə.

Bu qədər düşdü könül eşqinə bir mahvəşin,
Hiç bay olmadı rağıb dili-divanəmizə.

Lafi-dindarlığın, Məxfi, səni kafər edib,
Kəbədən bir yol ola kaş bu bütxanəmizə.

## MİRZƏ HƏSƏN QARABAĞİ

*Mirzə Həsən Qarabaği 1824-cü ildə Suşa şəhərində doğulmuşdur. O, zəmanəsinə görə yaxşı təhsil almış, ərəb, fars dillərini öyrənmiş, klassik poeziyanın qayda-qanunları ilə tanış olmuşdur. Gənc yaşlarından xırda alverə başlayan Mirzə Həsənin həyatı zəhmətlə keçmişdir. O, ticarət məqsədilə doğma yurdundan ayrılaraq, qürbət elləri şəhərbəşəhər gəzir, dolanışıq qayğıları ilə yaşamalı olurdu, Şuşada olduğu vaxtlarda ilə "Məclisi-üns"ün yığıncaqlarında iştirak edirdi. Şair 1904-cü ildə Şuşada vəfat etmiş və orada dəfn olunmuşdur.*

*Mirzə Həsən Qarabağinin lirik şeirlər divanı dövrümüzə qədər gəlib çatmışdır. Həmin "Divan" əsasında şairin "Seçilmiş əsərləri" hazırlanmış və birinci dəfə 1973-cü, ikinci dəfə isə 2000-ci ildə Bakıda nəşr edilmişdir. Burada verilən nümunələr həmin kitabın ikinci nəşrindən götürülmüşdür.*

### QƏZƏLLƏR

Gözlərin mayil olubdur yenə xunxarlığa,
Bəli, sərxoş olu amadə sitəmkarlığa.

Küfri-zülfün dinü imanıma çox şaiq olub,
Bilirəm ki, salacaq rəxnə bu dindarlığa.

Yoxdu hicranına könlümdə dəxi tabü təvan,
Nə belə talib olubsan bu dilazarlığa?

Qamətinlə nə rəva sərv bərabər ola kim,
Xeyli müşküldü o gəlsin belə rəftarlığa.

Gül cəmalınla əgər bəhsə gəlibsə, nə əcəb,
O səbəb salmış özün gülşən ara xarlığa.

Etməzəm şikvə gözündən nə qədər qılsa
Məst olan mail olar çünki cəfakarlığa.

Fələyin mahın edib mehri-ruxun sərkərinə,
Gah verir nur ona, gah salır tarlığa.

Olma divanə, o zülfi-xəmə meyl etmə,
Həsən, Əqlin olsun, özünü salma o şahmarlığa.

* * *

Sən, ağa, bizlər üçün ruhi-rəvansan, getmə,
Nə həmin bizlər üçün, aləmə cansan, getmə.

Sənsiz aram nə mümkündü tapılsın bizdə,
Sən bizə quti-rəvan, tabü tavansan, getmə.

Bu yəqinimdi ki, aləm olu viran sənsiz,
Dolanım başına, sən cani-cəhansan, getmə.

Arizum oldu ki, çox ömr edəsən aləmdə,
"Məhfili-üns"də sən virdi-zəbansan, getmə.

Biz səninlə edirik aləm ara fəxr həmin,
Sən bizim izzətimiz, fəxri-zəmansan, getmə.

Səndən ancaq yetişir qəlbimizə zövqü səfa,
Sən səfabəxşi-dili-pirü cəvansan, getmə.

Vird edir şamü səba sidq ilə bu şeri Həsən,
Füqəra əhli üçün darül-əmansan, getmə.

* * *

İtmişdi dili-qəmzədə viranələr içrə,
Səd şükr ki, tapdım onu meyxanələr içrə.

Yarəb, yenə əl silsileyi-zülfə kim urdu,
Aşub düşübdür yenə divanələr içrə?!

Tari-səri-zülfünmüdü kim, şanə üzübdür,
Ya rişteyi-candır dolaşıb şanələr içrə?

Əfsaneyi-Fərhad ilə Qeys oldu fəramuş,
Yazıldı çü halım mənim əfsanələr içrə.

Zahid, səni tan, məni öz halına qoygil,
Gəzdirmə məni məscidü bütxanələr içrə.

Çoxdandı könül mail olubdur meyi-nabə,
Yar əksi düşüb bəs ki, o peymanələr içrə.

Müddətdi Həsən xəstədi bu gülxəni-qəmdə,
Saqi, nolu çəksən onu məstanələr içrə.

* * *

Qamətin tək boy atıb sərv xuraman olmaz,
Arizin tək, sənəma, bir güli-xəndan olmaz.

Nə olar türreyi-zülfün kimi bir sünbüli-tər,
Nə dodağın kimi bir ləli-Bədəxşan olmaz.

Nə qaşın tək fələk üzrə olu bir tazə hilal,
Nə camalın kinıi bir mehri-dirəxşan olmaz.

Nə gözün tək olu bir türki-kəmandari-cəri,
Nə müjən tək can alan navəki-peykan olmaz.

Hüsni-ruxsarına çox kimsənə maildi, vəli,
Ey mələkzadə, sənə mən kimi heyran olmaz.

Gər səri-kuyinə zahid deməsə xüldi-bərin,
İncimə, sevdiyim, onlarda ki iman olmaz.

Nolu göstərsən, əzizim, mənə bir ləhzə üzün,
Mehri-rüxsarına bir zərrə ki, nöqsan olmaz.

Gərçi aləmdə nəzakətli gözəl çoxdu, Həsən,
Leyk bu işvədə, bu qəmzədə canan olmaz.

* * *

Əhvalını, ey dil, sənə yarın demədimmi?
Hər feli xətadır o nigarın, demədimmi?

Meyl etmə o zülfə, özünü salma xətayə,
Zəncirdi hər bir xəmü tarın, demədimmi?

Çək cövrünü, ey dil, nə qədər var həyatın,
Bədməstliyini çeşmi-xumarın demədimmi?

Ey dil, o siyah çeşmi-xətakarə inanma,
Təzviri-bəladır, həmc karın demədimmi?

Can vermə, könül, eşqə, onun çəkmə cəfasın,
Eşq atəşinin ahu nəzarın demədimmi?

Səbr eylə, könül, eşqdə hicranına yarın,
Hicran gününün naləvü zarın demədimmi?

Vəsl ilə, Həsən, eyləmə hicrani fəramuş,
Var dalda xəzanı bu baharın, demədimmi?

## MƏHƏMMƏD BAĞIR XALXALİ

*Məhəmməd Bağır Xalxali 1829-cu ildə Xalxal əyalətinin Qarabulaq kəndində ruhani ailəsində doğulmuşdur. İlk təhsilini evdə atası Axund Molla Heydərdən alan Xalxali 14 yaşına çatanda biliyini artırmaq üçün Zəncana, oradan da Qəzvinə getmiş, xüsusi müəllimlərin yanında dövrünün elmlərini öyrənmişdir. Tahsilini başa vurduqdan sonra doğulduğu kəndə qayıdan Xalxali ömrünün axırına qədər Qarabulaqda yaşamışdır. O, 1900-cü ildə vəfat etmiş və kənd qəbiristanlığında dəfn olunmuşdur.*

*Zəmanəsinə uyğun yaxşı təhsil alan Xalxali əsərlərini Azərbaycan (türk), fars və ərəb dillərində yazmışdır. Şairin azərbaycanca divanına "Sələbiyyə " məsnəvisindən başqa qəzəl, müxəmməs, təcnis (qoşalıq) və saqinamələri daxildir. Onu ədəbiyyat tarixində məşhurlaşdıran "Sələbiyyə" (1893) məsnəvisidir. Mövzusu xalq arasında geniş yayılmış nağıl və hekayətlərdən alınmış bu əsər Təbrizdə və Bakıda bir neçə dəfə nəşr edilmişdir. Bu kitabda verilən "Sələbiyyə" "Cənub ulduzları " (1984) kitablarından götürülmüşdür.*

### SƏLƏBİYYƏ

*(İxtisarla)*

BAŞLANĞIC

Belə nəql eyləyib Mirzə Filani
Kəlami doğrudur, yoxdur yalani -

Ki, bir Tülkü diyari-İsfəhanda
Ki, yəni qeyrəti-mülki cahanda.

Əlinə düşməyib quti-münasib,
Muradın verməyib çərxi-məlağib.

Neçün ki, salmayıb bir zad əlinə,
Keçib bir ay ki dəyməyib ət dilinə.

Tükəndi səbri, oldu taqəti taq,
Bu vüsətlə ona təng oldu afaq.

Qaraldı gözləri, getdi qərari,
Acından getdi əldən ixtiyarı.

Oalıb evdə özü ac, külfəti ac,
Xədəngi-ibtilayə oldu amac.

Günü qarə, üzülmüş çarədən əl,
Əli qoynunda qalmışdı məəttəl,

Müqavvayə dönüb cismi-nəzari,
Gecə-gündüz edərdi ahü zari.

Töküldü cism, qaldı misli-sayə.
Əqiqi rəngi döndü kəhrəbayə.

Uşaqlardan biri "acam" deyirdi.
Bu, yüz batman qəmü qüssə yeyirdi...

BİÇARƏ TÜLKÜNÜN AVARA
QALMASI HEKAYƏTİ

Xülasə, çün məəttəl qaldı Rubah,
Töküb göz yaşı, çəkdi naləvü ah.

Qaçıb, səy eyləyib hər səmtgahə,
Tutub yüz, yollanıb hər şahrahə,

Edib çox hiyləvü əfsunü təzvir,
Qılıb salusü məkrü fikrü tədbir.

Gedib hər kuçəvü hər rəhgüzarə,
Girərdi hər evə, olmazdı çarə.

Məcaət dərdi aldı xəstə canin –
Ki, qoymub İsfəhanda girməmiş hin,

Xəyalında toyuq nəqşi çəkərdi,
Baxıb ol nəqşə göz yaşı tökərdi.

Görəndə göydə bir quş göz yumardı;
Gözünü yummasaydı, çün umardı.

Xoruz adın eşitsəydi birindən,
Çəkərdi seyhə, qalxardı yerindən,

Müəzzin səslənəndə göz açardı,
Xoruza bənzədib pərran qaçardı.

Xəyalinə düşəndə göy fəriklər,
Ətə guya ki, övrətlər yeriklər.

Yuxusuna əgər gəlsəydi cücə,
Oyanmazdı yuxudan ta ölüncə.

Keçərdi göylərə ahü füsusi,
Eşitsəydi əgər bani-xorusi.

Toyuq adın biri yerdə yazardı,
O ad altını min arşın qazardı.

TÜLKÜNÜN XOŞHAL OLMASI VƏ FAL AÇMASI

Xülasə, Tülkü çün hatif sözünü
Eşitcək çimçişib açdı gözünü.

Müşəxxəs eyləyib lütfi-xudanı,
Sevindi, güldü, qıldı şadimani.

O dəm tapdı bir aşıq, oldu falçı,
Dedi: Tapsam toyuq, üçdən bir alçı.

Sovuracaq aşıbını alçı durdu,
Sevindi Tülkü şad oldu, qudurdu.

Verib təkyə yerə, durdu ayağə,
O yerdən sallanıb gəldi aşağə.

Yetib bir dərəyə ol zarü əfkar,
Nə gördü, bir damaqlı kök toyuq var.

Yeyib əzbəs ki, danə har olubdur,
Sənin tək xeyli nahəmvar olubdur.

Olub sərməst, edib həqqi fəramuş,
Damağ ilə edər cami-səfa nuş.

Vurar cəh-cəh girəndə laləzarə,
Deyir bülbül nədir, kəklik nəkarə.

Nə Allah anlayır, nə məzhəbü din,
Zəlalətdən edibdir tərki-ain.

Qürurundan yerişin azdırıbdır,
Çəkib qəddin, deyərsən qaz durubdur.

TÜLKÜNÜN YUXU GÖRMƏSİ

Xülasə, çün bu fikrə düşdü Tülkü,
Qəmü qüssə odunda bişdi Tülkü.

Uşaqların salardı hey xəyalə,
Tökərdi göz yaşın, eylərdi nalə.

Əyalın fikr edib gəldi fəğanə,
Ucaldı şölə ahi asimanə.

Düşərdi xatirinə qövmü qardaş,
Ələrdi gözlərindən müttəsil yaş.

Müsibət riştəsinə bəstə oldu,
Zibəs döydü özünü, xəstə oldu.

Zəlalət mövcünə qərq oldu, batdı,
Başını qoydu bir daş üstə yatdı.

Yuxuda gördü bir şəxsi-mücəlləl,
Gəlib lütf ilə çəkdi başına əl.

Mücəlləl çün Kəlimi-adiyi-Tur,
Dirəklənmiş üzündən göylərə nur.

Buyurdu dur, nədəndir, ey bəlakeş
Ki, olmuş böylə əhvalın müşəvvəş.

Nə var başında, ey məhzuni-külbaş,
Tökər daim gözün peyvəstə qan-yaş:

Yaxan parə, gözün yaşlı, pərişan,
Olub şüğlün dəmadəm ahü əfğan.

Nə dərdin var düşübsən ruyi-xakə,
Səməkdən övc edib ahın səmakə.

Eşitcək bu sözü Rubahi -xəstə,
Ayağa durdu ol zarü şikəstə.

Səlam eylüb, buyurdu rəsmi-təslim,
Əlin qoydu döşünə, qıldı təzim.

Vurub cəlladi-qəm boynuna dürtmə,
Töküb göz yaşını, çaldı ögürtmə.

Çəkib övzai-əhvalin bəyanə,
Bu nəhv ilə deyərdi yanə-yanə:

"Tərəhhüm qıl, ağa, didəm yaşınə,
Məni çöndər uşaqların başinə.

Düşübdür yadıma əhli-əyalim,
Odur tüğyan edibdir əşki-alim.

Atam acdir, anam ac, külfətim ac,
Müsibət oxlarına oldum amac...

Dedi ol şəxs yatma, dur ayağa,
Təlaş eylə, dayanma, çıx bu dağə,

Görərsən orda bir qurt, eylə təzim,
Əlindən hər nə gəlsə, eylə təkrim.

Onunla yoldaş ol, gəz bu aradə,
Bu tezliklə yetərsən sən muradə.

QURDLA TÜLKÜNÜN SÖHBƏTİ

Dedi Tülkü: "Sənə, ey fəxri-əhrar,
Mürəxxəs eyləsən bircə sözüm var.

Budur ərzim, nədən böylə pərişan
Olubsan, şüğlün olmuş ahü əfğan.

Gözündən müttəsil qan-yaş tökərsən,
Fəlakətlə yaman günlər görərsən".

Dedi Qurd: "Ey oğul, qoy mən cavabın
Deyim indi, cavabın, ya savabın,

Cavanlıq aləmində şərr idim mən,
Şəriri-nəfsi-bumi-dəhr idim mən.

Nə çox baş verdi məndən zülmi-bidad,
Əlimdən göylərə qovzandı fəryad -

Ki, çox çöldə keçi, oğlaq çığırtdım,
Yelin salmış inəklər qarnı yırtdım.

Müsəlmanları saldım iztirabə,
Təpildim kömlərə, qoydum xərabə.

Çobanlar başına gətdim oyunlar,
Ayırdım kəllədən kök-kök qoyunlar.

Gəlir yadıma bir gün bir cavanın,
Həmin bu dərədə kəsdim amanın.

Qəşəng oğlan ki xətti gəlməmişdi,
Cavanlıqdan muradın almamışdı.

Tərəhhüm etməyib, qanını tökdüm,
Yetən saət yıxıb qarnını sökdüm.

Yedim, doydum, yetişdim müddəamə,
Gəlib dağ başına, girdim bu damə.

Gecə keçdi, səhər gəldi, çıxıb gün,
Nə gördüm, bu biyabani tutub ün.

O vaxtda yüz nəfər gördüm zənü mərd,
Dolanır çölləri banaləvü dərd.

Həmin ki, tapdılar ol növcavani,
Olub bu dərədə məhşər əyani.

"Oğul vay!" Naləsi tutdu cahani,
Salıb dərdə zəminü asimani.

Dalınca bir gəlin, oğlan anası,
Başında qarə, əldə toy xınası.

Yetişdilər o nəşi-namuradə,
Yolub saçlarını gəldilə dadə.

Qarışdı səs-səsə, qopdu qiyamət,
Qiyamətdən göründü min əlamət.

Gərək bu zülmlər olsun mükafat,
Odur, tutmuş məni dərdi-afat.

Keçir hər cür ola dünya əzabım,
Görən, aya nola yövmül hesabım.

Oturmaqdan, əzizim, heç kar aşmaz,
Bu halətdə bizə yatmaq yaraşmaz.

Ümidim var ki, olsun məqdəmin xeyr,
Gedək ruzi dalınca, eyləyək seyr.

Əlimdən tut, məni qovza, dayaq ol,
Təğafül eyləmə, oğlum, sayaq ol.

Eşitcək bu sözü, Tülkü olub şad,
Qüyudi-dərdü qəmdən oldu azad.

Qabaqca öpdü qurdun səqqəlindən,
Dalınca durdu yapışdı əlindən.

Dedi: "Qüm, ya rəfiqi, ya ənisi,
Məlazi-məlcəi- övni-rəisi".

O dəm qurd istədi dursun, yıxıldi,
Töküb yaşın, ürəkdən nalə qıldı.

Dedi: Canım aldı natəvanlıq,
Bədəndə taqətim yox, ay cavanlıq!

Cavanlıq getdi əldən, dad, bidad,
Dəxi olmaz bu qəmli xatirim şad.

## QURDUN TƏLƏYƏ DÜŞMƏSİ

Xülasə, Tülküyə ol gürgi-bədxu
Dedi: "Bismillah, ey dildari-xoşru.

Oğul, durma, deyil durmaq zamani,
Yeyib şükr eylə heyyi-zülmənani.

Dayanma, dur, soxul, sən döşlə, nazim;
Yemək gördün, demək artıq nə lazim?

Əlin, biçarə, qoynunda qalıbdır,
Məgər iştahuvu şaxta çalıbdır?

Dayanma, çün ələ fürsət düşübdür,
Di gəl, oğlan, məgər ağzın bişibdir?"

Dedi Tülkü: "Məni tut indi məzur,
Mənə əlan yemək olmazdı, məqdur.

Neçün, sabiqdə mən nəzr eyləmişdim,
Xudavəndə bir ay oruc demişdim.

Mükəlləflər kimi, mahi-siyami,
Tutam ixlas ilə ruzə tamami -

Ki, Allah rəhm edə bu qəmli halə,
Çəkə mən bikəsi bəzmi-vüsalə.

Əlimə daməni-vəslin alam mən,
Gələm daim hüzurində qalam mən.

Bəhəmdüllah, yetib nəzrim yerinə,
Yetişdim qibləmin xaki-dərinə.

Bu bir ay sovmdən bir gün qalıbdır,
Nə zəhmət çəkmişəm, canım alıbdır.

Buyur, məşğul ol, ey inkrəftar,
Ki, ta olsun mənimçün vəqti-iftar.

Bu gün tutsam, yetər nəzrim kəmalə,
Gərək indi baxam təzə hilalə.

Yetişmiş göylərə ahü fəğanin,
Yeməkdə olginən sən, nuşi-canın!"

Bu əqvali eşitcək Qurd inandı,
Ürəkdən bavər etdi, doğru sandı.

Qədəm qoycaq o dəmdə düşdü bəndə,
Kəməndə, düşdü bir ahu kəməndə.

Düşüb bəndə, çıxıb quyruq kənarə,
Salıb biçary qurdu ahü zarə.

Bu övzai görüb Gürgi-mükəddər,
Dedi: "Aya nə vardır, ey bəradər?"

Dedi Tülkü: "Baxıb gördüm hilali,
Yemək vacibdir iftarda həlali."

Dedi: "Görsəndi ay, bayram haçandır
Ki, bayram üqdeyi-qəlbi açandır".

Dedi Tülkü: "Ey yari-müsahib,
Olur bayram gələndə təllə-sahib".

O dəmdə quyruğu Tülkü götürdi,
Dayanmıb ta əyalinə yetirdi...

KİTABIN SONU

Bəhəmdullah, "Kitabi-Sələbiyyə".
Tamam oldu əcəb şirinqəziyyə.

Zəmani-Nasirəddin şahe-Qacar,
Şahənşahi-cahangirü-cahandar.

Mənə yoxdur yolu, şahi edim mədh,
Neçün ki, qorxuram mədhim ola qədh.

Vəlakin şahımız çox yaxşı şahdır,
Xilafət bürcünə rəxşəndə mahdır.

Onun əhdində asudə dolannıq,
Ədalət kölgəsində daldalannıq...

Əvamünnasə yazdım bu kitabi,
Müvəccəh olalar, qıldım xitabi.

Deyib çox məzhəkə, qıldım zərafət,
Onun zimnində bəm yazdım nəsihət.

Neçün ki, xəlqə həcv acı gəlibdür,
Zərafət sözləri şirin olubdur.

Qarışdırdım ikisin, gəldi nalə,
Yetişdi müntəhayı-etidalə.

Bu üzrümdə sora, gər mərdi-bədxah,
Təərrüz eyləyə, əlhökmüllillah,

Xəbər alsa, biri adımı bilfərəz,
Özüm öz adımı qoy eyləyim ərz:

Məhəmməd Bağiri-Xəlxaliyəm mən,
Fününi-mərifətdən xaliyəm mən.

Bu fərdi-axiri nəzmi-səvabi,
Bəyan eylübdi tarixi-kitabi.

# MİRZƏ MEHDİ ŞÜKUHİ

*Mirzə Mehdi Şükuhi 1829-cu ildə Təbrizdə sənətkar (aynasaz) ailəsində doğulmuşdur. İlk təhsilini mollaxanada almışdır. Gənc yaşlarında Marağaya köçmüş, ticarətlə məşğul olmuşdur. İşi ilə əlaqədar Türkiyə, Orta Asiya, Ərəbistan və İranın bəzi yerlərini gəzmiş, bir müddət Tehranda qaldıqdan sonra yenidən Marağaya qayıtmış yə ömrünün axırına qədər orada yaşamışdır. 1896-cı ildə Marağada vəfat etmiş və orada dəfn olunmuşdur.*

*Bədii yaradıcılığa gənclik illərində başlayan Şükuhi həm klassik, həm də xalq ədəbiyyatı üslubunda əsərlər yazmışdır. Qəzəl, qəşidə, müxəmməs, qitə, qoşma, gəraylı janrlarında olan lirik şeirləri, "Münazireyi-Əqlü Eşq", "Cəlala öyüd" adlı epik məsnəviləri ona şöhrət qazandırmışdır.*

*Şairin ölümündən sonra əsərləri bir neçə dəfə çap edilmişdir. Burada verilən nümunələr "Cənub ulduzları " (1984) kitabından götürülmüşdür.*

QƏZƏLLƏR

Gələn birdir, gedən birdir, qalan bir,
Gələn qalmaz, gedən gəlməz, əcəb sir.

Bir əvvəl var, bir axir var deyillər,
Bu bir sözdür, nə əvvəl var, nə axir.

Açar min məclisi-bazi dəmadəm,
Tamaşayə qurulmuşdur bu çadir.

Məali-küfrü imandən xəbər yox,
Nə fərq eylər bu mömindir, o kafir.

Tərazi-xaməsindən tük yayınmaz,
Təaləllah, əcəb ustadi-mahir.

Yaman getdi cavanlıq, mən qocaldım,
Pəri kuyində bir div oldu zahir.

Nə hasil zurü zərdən cüz təəssüf,
Driğa, gənci-Xosrov, cəngi-Nadir.

Şükuhi ölməyincə bu tilsimi
Deyil sındırmağa bir kimsə qadir.

* * *

Piri-meyxanayə bax, Cəmdə nə var Keydə nə var?
Bəxşişə seyr elə, Hatəmdə nə var, Teydə nə var?

Bir qədəh saldı ayaqdan səni, biçarə hərif,
Pey apar, gör mən içən cami-peyapeydə nə var?

Görməyən guşeyi-çeşmi-siyəhi-canani,
Nə bilir guşeyi-meyxanə nədir, meydə nə var?

Nə qədər var nəfəsim, çəkməyim əfgan neylim,
Bir quru nalədən özgə, de görüm, neydə nə var?

Canımı, malımı aldın, dəxi, zalım, bəsdir,
Bu Şükuhi dediyin müflisi-laşeydə nə var?

* * *

Yenə, ey gözləri məftun, sənə məftunəm mən,
Zarü məhzunü digərgunü ciyərxünəm mən.

Nola bir lütf ilə dindir məni, xoşnud eylə,
Gərçi düşnam ilə, səndən yenə məmnunəm mən.

Rəsmdir şəqqeyi-zənciri qırar divanə,
Vermişəm zülfünə dil, gör necə Məcnunəm mən.

İstərəm çox səni, canımdan əziz canın üçün,
And içəm canuva nahəq yerə, məlunəm mən.

Busəyi-lütf qılıb, aldın əvəz can nəqdin,
Ala öz busəvi, ver canımı, məğbunəm mən.

Gözümün yaşı kimi tökmə əyağə meyi-nab,
Saqican, təşneyi-ləli-ləbi meygunəm mən.

* * *

Gözlərimdən tökülür bu dili-müztər qanı,
Böylə nahəq yerə tökmə, a gözüm, hər qanı.

Gündə min aşiqi öldürsə xədəngi-nazın
Könlümün çox sənə, zalim, yenə qeynər qanı.

Türreyi-guşeyi-çeşmin elə qan ilə xizab,
Xoş olur şəhpəri-laçində kəbutər qanı.

Dişlədim ləlüvi, ey qanı sovuq, qan oldu,
Sən də lök qanımı, tut qanə bərabər qanı.

Nigəhin gizlədir ol məst gözün, çünki bilir,
Qanlının qanına bais olu xəncər qanı.

İçərəm qanuvu, bu aşiqə, zahid, az öcəş,
Çün müsəlmanə hədərdir tökə kafər qanı.

Az fəğan eylə, di get, ay qanı dolmuş aşiq.
Eşidər yari-sitəmgər yenə eylər qanı.

Can verən eşqdə bir sən deyisən, ey Naşi,
Çox bu meydanda axıb nazlı igidlər qanı.

**QOŞMALAR**

Bülbül kimi bu gülşənə gəlmişəm,
Lalə görüm, sünbül gorüm, gül görüm.
Deyirlər səndə var çox şivə, xəndə,
Bircə kəlmə danış görüm, gül görüm.

Bir yol gördüm yıxdın xanimanımı,
İtirdim aləmdə adü sanimı.
Bir də üzün göstər, gəl al canımı,
Gəlmişəm tanrıya təvəkkül görüm.

Mən razıyam hər nə olsa müqəddər,
Zülmün Şükuhiyə xoşdu, sitəmgər.
Bu mən, bu baş, bu yol, bu sən, bu xəncər,
Zəhmət çəkib ayağa dur, gəl görüm!

* * *

Bir də yolum düşsə yar otağına,
Mənim işim hamı kəsdən saz keçər,
İşə düşər deyib, danışıb, gülmək
Aralıqdan yüz min ərkü naz keçər.

Gül gülə sövkəşib, laləyə lalə,
Qumrular, bülbüllər çəkərlər nalə.
Saqi, bu mövsümdə gətir piyalə,
Bir az keçməz, payız gələr, yaz keçər.

Saqi dolandırsın cami-gülrəngi,
Düzülsün məclisə lalə, mərdəngi,
Oxusun xanəndə, oynasın cəngi,
Xəyalımdan setar keçər, saz keçər.

Yəhərləyin kəhər atı dubarə,
Tüfəngimi verin, gəlmişəm zarə,
Mən istərəm bir də çıxam şikarə,
Çox deyillər: "Bu kövşəndən qaz keçər".

Az mənim bağrımı qan ilə doldur,
Dərdin bu canımda hamıdan boldur,
Deyillər: "Könüldən könülə yoldur",
Şükuhi könlündən niyə az keçər?

* * *

Bir deyən yoxdur o məhcəmalə
Aşiqi-nalan gəlsin, gəlməsin?
Həsrəti çoxdur bəzmi-vüsalə,
Bu didəgiryan gəlsin, gəlməsin?

Aşiqi-zarın gülşəni-nazə
Gəlibdir, səndən istər icazə.
Buyur bir görüm, ey güli-tazə.
Nə oldu fərman, gəlsin, gəlməsin?

Aşiqin sənsiz didəgiryandır,
Lalətək bağrı qüssədən qandır.
Hər nə hökm etsən, bəndəfərmandır,
Ey şəhi-xuban, gəlsin, gəlməsin?

Aşiqin sənsiz bil şadlıq etməz,
Ölüncə səndən əl çəkib getməz,
Heç kəs öz yarın belə sinsitməz,
Ey sənə qurban, gəlsin, gəlməsin?

Bülbüli-zarın ruzi-ələstdən,
Nalə çəkməkdən düşdü nəfəsdən,
Ha elə-belə künci-qəfəsdən,
Naləvü-əfğan gəlsin, gəlməsin?

Çox yubandırma, gəl səni tan,
Xaki-dərində Naşiyi-zari,
Di qurtar, kafir, bu biqərari,
Öldü müsəlman gəlsin, gəlməsin?

**GƏRAYLILAR**

Bu bivəfa, bu bivəfa
Dünyayə bax, dünyayə bax.
Saldı məni Məcnun kimi
Səhrayə bax, səhrayə, bax.

Düş Mebdinin sorağinə,
Gəl yengicə qabağinə,
Təvilələr bucağinə
Qovğayə bax, qovğayə bax.

Gəl bir neçə həmrazı gör,
Dümbəkçi edən nazı gör,
Aşıq əlində sazı gör,
Zurnayə bax, zurnayə bax.

Övrətləri sədrnişin,
Kişilər tərk edib işin,
Gör necə ağardır dişin,
Mollayə bax, mollayə bax.

Məclisə düzülüb yeyin,
Hamı deyir: "Yeyin, yeyin."
Yarı saman, yarı peyin,
Şorbayə bax, şorbayə bax.

Bu sorbayə etmə nəzər,
Əlhəzər, qardaş, əlhəzər.
İçində bir ördək üzər
Dəryayə bax, dəryayə bax.

Bu məclisə əzm eylədim,
Şorba yedim, həzm eylədim,
Otdum bunu nəzm eylədim,
Sövdayə bax, sövdayə bax.

* * *

Səni bir şahi-gülrüxan,
Mən özümü zəlil gördüm.
Səni bir növrəstə cavan,
Mən özümü zəlil gördüm.

Yar yanında əyləşəndən,
Aldım yüz min busə səndən,
Üzün döndərmədin məndən,
Mən səni çox həmil gördüm.

Hümmətini gördüm ali,
Dərdimdən eylədim hali,
Ləblərindən qəndü bali,
Sel, su kimi səbil gördüm.

Mən istərəm səni yeyim,
Dilin, dodağın çeynəyim,
Aclıqdır, axır neyləyim,
Bu ili yaman il gördüm.

Əriyibdir cismi, cani.
Qalmayıb tabü təvani,
Şükuhiyi-binəvani
Bu qapıya dəxil gördüm.

## MOLLA AĞA BİXUD

*Molla Ağa Hacı Tağı oğlu Bixud 1830-cu ildə Şamaxıda doğulmuş, təhsilini orada almışdır. "Beytüs-səfa" ədəbi məclisinin nüfuzlu üzvlərindən olmuşdur. Seyid Əzim Şamaxıda olmadıqda məclisin yığıncaqları Bixudun rəhbərliyi ilə keçərmiş.*

*Bixud 1892-ci ildə Şamaxıda vəfat etmişdir.*

*Əsərlərini Azərbaycan və fars dillərində yazan Bixudun divanı hələlik əldə edilməmişdir, Burada verilən nümunələr "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Ey dil, barı meyxanə sarı bir güzər eylə
Gör məstlərin haləti-vəcdin, nəzər eylə.

Gər istəyəsən dəhrdə sahibnəzər olmaq,
Xaki-dəri-meyxanəni, gəl külbəsər eylə.

Bir gül məni cövr ilə şəhid eylədi axir,
Bülbüllərə, ey badi-səba, get xəbər eylə.

Yan atəşi-hicranə, könül, çək bu bəlanı,
Bu eşqdən axir demədimmi həzər eylə?

Təsir eləməz ol büti-səngindilə naləm,
Ey ahi-səhər, gəl, barı sən bir əsər eylə.

Ahım küləyi yıxmadi bünyadını hicrin,
Ey seyli-sirişkim, sən özün bir hünər eylə.

Çıxmaz başa, yüz şərh edəsən zülfi-hədisin,
Bixud, bu uzun qissəni, gəl, müxtəsər eylə.

* * *

Riyazətsiz, könül, bu nəfs bir tovsəndi, ram olmaz,
Buna cövlangəhi-ərsə ərz ola, seyri tamam olmaz.

Cahanı dost tutduqca edər düşmənçilik peyda,
Bu düşmən kamdan, ey nəfs, hasil hiç kam olmaz.

Cahan məmurəsində künci-izlət ixtiyar eylə,
Qənaət əhlinə, ey dil, belə rahət məqara olmaz.

Əyaqdan düşməmiş səy eylə, əldən vermə mey camın,
Cavanlıq şuri qalmaz başda, bu nəşə müdam olmaz.

Nə təşviş eyləyirsən cam, elində ruzi-məhşərdən,
Əgər piri-muğan vermişsə, o qorxma, haram olmaz.

Təmənna eyləsəm, saqi, ləbindən busə, məzurəm,
Bu rövşən əmrdir kim, məst olan kəsdə nizam olmaz.

Bürünmə xirqeyi-salusə, Bixud, təndən qorxub,
Bu meydani-məhəbbətdir, bu yerdə nəngü nam olmaz.

* * *

Çəkmə, ey dust, məni məscidi-viranə san,
Genə çəksən də məni, çək barı meyxanə sarı,

Ələ əbnayi-zəman səngi-məlamət götürüb,
Gör nə şövq ilə baxırlar məni-divanə san!

Vaizin pəndi ki, hərgiz mənə təsir etməz,
Yüz min əfsun oxuya, getmənəm əfsanə sarı.

Dəftəri-hüsnünü hər kəs görə ol mahruxun,
Min kitab oxuna, baxmaz dəxi Quranə san.

Səbhə göstərmə mənə, zahid, əmaməndən utan,
Mürği-zirək ki, görə dami, dönər danə sarı?

Mən ki divaneyi-eşqəm, mənə çox söylməyin,
"Hu" deyib, baş qoyaram kuhü biyabanə sarı.

Eşq ara bülbüli-pabəstə idi Bixudi-zar,
Bağban açdı pərin, atdı gülüstanə sarı.

* * *

Təngə gəldim, saqiya, bu məscidi-viranədən,
Gəl, tərəhhüm eylə bir yer ver mənə meyxanədən.

Vaizin pəndin tutub, meyxanədən çəkdim əyaq,
Olmuşam indi xəcil bu tutduğum əfsanədən.

Sirrlər kim, səbhəvü müshəfdən olmazdı əyan,
İmdi oldu aşikara sən verən peymanədən.

Dur, gözün qurbanı, saqi, badə ver, əhd etmişəm,
Kim, olam məst, əl çəkəm bu səbheyi-səddanədən.

Dün xəta etdim, dedim kim, zülfünə zəncirdir,
Əfv qıl, çıxmaz, gözüm, məqul söz divanədən.

Həqqə vasil olmaq istərsənsə, ey dil, tərk qıl
Söhbəti-əğyari, qəti-ülfət et biganədən.

Mən ki namü nəngdən keçdim yolunda saqinin,
Söylə, ey Bixud ki, indi eyləyim pərva nədən?

## MÜXƏMMƏS

Edən yar arzusunu möhnəti-əğyarə dözməzmi?
Gülə aşiq olan bülbül cəfayi-xarə dözməzmi?
Vəfadan dəm vuran aşiq qəmi-düdarə dözməzmi?
Ola gər tiri-qəmdən sinəsi sədparə, dözməzmi?
O qəm, kim, aşiqi mərhəm qıla əsrarə, dözməzmi?

Nə qəm, hicran ilə bağrım dönə hər ləhzə gər qanə,
Vüsalə göz tikən aşiq dözər, əlbəttə, hicranə,
Xoşam gər şəm tək cismim tutub od eşq ara yanə,
Həqiqət sirrin istərsə ədəm kuyindən pərvanə,
Vücudun tərk edib, candan keçib, həm narə dözməzmi?

Sütuni-səbrimə gərçi vurar Fərhadi-qəm tişə,
İtirməz dil qəmi-tədbiri, düşməz xofü əndişə,
Bizə ustadımız eşq içrə səbri göstərib pişə,
Ənəlhəq söyləyən arif fənadan etməz əndişə,
Rümuzi-eşqdən agah olan kəs darə dözməzmi?

Nə qəm, gər əşki-xünin saçsa hərdəm çeşmi-nəmnakım.
Yaxıb eşq atəşi badi-fənayə versə gər xakım,
Olurmu eşqdən bir ləhzə xali sineyi-pakım,
Məlamət kuyinin rüsvasıyam, yox tənədən bakım,
Deyə Məcnuni-eşqə hər zaman min yarə, dözməzmi?

Nə qədr eşqində çəksəm dərdü qəm, ey dust, minnətdir,
Cəfa kim, Bixudə səndən gəlir, eyni-məhəbbətdir,
Mərizi-eşqinəm, dərdin mənə daruyi-səhhətdir,
Səninlə içdiyim qan olsa, guya şəhdü şərbətdir,
Müalic təlx şərbət versə gər bimarə, dözməzmi?

## QƏZƏLİ-MÜSTƏZAD

Zahid, bu fəna mülkdə dövran sənin olsun,
verdim sənə yeksər.
Zöhdü vərəvü taətü iman sənin olsun,
məcmuyi sərasər.

Duzəx mənə şayəstədi, cənnət sənə layiq,
mən yanmağa şayiq,
Sən cənnətə get, hurivü qilman sənin olsun,
qalsın sənə kövsər.

Firdovsi-bərin, qəsri-təla, çeşməyi-təsnim,
olsun sənə təslim,
Çəkdim əlimi, lölöü mərcan sənin olsun,
sən olma mükəddər.

Əlminnətü lillah ki, könül yetdi muradə,
qalrmışdı aradə,
Get sən dolan avarə, biyaban sənin olsun,
bihadivü rəhbər.

Bixud ki məlamətlərə xəlq içrə boyandı,
yatmışdı, oyadı,
Get, dəhrdə, zahid, sərü saman sənin olsun,
əl sək dəxi kafər.

## ƏBÜLHƏSƏN RACİ

*Hacı Əbülhəsən Raci 183l-ci ildə Təbrizdə doğulmuş, təhsilini də orada ahmşdır. Şəxsi mütaliə yolu ilə klassik Şərq ədəbiyyatını öyrənən Racinin peşəsi tacirlik imiş. 1876-cı ildə Həcc ziyarətinə getmiş, Məkkədən gəmi ilə qayıdarkən Qırmızı dənizdə tufana düşüb, sərnişinlərlə birlikdə həlak olmuşdur.*

*Raci əsərlərini Azərbaycan və fars dillərində yazmışdır. Onun divanları və ayri-ayrı şeirləri dəfələrlə Təbrizdə və Bakıda çapdan çıxmışdır: Burada verilən nümunələr şairin 1992-ci ildə Bakıda nəşr edilmiş "Seçilmiş əsərləri"ndən götürülmüşdür.*

### QƏZƏLLƏR

Götür saqi, meyi-gülfami, doldur cami-zərrinə,
Əlimdən dut, amandur, qərq oldum qüssə bəhrinə.

Könül az qaldi çak olsun, küdurətdən həlak olsun,
Götür peymanə, pak olsun, bu dəm manəndi-ayinə.

Gözün qurbani, peydərpey, götür məstanə cami-mey,
Yetişsin nəreyi - "hey-hey" fələkdən mahü pərvinə.

Bilurin cam ilə şişə, götür bəzm içrə gərdişə,
Dəxi naz eyləmə pişə, məni-məhzuni-miskinə.

Gərəkdür bu dili-giryan, ola Yəqub tək xəndan,
Deyillər Yusifi-Kənan, gəlib Təbriz şəhrinə.

Dutan şöhrətdə əyyami, verən yəğmayə arami,
Onun zülfi-siyəhfami, bəladur bu dilü dinə.

Baxan bu arizi-alə, düşər bir özgə əhvalə,
Deyər: - Nəqqaşə bax, lalə çəkibdür bərgi-nəsrinə.

Səba çün sünbülü reyhan, edəndə zülfini əfşan,
Dönər bu səfheyi-İran, diyari-Çinü Macinə.

O şuxun çeşmi-laçini, edər seyd ahuyi-Çini,
Xəraci-Çinü Maçini, salubdur bircə maçinə.

Səbu başini məclisdə, müğənni qoydu tar üstə,
Dedi ahəstə-ahəstə nigar adin bu qəmginə.

De bir türki qəzəl, Raci, oxusun bu gözəl,Raci,
Bələd olsun əzəl Raci, rümuzi-eşq dərdinə.

* * *

Nə qədər sən kimi bir qönçədəhanım yox idi,
Ey pərivəş, bu qədər ahü fəğanım yox idi.

Tutiyayi-xəti can nəqdinə alseydim əgər,
Ey gözüm, bil ki, bu sevdada ziyanım yox idi.

Yarə rəmz ilə hamı dərdimi bildirdüm mən,
Kəşfi-raz etməgə hərçənd zəbanım yox idi.

Səri-kuyin mənə dünyadə əta eylədi Həqq,
Çünki üqbadə mənim meyli-cinanım yox idi.

Gördi pürsuz ilə yandı bu gecə halimə şəm,
Çünki bir şəm kimi canı yananım yox idi.

Neməti-vəslüvə sod şükr yetişdüm birənc,
Mənim öz taleyimə hiç gümanım yox idi.

Raci, yazdum qala məndən bu qəzəl namü nişan,
Çünki aləmdə mənim namü nişanım yox idi.

* * *

Yıxdılar aşiqlərin qəlbi kimi meyxanəni,
Bivəfalar əhdi tək sındırdılar peymanəni.

Ləli-canan tək uzaq oldı nəzərlərdən şərab,
Çeşmi-dilbər tək xumarə saldılar məstanəni.

Rindü şeyxü salikü zahid qarışmış bir yerə,
Çeşmi-həqbin yox, seçə namərd ilə mərdanəni.

Düşdi rövnəqdən gülüstani-vəfa, zağü zəğən
Bülbüli-şeyda yerində başlıyub əfganani.

Atəşi-şövqi-məhəbbət yandururdı aqibət,
Şəmlər nahəq yerə yandurdilər pərvanəni.

Oldum həmrəng, cəmaət, eşqi-xalü zülf ilə
Rişteyi-zünnarə düzdüm səbheyi-səddanəni.

Ey dil, əl çək, yox bəni-növi-bəşərdə etibar,
Məskən et bayqusifət bir guşeyi-viranəni.

Kutəh eylün qisseyi-zülfi, ey ərbabi-üqul,
Rahət əgləşsün qoyun, zəncirdə divanəni.

Raci, gördüm tərgi-candur iqtizayi-ittihad,
Bəzmi-vəsli-xasə qoymazlar girə biganəni.

* * *

Hübb ayəsi, zahid, sənə Quranda tapıldı,
Misdaği mənə arizi-cananda tapıldı.

Asarı-şüunati-zühuratı-həqayiq,
Əlhəq genə bu məsləki-ürfanda tapıldı.

Sinəmdə əyan oldı tilismati-məhəbbət,
Bir gəncdü məxfi ki, bu viranda tapıldı.

Çeşmimdə xəyali-ərəqi-arizi-canan,
Guya düri-şəhvardu, ümmanda tapıldı.

İncitmün, ətibba, bizi, dərdi-qəmi-eşqə
Dərman nə Ərəstudə, nə Loğmanda tapıldı.

Qaldi səri-zülfündə könül, kamə yetişdüm,
Nə eyşdü bu, Şami-qəribanda tapıldı.

Zahid, bu pəriçöhrəyə bir diqqət ilə bax,
Get, gəz, gər əgər rövzeyi-rizvanda tapıldı?

Olmuşdu könül Yusifi bir müddət idi güm,
Axtardum onı, cahi-zənəxdanda tapıldı.

Ey vacibün imkaninə talib olan aşiq,
Məzhər ona, gəl, aləmi-imkanda tapıldı.

Qəmzən tükədüb, nazun alub, işvən apardı,
Sedparə könül hər biri bir yanda tapıldı.

Xət basdı qədəm naz ilə hüsnün vərəqinə,
Qarıncadü ya, təxti-Süleymanda tapıldı.

Bu Racidəki şur ilə sevdavü məhəbbət,
Məcnunda, nə Fərhad ilə Sənanda tapıldı.

## QƏSİDƏLƏR

Eşq əhli bu afaqda rüsva gərək olsun,
Məcnun kimi sərgəşteyi-səhra gərək olsun.

Bu rəsmdür aşiqlərə divanə deyəllər,
Bu taifədə hövsələ dərya gərək olsun.

Əğyardən eşq əhli gərək pür həzər etsün,
Qəlbində onun yəni təbərra gərək olsun.

Öz canını qıırban eləsün dust yolunda,
Lazımdu təbarradə təvəlla gərək olsun.

Aşiq odur olsun özü məşuqi-bənəfsə,
Yəni ki, o bir bimənü bima gərək olsun.

Başdan ayağa yarsala tığ ilə gər aşiq,
Məşuq ilə məmlüvv sərapa gərək olsun.

Məcnun kimi aşüfteyi-xalü xəti-Leyli,
Vamiq kimi məhvi-rüxi-Əzra gərək olsun.

Şəhbaz kimi dövr eləsün dövri-cəhani,
Ta bir çəmənə bülbüli-şeyda gərək olsun.

Min zülmü sitəm eyləsə canan deməsün bir,
Aya niyə bu zülmü təədda gərək olsun.

Dözsün sitəmi-möhnətü ənduhi-bəlayə,
Ümmidgəhi səbrü şəkiba gərək olsun.

Görsün rüxi-canani əyan daim özündə,
Ayinə kimi qəlbi müsəffa gərək olsun.

Biganədü söz aşiqü məşuq arasında,
Can verməgi mövqufi-bərima gərək olsun.

Heç eyləməsün vəsl ilə hicran ona tövfir,
Hicranda canan ilə yekca gərək olsun.

Eşq aləmini seyr eləsün payəbəpayə,
Ta cilvəgəhi-aləmi bala gərək olsun.

Öz canını pamal eləsün künci-bəladə,
Ta kəngəreyi-ərş ona məva gərək olsun.

Büxlü həsədü kinəvü büğz ilə riyadən,
Aşiq olan aləmdə mübərra gərək olsun.

Aşiq odur aləmdə Üveysi Qərəni tək,
Məsti-meyi-meyxaneyi-mövla gərək olsun.

Mövla necə mövla Əlivü alivü əla,
Ol ismi-xuda ilə müsəmma gərək olsun.

Rüfətdə onun payeyi-əlvani-cəlali,
Min mərtəbə bu ərşdən əla gərək olsun.

Bu padişəhün çakərinün çakəri Xosrov,
Dərbani-dəri-həşməti Dara gərək olsun.

Saqi, dolanum başına, ver badə peyapey,
Başimdə mənim nəşəyi-səhba gərək olsun.

Göstər güli-rüxsarini, canım sənə qurban,
Könlüm quşu bülbül kimi guya gərək olsun.

Öz xahişini tərk eləsün talibi-canan,
Nə talibi-dünyavü nə üqba gərək olsun.

Təsiri-nəfəs bundan alub həzrəti İsa,
Həqqa ki, bu möhyayi-Məsiha gərək olsun.

"Mutu" desə zərratə, sərasər olu fani,
"Qumu" desə, kulliyyətən əhya gərək olsun.

Həm dideyi-Yəqubə bu Mövladu verən nur,
Yusifdə nişan hüsni-dilarə gərək olsun.

Feyzi bu Şəhün Xızrdəki ömrdü cavid,
Davudi də surət fərəhəfza gərək olsun.

Məcmui-peyəmbərlərə bu feyz veribdür,
Musadə nişan ol yedi-beyza gərək olsun.

Həqqa ki, bu Şahənşəhün asari-cəlali,
Bir zərrə Süleymanda hüveyda gərək olsun.

İllət budur icad olub xəlq ədəmdən,
Bişək səbəbi-Adəmü Həvva gərək olsun.

Mövlani qoyub vəsf eliyə hurü cinani,
Zahid sözü bu barədə bica gərək olsun.

Can vermək, üzün görmək əgər olsa müyəssər,
Çox nəfli sövdadu bu sövda gərək olsun.

Etməz sənə bu eşq sözü zərrəcə təsir,
Zahid, ürəgin səxreyi-səmma gərək olsun.

Düşmən nə görər şəbpərə tək mehri-cəmalun,
Didaruva bir dideyi-bina gərək olsun.

Yaz mədhini, Raci, nə qədər olsa müyəssər,
Övsafi-Əli aləmə ifşa gərək olsun.

**NÖVHƏLƏR**

Bax fələk Şamdə bir zümreyi-kafər yerinə,
Künci-viranədə həm Ali-Peyəmbər yerinə.

Qəsri-alidə Yezidün qızı yatsun rahət,
Künci-viranədə çəksün o Səkinə möhnət,
O sala məcəri-zərduz-başə ba şövkət,
Bu sala zülfini rüxsarinə məcər yerinə.

Şəhri-Yəsribdən olan vəqtə müsafir Zeynəb,
Yeddi qardaşinə eylərdi təfaxür Zeynəb,
İndi qan ağlamasun, neyləsün axir Zeynəb,
Bircə Bimari qalub yeddi bəradər yerinə.

Nə rəvadur üsəra şivənü əfğanə gələ,
Şamun övrətləri tən ilə təmaşayə gələ,
“Tuf” belə gərdişə, lənət belə dünyaya gələ
Ali-Süfyani qoyar zadəyi-Heydər yerinə.

Çün gəlürdi görələr Zeynəbi ol əhli-tərəb,
Üsəra dövrin alırdı o məhin çün kövkəb.
Zeynəb ol firqəni gördükcə deyirdi: - Yarəb,
Olmasun kimsə cəhanda məni-müztər yerinə.

Möhnəti-qürbət əsər etdi o dəm Leylayə,
Verdi viranədə əl qüssəvü qəra Leylayə,
Dedi: - Ey çərx, elədün yaxşi sitəm Leylayə,
Pasiban Şümr olub indi mənə Əkbər yerinə.

Həmnəfəs olmadi bir dəm dəmi-dəmsazə ərus,
Gəldi viranədə bülbül kimi avazə ərus.
Dedi: - Aya görülüb indiyətən tazə ərus,
Ey fələk, qarə sala başinə zivər yerinə?

Dedi: - Az qaldi-Səkinə ki, - bu canim çıxsun,
Nə qədər boynumi zənciri-düşaxə sıxsun?
Təngə gəldüm bu Yəzidün evini həq yıxsun,
Gedəcəkdür bəs haçan Ali-Peyəmbər, yerinə.

Gördü Gülsum üsəra oxşadi hər nakami,
Ney kimi dərdə gəlübdür dili-biarami,
Dedi: - Qardaş, görüsən bir bu güruhi-Şami,
İtrəti-Heydərə zülm eylədi kafər yerinə.

Bir gecə gəldi genə dərdi-Səkinə cuşə,
Ağladi, qoydi yüzin torpağa, getdi huşə,
Gördi röyadə alubdur babasi ağuşə,
Çəkər əl sili vuran Şümri-bədəxtər yerinə.

Ərz qıldi: - Baba, viranə olub gör, vətənim,
Şümrdən imdi varımdur sənə yüz şikvə mənim.
Vurub, əzbəs göyərüb, başda-ayağə bədənim,
Taziyanə yeridür, baxsan əgər hər yerinə.

Qalmeyub tabü təvana, baba, mən bidildə,
Gətdilər Şamə məni naqeyi-biməhmildə,
Yeridüb Şümr piyadə bizi hər mənzildə,
Yetirüb zülmini bu şumi-bədəxtər yerinə.

Verdi arami-təsəlli mənə hər dəm Zeynəb,
Razi olmaz yetişə könlümə bir qəm Zeynəb,

Çox çəküb zəhmətimi, ey baba, əmməm Zeynəb,
Hörmət eylüb mənə viranədə madər yerinə.

Raci, tovlanma bu bimehrü vəfa dünyayə,
Əldə bir tuşə gərək çün səfəri-üqbayə,
Nəqdi-əşk ilə bu gün cəm elə bir sərmayə,
Göz yaşı xərc olu məhşər güni gövhər yerinə.

* * *

Aləm niyə bəs olmadi viran, Əli Əkbər,
Ol gün ki, səni saldılar atdan, Əli Əkbər?

Bu şiələr, ey kaş, cəhənnəmdə yaneydi,
Zülfün nə ki, bircə teli qanə boyaneydi,
Çərxün görum ol gündə bu dövri dolaneydi
Dövri-bərüvi aldılar üdvan, Əli Əkbər.

Bu əqdini bu şiələrün həll edə, müşkil,
Vermüb su, kəsüb təşnə sənün başuvi qatil,
Olsun o sərün su üçün aşiqlərə nisgil,
Verdün sən o zəhmətlə susuz can, Əli Əkbər.

Leyla gecələr sübhə kimi yatmadi rahət,
Sən kimi cəvan bəslədi, ey kani-məlahət,
Axir nə rəvadur qala didaruna həsrət,
Düşmən eliyə qanuva qəltan, Əli Əkbər.

Məşhurdu hərçənd qəmü möhnəti-Yusif,
Kor eylədi Yəqub gözin firqəti-Yusif,
Əmma ona bir vəqtə yetüb həzrəti Yusif,
Kim, olmuş idi Misrdə sultan, Əli Əkbər.

Tapdi səni bir vəqtə o Yəqubi-Mədinə,
Yıxmışdıla rəna qədüvi ruyi-zəminə,
İstərdi kəsə başuvi ol ləşkəri-kinə,
Dutmuşdi sənün gözlərüvi qan, Əli Əkbər.

Gördi ki, kəsər başuvi ol taifeyi-gəbr,
Mümkün degü bir kimsənə bu zülmə edə səbr,
Doldurdi baban gözlərini əşk ilə çün əbr,
Səbr eylədi bir Şahi-şəhidan, Əli Əkbər.

Qurbani görülmüb kəsə bir kimsənə ətşan,
Əmma sənə rəhm etmədi bu ləşkəri-üdvan,
Axir səni meydanda susuz kəsdilə qurban,
Bu canimiz olsun sənə qurban, Əli Əkbər.

Sinən dəmi-şəmşir ilə peykanə verübsən,
Canü dil ilə canuvi cananə verübsən,
Başun bu rahi-eşqdə mərdanə verübsən,
Ey nuri-düçeşmi-Şəhi-mərdan Əli Əkbər.

Ol gün ki, çıxub xeymədən əflakə fəğanlar,
Meydanda töküldi yerə nahəq yerə qanlar,
Hardeydi o gün, mən sənə qurban, bu cavanlar,
Məcmui oleydi sənə qurban, Əli Əkbər.

Bu zəxmi-dil oldı anova zəxmi-cəbinün,
Göylündə qalub həsrəti Leylayi-həzinün,
Səndən sora kül başinə dünyayi-dəninün,
Sənsiz necə dövr etdi bu dövran, Əli Əkbər?

Şümrin görüm aləmdə şədid olsun əzabi,
Aya nolu peyğəmbərə məhşərdə cəvabi?
Ol gün ki, qurar ədl ilə divani-hesabi,
Etsün bu barədə divan, Əli Əkbər.

Çavuş səda çəkdi, çıxub qafiləyi-qəm,
Olmadi bu il Racinün övzai fərahəm,
Qismət ola qəbrimdə deyə növbə dəmadəm,
Hüzzar olallar çaki-giriban, Əli Əkbər.

## XURŞİDBANU NATƏVAN

*Azərbaycan bədii mədəniyyəti tarixində lirik şair kimi məşhur olan Xurşidbanu Natəvan 1832-ci il avqust ayının 15-də Şuşada, Qarabağın son hakimi Mehdiqulu xan Cavanşirin ailəsində dünyaya gəlmişdir. Xalq arasında "Xan qızı" ləqəbi ilə çağırılan Xurşidbanu saray tərbiyəsi görmüş, dövrün tanınmış alim və sənətkarlarından dərs almışdır. Lakin onun şəxsi həyatı fərəhsiz keçmişdir.*

*On üç yaşında olarkən atası ölmüş, ailə başsız qalmışdır. O, dağıstanlı knyaz Xasay xan Usmiyevlə ailə qurmuş, ancaq bu ailənin taleyi uğursuz olmuşdur. Natəvan ikinci dəfə 1869-cu ildə rəiyyət içərisindən çıxmış Seyid Hüseyn adlı bir şuşalıya ərə getmiş, bu hərəkəti ilə bəy və mülkədarları qəzəbləndirmişdir. Onlar Natəvanın ailə üzvləri arasına təfriqə salaraq, oğlu Mehdiqulu xanın evdən baş götürüb getməsinə müvəffəq olmuşlar. Şairə ömru boyu qınaq və töhmətlərdən yaxa qurtara bilməmişdir.*

*1885-ci ildə oğlu Mirabbasın xəstələnib ölməsi şairənin iztirablarını daha da artırmış, səhhəti tamam pozulmuşdur. Natəvan ömrünün axırına qədər ruhi sarsıntılar və üzüntülər içərisində yaşamiş və 1891-ci il oktyabr ayının 1-də Şuşada dünyasını dəyişmişdir. Onu böyük təntənə ilə Ağdama gətirib, "İmarət" deyilən ailə qəbristanlığında dəfn etmişlər.*

*XX əsrdə şairənin əsərləri toplanaraq bir neçə dəfə çap olunmuşdur. Bu kitabda verilən nümunələr onun "Əsərləri "ndən (1984) və "Yazıçı" nəşriyyatında nəşr edilmiş "Dahilərin göz yaşı. Mərsiyələr" (1990) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Yenə ya rəb, nə qəmgindir mənim bu şad olan könlüm,
Rümuzi-eşqdən agah olub, ustad olan könlüm.

Görübdür yari əğyarə olubdur məhvi-nəzzarə,
Edibdir sinəsin parə, mənim abad olan könlüm.

Niyə peymanədən keçdin, niyə zəncirdən qaçdın?
Nədəndir çöllərə düşdün, mənim bərbad olan könlüm?

Fəraqin ruzi-məhşərdir, sərasər möhnətü-qəmdir.
O zülfün kimi dərhəmdir, mənim azad olan könlüm.

Baxın bu Natəvan zarə, günü bəxtim kimi qarə,
Gəzər Məcnun tək avarə, mənim naşad olan könlüm.

* * *

Nə yaxşı munis idi, heyf, nagəhan getdi,
Məni bu möhnət ərə qoydu əlaman getdi.

O sərvi-nazdan ayrı baxarmı sərvə gözüm?
Hilal tək qədimi eylədi kəman, getdi.

Unutdu güllərini, qıldı xaniman tərkin,
Nə baxdı yarlərə, çəkdi olaman getdi.

Nə oldu ariz əya, bağiban, bu gülşəndə,
Açılmadı bu bahar gülləri, xəzan getdi?

Nə tapdı ləzzəti-işrət, nə gördü gülzarı,
Bahar fəslində, yaran, bu novcavan getdi.

Məni bu möhnət ərə qoydu didəsi giryan,
Bəlayi-hicrə salıb, qoydu bağrı qan, getdi.

Məzarın üstə gəlib əylənim dəmadəm, oğul,
Deyərmisən ki, nə növ ilə Natəvan getdi.

* * *

Zəmanə saldi əcəb möhnətü məlalə məni,
O mahrudən iraq verdi qəm zəvalə məni.

Tükəndi tabü təvan, ey xudayi-ləmyəzəli!
Ya tez bu canımı al, ya yetir vüsalə məni!

Sənə nə qədri dedim, rəhm qıl mənə, getmə!
Gəl indi gör ki, fəraqın salıb nə halə məni!

Nə vaxtadək qəmi-hicrində ahü zar çəkim?
Tərəhhüm eylə, gətir sən də bir xayalə məni!

Kəsildi səbrü qərarım, fəraqə tabım yox,
Rəvadı təngə gətirsin bu ahü nalə məni?

Alıbdı əqlimi sərdən, qərarımı dildən,
Edib bəlayə fələk, gör necə həvalə məni.

Təəccübəm ki, neçün rəhmə gəlmədin, zalım?!
Fəraq oduna yaxıb salmısan bu halə məni.

Nə yaxşı günlər idi kim, səninlə munis idim,
Zəmanə indi edib sinə dağlı lalə məni.

Vüsalə yetməyibən zarü Natəvan qaldım,
Edib fələk yenə həsrət o məhcəmalə məni.

* * *

Bahar əyyamıdır, açıldı güllər, ey cavan sənsiz!
Təəccübdür, nədən divanə olmaz Natəvan sənsiz?

Şamadət eyləyir düşmən mənə hər dəm və hər saət,
Mərəz artır dəmadəm, varə-varə, hər zaman sənsiz.

Nə ümidim vüsalə, nə fəraqə tabü taqət həm,
Gözümdə tirəvü tar oldu, billah, bu cahan sənsiz.

Sən əyləş hur ilə, eylə həmişə eyşü işrət kim,
Dəmadəm mən çəkim, dildən edim ahü fəğan sənsiz.

Yetişməz başə, Abbas, ömrüm axır bir tamam olsun,
Keçər hər bir dəqiqə ildən artıq, əlaman sənsiz.

Bu gün eydi-şərif oldu məgər sən bixəbərsənmi?
Güman etmə ki, işrət içrə əylənsin anan sənsiz.

Güli-ruyindən ayrı neylərəm mən gülsitan seyrin?
Edər bülbül kimi nalə bu zarü Natəvan sənsiz.

* * *

Nə mən olaydım, ilahi, nə də bu aləm olaydı!
Nə də bu aləm əra dil müqəyyədi-qəm olaydı!

Nə hicr atəşinə odlanıb yanaydı dilim ki,
Nə eşqin içrə könül böylə şadü xürrəm olaydı!

Nə sərv qəddin olaydı, nə bəsrətinlə gözüm kur,
Nə ruzgari-fəraqində qamətim xəm olaydı!

Nə bəhr olaydı, nə ümman, nə boylə göz yaşı cari,
Nə gül üzündə, ilahi, bu növ-şəbnəm olaydı!

Nə gül olaydı, nə gülzari-gülşənin dəxi seyri,
Nə xari-möhnəti-bülbül səninlə möhkəm olaydı!

Nə Misr olaydı, nə Kənan, nə həzrəti-Yəqub,
Nə xar olub qəmi-hicranda, qərqi-matəm olaydı!

Nə çah olaydı, nə zindan, nə karvan güzəri,
Nə Yusifi bu bəlada görən bir adəm olaydı!

Nə bəzm olaydı, nə bazari-Yusif əhvalı,
Nə rəhgüzərdə Züleyxa qəmlə həmdəm olaydı!

Nə ah olaydı, nə əfsus, nə parə-parə könül,
Nə Natəvanın, ilahi, həvəsi dəhrəm olaydı

* * *

Qoyubdur intizarında, neçin gəlməz, neçin gəlməz?
Həmişə ahü zarında, neçin gəlməz, neçin gəlməz?

Üzüldüm karivanımdan, el üzdüm xanimanımdan,
Fələk incir fəğanımdan, neçin gəlməz, neçin gəlməz?

Gedibdir qafiləsalar, olubdur gözlərim xunbar,
Nə bir yarü nə bir qəmxar, neçin gəlməz, neçin gəlməz?

Könüldə ahü zarını var, nə səbrü nə qərarım var,
Deməz bir düfikarım var, neçin gəlməz, neçin gəlməz?

O zülfi-nərgisi-məstə könül çoxdandı pabəstə,
Məni hicran edib xəstə, neçin gəlməz, neçin gəlməz?

Səri-kuyin gəzər könlüm, güli-ruyin sevər könlüm,
Vüsalın çün dilər könlüm, neçin gəlməz, neçin gəlməz?

Alıbdir canımı hicran, olubdur gözlərim giryan,
O məhvəş, nazənin canan, neçin gəlməz, neçin gəlməz?

Mənə hicran məşəqqətdir, fərağin dərdü möhnətdir,
Nigarım xeyli müddətdir, neçin gəlməz, neçin gəlməz?

Əzizim, göz yaşım qandır, işim fəryadü əfqandır,
O yarım harda mehmandır, neçin gəlməz, neçin gəlməz?

Yanar canım fərağından, tutar könlüm sorağından
Ki, çıxsın yar otağından, neçin gəlməz, neçin gəlməz?

Əlimdə ixtiyarım yox, gedib-səbri-qərarım yox,
Yanımda gülzarım yox, neçin gəlməz, neçin gəlməz?

Səba, ol məhliqa dilbər, alıbdır canımı yeksər,
Könül ancaq onu istər, neçin gəlməz, neçin gəlməz?

Yetibdir ərş üzə dadım, tutub dünyanı fəryadım,
Mənim ol sərvi-azadım neçin gəlməz, neçin gəlməz?

Qalıbdır Natəvan nalan, gecə-gündüz olar giryan,
Onun yox dərdinə dərman, neçin gəlməz, neçin gəlməz?

* * *

Varımdı sinədə dərdü qəmi-nəhan, ölürəm,
Fəda olum sənə, gəl eylə imtəhan, ölürəm.

Fəraqdan gecələr yatmaram səbahə kimi,
Xəyali-zülfünə bağlı gedibdir can, ölürəm.

Bahari-hüsnün əra gör necə xəzanəm mən,
Bahar laləsi tək bağrım oldu qan, ölürəm.

Vərəq-vərəq dilü can hicrin içrə odlaşdı,
Misali-kəncəfə sədparə oldu can, ölürəm.

O xaki-payini mən aşiyanə etmiş idim,
Vətəndən ayrı düşüb indi laməkan, ölürəm.

Dedin ki, çək əlini damənimdən, əl çəkdim,
Tərəhhüm eyləmədin axır, ey cavan, ölürəm.

Çəkirdim həsrətini, görmədim, xudahafiz!
Olubdur indi işim naləvü fəğan, ölürəm.

Fəda o qamətinə kim, qəza nə xoş çəkmiş,
Qədər büküb belimi, eyləyib kəman, ölürəm.

Fəraqdan tükənib tabü taqətim, billah,
Vüsalə yetməz əlim, zarü Natəvan ölürəm.

**NÖVHƏ**

Söylə Hüseynə, ey səba, Kərbübəlaya gəlməsün,
Gəlsə, düşər bu dəştidə dərdü bəlayə, gəlməsün.

Söyləginən gətirməsün Kufəyə nazlı Əkbəri,
Zülm ilə qanına batar türreyi-müşki-ənbəri.
Bəlkə Firəngətək apar cümleyi-ali-heydəri,
Zibhi-əzim üçün bu gün kuhi-Minayə gəlməsün.

Söylə gətirmə Qasimi, qatili eyləyir şitab,
Toyda olur yəqin onun qanına əlləri xizab.
Görmə rəva ki, Şümri-dun din evin eyləsin xərab,
Rəhm eyləsün o Zeynəbi-bəxti-qərayə, gəlməsün.

Gəlməyə yoxdu fürsətim, qan ilə namə yazmışam,
Öldürəcəkdi Müslümü Kufədə firqəyi-zülam.
Qardaşının uzun qolu görmə rəva ola qələm,
Bacıları ayaqyalın, dəşti-bəlayə gəlməsün.

Yetsə əgər xəbər sənə öldü bu Müslimi-əqil,
İbni-Ziyad nəşimi gərçi edibdü çox zəlil,
Qüslü hənut olmadı, oldu qənarədə qətil,
İstəmirəm, əyalını qoyma, əzayə gəlməsün.

Badi-xəzan əsər sənin qönçəsifət əyalına,
Rəhm eylə, yavərim Hüseyn, Qasimi-xoşməqalına.
Cam təsəddüq eylədim Əkbərimə, cəmalına,
Sağ ola ol imam Hüseyn, qəm üsərayə gəlməsün.

Söylə əmoğluma məni-bikəsi eyləsin həlal,
Ərzimi birbəbir elə, Ali-əbayə şəhri-hal.
İki açılmış gülüm Kufədə zari-dilməlal,
Qaldılar Əkbər ilə ol Qasim, hərayə gəlməsün.

Həsrətəm ol cəmalına, ah çəkim bu sinədən,
Kufədə vardu qatilin, gəlmə həzin Mədinədən,
Qoyma yetim Xədicəni ayrı ola Səkinədən,
Başına əl çək, ağlayıb şuri-nəvayə gəlməsün.

Söylə onun anasına başını qarə bağlasın,
İki baladən ayrılıb, kövni-məkanı dağlasın,
Tutsa əza, Xədicədən söylə ki, gizli ağlasın,
Bəlkə yetimliyin tozu mahi-liqayə gəlməsün.

Fatimənin kənizi, bu qissəni eylə kim, tamam,
Bir-birə dəydi mərdü zən, şurə gəlibdü xasüam.
Növhə edər bu Natəvan, ruzü şəb ağlayar müdam,
Tapmasa bir dəri-nicat, dari-bəqayə gəlməsün.

## MİR MÖHSÜN NƏVVAB

*Azərbaycan mədəniyyəti tarixində görkəmli musiqişünas, rəssam, xəttat, nəqqaş, tarixçi, ədəbiyyatşünas və şair kimi tanınan Mir Möhsün Nəvvab Qarabaği 1833-cü ildə Şuşa şəhərində anadan olmuş, bütün ömrünü orada yaşamışdır. Mədrəsə təhsili almış, ərəb, fars dillərini öyrənmiş, fitri istedadı sahəsində riyaziyyat, kimya, nücum, coğrafiya, tarix, musiqi və s. elmlərə yiyələnmişdir. O, Şuşada yeni üsulla məktəb açmış, şagirdlər üçün dərslik yazmışdır. 86 il ömür sürən Nəvvab 1919-cu ildə Şuşada vəfat etmişdir.*

*Nəvvabın zəngin irsinin bir qismi onun şeirləridir. XlXəsrin 70-ci illərində Şuşada "Məclisi-fəramuşan" ("Unudulmuşlar məclisi") ədəbi məclisini təşkil edən Məvvab özü də klassik üslubda lirik şeirlər yazmış, divan yaratmışdır. Bu divan 1999-cu ildə Bakıda, "Şuşa" nəşriyyatında çap olunmuşdur. Buradakı şeirlər həmin nəşrdən götürülmüşdür.*

### QƏZƏLLƏR

Hicrani-yar eylədi halü dilim xərab,
Suzi-dərunim etdi cahan əhlini kəbab.

Könlüm quşunu gör, necə püriztirabdır,
Ol dami-zülfi-ənbərə düşmüş məgər üqab?

Dərdi-fəraqinlə tökər əşk gözlərim,
Mirab nə etdi böylə ki, təqdir edər gülab?

Zahid məni o mahivəş eşqində mən edər,
Pabənd olur o xalü xətti görsə şeyxü şəab.

Et bərkənar zülfünü ol ruyi-mahdan,
Ta infəal eyləyə bir göydə afitab.

Bir qəmzə ilə cilvəgər ol mahvəşlərə,
Ta münfəil olub - deyə, ya "ləyütə"ni türab.

Nəvvabi-zarə eşq yolu münhərif olub,
Nuri-rüxünlə göstər ona bir rahi-səvab.

* * *

Qərqi-dəryayi-qəm oldum, ey xudaya, dadə yet,
Qüssədən gül tək saraldım, ey xuda, fəryadə yet.

Qönçə tək qan oldu bağrım gülüstani-dəhridə,
Gül kimi pəjmürdə oldum, ey xudaya, dadə yet.

Bülbüli-şeyda kimi naləm cahanı çulğadı,
Gül səfasın görməmiş öldüm, ey xuda, fəryadə yet.

Badə vəslilə sərşar olmadım sağər kimi,
Əşki-xunin ilə doldum, ey xuda dadə yet.

Bir gülüzlü yar vəslin görmədim Nəvvab tək,
Cövri-əğyar ilə soldum, ey xuda, fəryadə yet.

* * *

Qəmi-hicrində bimarəm mən, ey dost!
Zəlilü acizü zarəm mən, ey dost!

Gecə-gündüz çəkib rəncilə zəhmət,
Gözümdə uyqu yox, bidarəm, ey dost!

Cəhanın əhlinə çox-çox əzizəm,
Hüzurunda neçün bəs xarəm, ey dost!

Sənin eşqində, ey şuxi-dilaram,
Fəğanü ahilə xunbarəm, ey dost!

Qalıb Mənsur tək dari-sitəmdə,
Həyatımdan belə bizarəm, ey dost!

Olubdur bülbüli-şuridə Nəvvab,
Giriftari-qəmi-didarəm, ey dost!

* * *

Hər zaman gül yüzünü mürği-ravan eylər yad,
Bülbülü bismilü şuridə kimi eylər dad.

Sənin eşqində mən, ey şəkkərü şirin hərəkat,
Çaparam dağı, daşı necə çapıbdır Fərhad.

Gecələr əşki-qəmə qərq oluram sübhə kimi,
Sübhlər şamə təki eylərəm ahü fəryad.

Mən necə şad olub meyli-gülüstan edim,
Xaneyi-səbrimi hicranın edibdir bərbad.

Eşq oduna o zamandan ki, düşübdür Nəvvab,
Olmayıb bircə zaman möhnəti-qəmdən azad.

* * *

Zindani-qəmdə oldu günüm qarət ağlaram,
Sövdayi eşqində çəkib zillət ağlaram.

Zülfün havası ilə olub tirətər günüm,
Qalü bəlada hicrin olub qismət, ağlaram.

Ahimlə dövri-şəmsü qəmər halə bağlayıb,
Bir dəm sənlə eyləmədim söhbət, ağlaram.

Bülbül kimi nəvayə gəlib eylərəm fəğan,
Hicri-rüxündə oldu kəman qamət, ağlaram.

Ahü fəğanım ərşə çıxıb, dilbəra, nə edim?
Sənsiz məni əhatə edib möhnət, ağlaram.

Kuyində sərfəraz olubdur rəqiblər,
Edirlər hər zaman mənə min töhmət, ağlaram.

Əncümşümar olubdu fəraqində gözlərim,
Yadi-vüsalınilə çəkib həsrət, ağlaram.

Nəvvab tək alıbdı əlimdən təvanımı,
Bitaqət eyləyibdi məni firqət, ağlaram.

## MÜRƏBBƏLƏR

Bir nigarı istərəm aləmlərin əlasıdır,
Ruzgarın bağı içrə novgüli-rənasıdır,
Can ona qiymət degil, qiymətlərin ədnasıdır,
Çünki bu sövdayi-kamili-gülrüxan sövdasıdır.

Nazilə nazik baxanda dinü imanı alır,
Oəmzəsi ahənrüba tək cismdən canı alır,
Qiyməti-ləli-ləbi İranü Turanı alır,
Çünki bu sövdayi-kamili-gülrüxan sövdasıdır.

Xalü xəttü tələti firdövsi-əlaya dəgər,
Qaməti-şümşadi min-min sərvi-tubaya dəgər,
Zülfünün hər tarı yüz Leylavü Əzrayə dəgər,
Çünki bu sövdayi-kamili-gülrüxan sövdasıdır.

Zahida, bu biz degil kim, əlli qat başa qoyub,
Şiydü salusi ilə biçarə əvamı tovlayub,
Ac qurd kimi cəmiən pul, malını soyub,
Bəlkə bu sövdeyi-kamili-gülrüxan sövdasıdır.

Yox məlaməti-aşiqi-biçarə gər candan keçə.
Bir belə canan yolunda xanimandan keçə,
Bu degil halva ki, molla dinü imandan keçə,
Bəlkə bu sövdayi-kamili-gülrüxan sövdasıdır.

Bu degil yaqutü almasü zəbərcəd zivəri,
Hər dənizadə alıb zinət, verə duşü bəri,
Bu gedil dinarü dirhəm kim, yığa hər sərsəri,
Bəlkə bu sövdayi-kamili-gülrüxan sövdasıdır.

Yoxdur insaf sənə, Nəvvab bir etməz nigah,
Bülbüli-şeyda kimi gər edəsən əfqanü ah,
Kəbəyi-kuyində ömrün mayəsin etsin təbah,
Çünki bu sövdayi-kamili-gülrüxan sövdasıdır.

* * *

Bir nigari-novbaharın gül camalın istərəm,
Lölöyi-tər tək camalı üzrə xalın istərəm,
Cuybari-hüsn ara, şəkkər zülalın istərəm,
Mey içib məstan gəzən çeşmi-ğəzalin istərəm.

Aşiqin tərk eyləyib, amma özü məstan gəzər,
Naz edər hər dəm rəqibə bağ ara şadan gəzər,
Yadına bilmərrə düşməz, əhdilə peyman gəzər,
Bir belə insafsız yarın vüsalın istərəm.

Yarını həsrət qoyub aləm ara xar eyləyən,
Sındırıb iqrarını firqətdə bimar eyləyən,
Şad edən əğyarını hər ləhzə təkrar eyləyən,
Gərdəni-mina, qəddi-Tuba misalın istərəm.

Rovzeyi-hüsn içrə guya ahuyi-tatardır,
Xali-mişkini zənəxdanında ənbərbardır,
Ləbləri gül, dişləri həm lölöyi-şəhvardır,
Bir belə rəna ğəzalin, xəttü xalın istərəm.

Bülbüli-şuridə tək cəh-cəh uran, dad eyləyən,
Məst olan, tavus tək məstan geyib, məstan gəzən,
Aşiqini görcəgin tərlan kimi gərdən çəkən,
Naz edən nazikbədən tuti məqalın istərəm.

Bağı-gülzar içrə ahu kimi hər yanə baxan,
Etinalar eyləyib əğyarə naz ilə axan,
Aşiqi-zarın dilini nari-hicranə yaxan,
Dərgahi-pakində əğyarın zəvalın istərəm.

Əl çəkib Nəvvabdan, yarəb, o yari-bivəfa,
Nazilən eylər ona hər ləhzə min cövrü cəfa.
Bir deməz biçarə məndən görmədi zövqü səfa,
Rəm yeyən, ram olmayan vəhşi ğəzalin istərəm.

## NÖVHƏ

Eylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir?

Ey camaət təşnəsüz, çün mütəhhər qanıma,
Razıyam yüz min bəlalar, gər yetişsə canıma,
Ruhumu lahutdə bəzl etmişəm cananıma,
Aləmi-ünsürdə bu sevda nədir, səfra nədir?

Mən vətəndən ol zaman kim zari-giryan köçmüşəm,
Şövq ilə canan yolunda başü candan keçmişəm,
Aləmi-mənada mən cami-şəhadət içmişəm,
Aləmi-zəhirdə bu mina nədir, səhba nədir?

Giryanam eşq atəşinə, şaiqəra Musa kimi,
Payi-darə çəksəniz, min kəz əgər İsa kimi,
Başımı qət eyləsəz hər dəm əgər Yəhya kimi,
Nuş candır, bilmənəm xəncər nədir, əda nədlr?

Eylərəm təkrar "Ərni" çünki adətdir mənə,
Gər eşitsəm "Ləntərani" çox qənimətdir mənə,
Dustdən yüz min bəlalər eyni-ləzzətdir mənə,
Bu şəhadət vadisidir, "Lən" nədir, "Ləmma" nədir?

Mən gərəkdir kim, bu gün vasil olam cananimə,
Min sinanü tiğü xəncər gər yetişsə canimə,
Bu mühasinim gərəkdir kim, bata al qanimə,
Azimi-dərgəhi-yarəm, bilmənəm dünya nədir?

Bu şəhadətdə gərək babamə təqlid eyləyəm,
Dəstəmazimi bu gün qan ilə təcdid eyləyəm,
Səcdədə məbudimi təhmidü təmcid eyləyəm,
Sacidə məscid nədir, məbəd nədir, səhra nədir.
Min qəmü möhnət ara saldız bu şahi-bikəsi,
Şeşdəri-heyrətara saldız bu şahi-bikəsi,
Qərqi-dəryayi-fəna etdiz bu şahi-bikəsi,
Dəxi bir biyar üçün bu şurü bu qövğa nədir?

Yarü ənsarım gedib biyarü yavər qalmışam,
Bu bəla dəştində mən zarü mükəddər qalmışam,
Nimi-besməl quş kimi bibalü bipər qalmışam,
Gülşənim tarac olub, bülbül nədir, şeyda nədir?

Ərğəvan kimi boyanmış Qasimi-gülpeykərim,
Sərviqəd qardaşlarım, gülüzlü nazlı Əkbərim,
Qönçəvəş pürxun düşüb xakə Əliyyi-Əsğərim,
Bilmənəm sünbül nədir, susən nədir, rəna nədir.

Ya Hüseyn, ey xaki-payın aləmin başına tac,
Ey şəhadətləri verən İslam dininə rəvac,
Etgilən Nəvvabi-zarın dərdü zarinə əlac,
Cəzb qıl ta bilməsin dünya nədir, üqba nədir.

## MİRZƏ MƏHƏMMƏD KATİB

Mirzə Məhəmməd Məşədi Bayram oğlu Katib 1833-cü ildə Şuşada doğulmuşdur. Təhsilini mollaxanada almış, mahir xəttat olmuşdur. "Məclisi-fəramuşan"ın yığıncaqlarında fəal iştirak edən Katib müasirləri ilə yaxın dostluq münasibətləri saxlamış, onların bəziləri ilə məktublaşmışdır. Şair 1888-ci ildə vəfat etmişdir.

M. M. Katib şeirlərini həm klassik üslubda, həm də aşıq şeri tərzində yazmışdır. Əsərlərindən nümunələr bəzi təzkirə səhifələrində qalmaqdadır. Buradakı şeirlər Mir Möhsün Nəvvabın təzkirəsindən və "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.

### QƏZƏLLƏR

Vücudun olmasa, heç olmasın bahar, ey dust,
Üzündən ayrı nədir seyri-laləzar, ey dust?

Məqami-eyşdə tut bir əyaq ilə əlimi,
Məni əyağə salıbdır bu ruzigar, ey dust.

Bu şuri-eşqdə dövri-müxalifi-gərdun
Nə edəcək mənə, lütfün ola həsar, ey dust?

O tari-zülfə, aman, urma şanə, tarıya bax,
Ki, könlüm aşiyanəsidir, etmə tarmar, ey dust.

Əgər o qaşlarını əyri tiğə oxşatsam,
Görüm, məni kəsə hər ləhzə zülfüqar, ey dust.

Öləm, mənimlə gedər qəbrə atəşi-eşqin,
Rəqiblə gəzəsən, od tutar məzar, ey dust.

Bu qəddü qamət. ilə bağa gər xüram edəsən
Ki, payi-bəndin olu sərvi-cuybar, ey dust.

Məni çevir başına, öldürüb xilas eylə,
Bu həsrət ilə qoyma intizar, ey dust.

Şəbani-hicrdə Katib nə qədər intizar çəkib,
Nə vəqtədək olacaq çeşmi əşkbar, ey dust?

* * *

Gün səni görmək ilə çərxdə avarə düşüb,
Sər büröhnə o səbəbdən dərü divarə düşüb.

Yerdə ol şuxi görüb, çərxdə baxdım qəmərə,
Deyəsən, parələnib məh, yerə bir parə düşüb.

Vaiza, mən eləmə, zülfünə meyl etsəm əgər,
Bu belə əsrdi, islam işi küffara düşüb.

Lalə bağrına çəkib dağ görüb gül üzünü,
Xiclətindən qaralıb, daməni-kuhsarə düşüb.

Nisbəti yox sənə ayın ki, onun vəchi budur,
Əksi-ayinə üzündən göyə bir parə düşüb.

Eşq bimarı olan aşiqə çün baxdı təbib,
Qəmzeyi-nərgisi-bimarın ona çarə düşüb.

Buyi-zülfün eşidib badi-səbadən nagəh,
Ondan ötrü bu çölə Katibin avarə düşüb.

* * *

Mürği-dil aşiq olub qaməti-rənayə baxar,
Qumriyi-sərv kimi sərvi-düarayə baxar.

Dəyişib halını ol zülfi-müənbər, nə deyim,
Nə bu əhvalə, nə başımdakı sövdayə baxar.

Məni zünnarpərəst etdi xətakar gözüm,
Bəli, Sənan olu hər kim ki, o tərsayə baxar.

Yar olağında barı surəti-divar olasan,
Xoş onun halına kim, surəti-zibayə baxar.

Eyd olur aşiqə əbruyi-hilalını görə,
Rəsmdir, çünki camaat yığılıb ayə baxar.

Aşiqin görsə səni, taqəti-didar olmaz,
Necə tab eyləyə bir göz ki, təcəllayə baxar?

Nə yazım şeir, yenə Katibi-bimar oldum
Kim, xəyalilə gözüm nərgisi-şəhlayə baxar.

* * *

Sərimdə şövqı-zülfi-ruyi-gəncə şahmarım var,
Gecə-gündüz ilan çalmış kimi çox ahü zarım var.

Piyadə rahi-eşq içrə dolandım, gərçi mat oldum,
Dəxi bir kimsəyə rux tutmanam, bir şəhsuvarım var.

Nəsihət vermə, vaiz, tağı-əbru qibləgahimdir,
Mənim bu tağı-mehrabilə aləmdə nə karım var?

Mühəqqsqdir ki, səndə Leylidən artıq vəcahət var,
Cünunluqda mənim Məcnundan artıq iştiharım var.

Çalışma, ey əcəl, nahəq yere, cau verməndəm, billah,
Gərək yarım gələ, ta tapşıram can, intizarım var.

Yuxuda bulsa etmək ayrılıq təbiridir, guya,
Kənar oldum, yuxuda görmüşəm, busü kənarım var.

Kənar etmə məni, ölsəm də mən, səndən kənar olmam,
Qübari-məqdəminçün yol kənarında məzarım var.

Məzarım aç, sərimdən çıxmayan şövqi-xətü zülfin.
Görərsən, kaseyi-sərdə mücəssəm murü marım var.

Məzarım üstünə gəl, qoyma təmiri-həsar olsun,
Təriqi-eşqdə səngi-məlamətdən həsarım var.

Nəzərdə gərçi xarəm, bir gədayəm, Katibi-zarəm,
Əzizi-Misri izzət, padşahi-tacdarım var.

* * *

Hiç aşiq maili-zülfü zənəxdan olmasın,
Dəhrdə divaneyi-zənciri-zindan olmasın.

Mən çəkən möhnətləri aləmdə kafər çəkməsin,
Küfri-zülfün görməsin, halı pərişan olmasın.

Gün qabağında, amandı, əzmi-cövlan eyləmə,
Sayə tək zülfün yenə xakilə yeksan olmasın.

Badə vermə zülfünü, hər ləhzə lərzan eyləmə,
Mənzili-şami-qəriban onda viran olmasın.

Şanə urma zülfünə, dünyanı zülmət eyləmə,
Katibin sövdasın artırma, pərişan olmasın.

## QOŞMALAR

Səhər-səhər durub qıya baxanda,
Düşgünüyəm mən o ala gözlərin.
Badə nə lazımdı, sevdiyim, mənə,
Məst eyləyib o piyalə gözlərin.

Qəmzeyi-cəlladın nə xunxar imiş,
Canım alan, bəlli, sitəmkar imiş,
Bu zalımda nə fitnələr var imiş!
Salar məni haldan-hala gözlərin.

Sən gözəlsən, bədrlənmiş ay kimi,
Mən aşiqəm, göz yaşım var çay kimi,
Əyilmişəm qaşın kimi, yay kimi,
Qəddimi döndərib dala gözlərin.

Zülfün aldı bu şikəstə könlümü,
Eylədi tarına bəstə könlümü,
Mən istəməm dəxi xəstə könlümü,
İndi nə var məndə ala gözlərin?

Hər zaman çəkərəm yüz min ahü zar,
Nə rəhmin var cana, nə mürvətin var.
Katib olub hicrində zarü əfkar,
Nə rəvadır gözdən sala gözlərin.

* * *

Sevgilim, mən sənin bəndivanınam,
Sən gəzirsən naməhrəmlər içində.
Gözəl idin, gözəl adın var idi,
Bədnam oldun möhtərəmlər içində.

Dost yanında yaxşı sözüm ötmədi,
Səri-zülfün şövqü sərdən getmədi,
Ömrüm keçdi, əlim yara yetmədi,
Can üzüldü dərdü qəmlər içində.

Gözəllikdə sənə olmaz qərinə,
Qoymaq olar səni huri yerinə,
Sənsiz əgər girsəm xüldi-bərinə,
Guya qallam cəhənnəmlər içində.

Qaşın kimi olmaz çərxin hilalı,
Əydi məni əyri zülfün xəyalı,
Əlif qəddim qəbul eylədi dalı,
Məşhur oldum qəddi xəmlər içində.

Sənan kimi ollam aşiqi-rüsva,
Əğyarı bəyəndi zalimi-tərsa,
Katibəm, neyləyim katibi-qəza,
Yazdı məni bəxti kəmlər içində.

* * *

Badi-səba, mənim ərzi-halımı,
O vəfalı yara dedin, nə dedi?
Eşqi sevdasında dərdi-sərimi,
Gözləri xumara dedin, nə dedi?

Çoxlar siyah zülfün sərgərdanıdır,
Pərişan zülfünün pərişanıdır,
Könül o zəncirin bəndivanıdır,
Uyubdur şahmara dedin, nə dedi?

Aşiqlərin bikamalı deyiləm,
Sirri-dəhanından hali deyiləm,
Xalı görüb dərddən xali deyiləm,
Dərdimizə çara dedin, nə dedi?

Bir ah çəkim, yansın baği-zəmanə,
Rəqiblərin rəngi dönsün xəzanə,
Sən o şux tərlana, ruhi-rəvanə
Uymasın əğyara dedin, nə dedi?

Mənim getməz ürəyimin qubarı,
Onun həmsöhbəti, kim oldu yarı?
Bir yada salmadı Katibi-zarı,
Saldı ahü zara dedin, nə dedi?

## MƏMO BƏY MƏMAİ

Məmo bəy Hacı Əhməd oğlu Məmai 1834-cü ildə Şuşada doğulmuşdur. Təhsinini Şuşada almış, ticarətlə məşğul olmuşdur. Görkəmli yazıçı-dramaturq Əbdürrəhim bəy Haqverdiyevin dayısıdır. "Məclisi-üns "ün fəal yə görkəmli üzvlərindən idi. O, sənətilə əlaqədar Rusiya, Orta Asiya, Türkiyə yə İranın bir çox şəhərlərini gəzmiş, aldığı təsssüratı, gördüyü şəxslərdən eşitdiklərini qələmə alaraq "Səyahətnamə" adlı əsər yazmışdır. Lakin həmin əsər hələlik əldə edilməmişdir.

Şair 1918-ci ildə Şuşada vəfat etmişdir.

Əsərlərini klassik üslubda, Azərbaycan və fars dillərində yazan Məmainin bədii irsindən xeyli nümunə qalmışdır. Buradakı şeirlər "Poetik məclislər" (1987) kitabından götürülmüşdur.

### QƏZƏLLƏR

Ey gözüm nuri, qarari-düi-ürfan, getmə,
"Məhfili-üns" sənin canına qurban, getmə.

Sən ilə gülşəni-ümmiddə güllər açılır,
Qönçə tək etməgilən, gəl, ürəyin qan, getmə.

Sən ilə cəm idi bu silsileyi-alinəsəb,
Etmə bu silsiləni bari pərişan, getmə.

Gər tulu etməsə Xurşid camalın bir dəm,
Olu zülmətkədə bu Şişeyi-viran, getmə.

Olmasın nərgisi-bimarın bu dəm bimar,
Qılma bu dideyi-giryanımı giryan, getmə.

Yetsə hər dərd sənə ver məni-məhzunə onu
Kim, sənin dərdin olur dərdimə dərman, getmə.

Ziynəti-bəzmi-məhəbbətdi sənin göftarın,
Olma xamuş ki, xamuş olu yaran, getmə.

Təkyə qıl balışı-izzətdə, otur izzət ilə,
Mən hüzurunda olum türfə qəzəlxan, getmə.

Səninləndir sərü samani Məmai zarın,
"Məhfili-üns"ü qoyub bisərü saman, getmə.

* * *

Neyləyim, cövr eləyir çərxi-cəfakar mənə,
Göndərib hər nə qədər cövr, sitəm var, mənə.

Bəxt tək üz çevirib məndən, əzizani-cahan,
Taleim olmadı bir ləhzə mədədkar mənə.

Qoymadı dəhrdə bir dəm göz açım, iqbalım,
Necə iqbal? Sərasər olub idbar mənə.

Qəmküsarım nə qədər var idi, yeksər getdi,
Deməyə dərdimi yox bircə nəfər yar mənə.

Qalmışam Şişədə, daş içrə qalan şişə kimi,
Ləl tək qan yedirib çeşmi-gühərbar mənə.

Harı ol zövqü səfa, əhli-vəfa yığnağı?
Qalmayıb dəhrdə bir munisi-qəmxar mənə.

Ey Məmai, gedib ərbabi-vəfa aləmdən,
Xəlqdən indi yetir zəhmətü azar mənə

* * *

Bir bikəsi-zarəm, vətənimdə vətənim yox,
Bir bülbüli-bibalü pərəm, vay, çəmənim yox!

Mən sahibi-hər məcməi, hər əncümən oldum,
Əfsus, nə bir cəm, nə bir əncümənim yox.

Viranə qalıb "Məhfili-üns"üm, dağılıbdır,
Nə yar, nə qəmxar, nə bir həmsüxənim yox.

Bir guşeyi-bağ içrə qalıb bikəsü tənha,
Nə bir soran əhvalımı, nə bir gələnim yox.

Əfsus, bu məxluq hamı kurü kar olmuş,
Nə bir görənim var, nə bir dilbilənim yox.

Xunabi-ciyər caridi gözdən gecə-gündüz,
Ruxsara axan göz yaşımı bir silənim yox.

Göz ilə qulaqdan çəkərəm zəhməti-bihədd,
Ruhani əziyyətlər üçün tabi-tənim yox.

Bir yanda vətən təhlükəsi canımı almış,
Bir fəhra edənim, anlayanım, dərk edənim yox.

Ərbabi-kəmalat zamanı getdi, Məmai,
Qaldım bu bəla dəştdə, imdad edənim yox.

* * *

Vəh, necə kəc gərdiş eylər çərxi-kəcrəftar kəc!
Əsr gəcdir, dövr gəc, dövrani-bədkirdar kəc.

Doğruluq mədum olubdur mərdümi-afaqdən,
Qövl kəc, əfal kəc, kirdar kəc, güftar kəc.

Qalmayıb dadüsitəd əhlində əsla düz əməl,
Müştəri kəc, sudkəcdir, taciri-bazar kəc.

Rastlıqdan döndərib üz cümlə mollavü keşiş,
Xirqə kəc, əmmamə kəc, təsbeh kəc, zünnar kəc.

Şeşdəri-heyrətdə mat etmiş məni nərradi-çərx,
Bağlayıb şeş xanə, oynar, pənc kəc, həm çar kəc.

Hiyləvü təzvirü məkrilə riya xəlqi işi,
Qövm kəcdir, xiş kəc, əbbab kəc, əşraf kəc.

Nə diyanət, nə əmanət, nə sədaqət, nə vəfa,
Görmədim bir düz əməl, gördüm nə qədri var kəc.

Ey Məmai, hər nə yazsan doğruluqdan yazgilən,
Söyləmə güftari-kəc, yazma belə əşari-kəc.

## MUXƏMMƏS

Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Hanı ol gecə-gündüz zövqü səfa, işrət idi?
Hanı ol gün ki, sərapa hamıya ləzzət idi?
Hanı ol əhdü vəfa əhli ki, həmsöhbət idi?
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Noldu əxlaqi-həsən, sahibi-yarani-qədim?
Noldu ərbabi-sədaqət, hanı ol təbi-səlim?
Yox idi kimsədə əsla rəvişi-divi-rəcim,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Hamı ol bəzmi-səfa, noldu o ərbabi-vəfa?
Oxunurdu gecə ta sübhə kimi şurü nəva,
Yox idi kimsənədə dərdü ələm, qəm əsla,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Malü can eylər idi sərf o yarani-əziz,
İrzü namus edib hifz rəfiqani-əziz,
İkilik yox, görünürdü hamı bir cani-əziz,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Hər kəsin var idi, sərf eylər idi simü zəri,
Bir-birindən yox idi hiç kəsin bir kədəri,

Yox idi hiç kəsin möhnətü qəmdən xəbəri,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Şimdi bu şəhrdə bir əhli-sədaqət yoxdur,
Bu qədər xəlqdə bir mərdi-dəyanət yoxdur,

Nə mürüvvət, nə vəfa, əhdü-əmanət yoxdur,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun,

Mən səyahət elədim aləmi çox ləzzət ilə,
Gördüm ərbabi-kamalatü hünər, hörmət ilə,
Görmədim hiç kəsi dərdü qəmü möhnət ilə
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Şimdi məxluq olub əhli-qərəz, hasidi-dun,
Kizbü böhtanü riya xəlqi edib zarü zəbun,
Yoxdu bir yar deyim dərdi-dilim ona künun,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Yoxdu, yarəb, görəsən Şişədə bır əhli-kamal?
Oturub aqibəti-karı edə bircə xəyal,
Qoymuya milləti-islamın ola əmri mahal,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Şimdi olmuş cühəla firqələri rəhbərimiz,
Cahilü nakəsü naəhl olub sərvərimiz,
Gizlənibdir üləma, əhli-qələm, hər birimiz,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Dövreyi-çardəhhomdur qəmərin dövranı,
Nə yaman dövrdi, dərhəm elədi dünyanı,
Məhv edib cövrü cəfa, zülmü sitəm hər yanı,

Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Qəmlərdir bu iki firqə, bu övladi-vətən,
Bir-birilə dolanırdı necə kim, can ilə tən,
Nə kudurət, nə ədavət, nə qəmü dərdü mihən,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Ermənilərlə müsəlman çalışıb leylü nahar,
Qıldılar səy ki, abad ola bu mülkü diyar,
Nə gözəl olmuş idi mülki-vətən axir kar,
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Ah, o gündən ki, bu gülüstana gəlib neçə qürab,
Verdilər səs-səsə avaz eyləyib misli-kəlab,
Bu gözəl gülşəni onlar elədi boylə xarab,
Payimal oldu vətən gülləri, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Rumdan Qafqaza üz qoydu axır daşnaqiyun,
Düşdü ortalığa aşübü bəla, fitnə, cünun,
Bu qədər qanlara bais olar oldu əknun,
O axan qan, o gedən canlara əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Saldı fürsət əlinə düşmənü əğyari-vətən,
Qıldı tədbir ki. aşub ola əşrari-vətən,
Gör nə xunxar elədi xəlqi bu xunxari-vətən,
Bir deyən olmadı bu qanlara əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Tarümar oldu vətən gülşəni, pamal oldu,
Bülbülani-vətən avarə qalıb, lal oldu,
Bir deyən olmadı, "yarəb, niyə bu hal oldu?"
Düşdü yadıma keçən günlərim, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Əyyühel-qövm, kifayətdi bu qəflət, bəsdir,
Tarümar oldu vətən, bəsdir ədavət, bəsdir,
Bu qədər bəsdir həqarət, bu rəzalət bəsdir,
Bir çəkin bari xəcalət, deyin: əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Şimdi aləm yığışıb səy edər azad olsun,
Ki, gərək bir-birinə xəlqdən imdad olsun,
Qalmasın zülmü sitəm, evləri abad olsun,
Bu qədər zülmü sitəmlər olub. əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Bir baxın dumda nə fəryad edərdi vükəla,
Sizdən ötrü bu qədər səy edərdi üqəla,
Verməyin düşmənə fürsət, dəxi bəsdir, cühəla,
Siz də bircə ayılın, söyləyin əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Vətən övladı gərəkdir çəkə dərdi-vətəni,
Ta qəbul eyliyə hər cövrü cəfavü mühəni,
Ola möhkəm bu məmalikdə fəlah əncüməni,
Söyliyə, keçmiş olan işlərə əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

İndi vacibdi verin əl-ələ, ey əhli-vətən,
İndi lazımdı həmavaz ola mürğani-vətən,
Qoymaya gülşən ara məskən edə zağü zəğən,
Soyulur bülbüli-can, ah, səd əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

Ey Məmai, elədi diltəng səni tərhi-süxən,
Yuxudan indi açıb gözlərini əhli-vətən.
Bir deyən varmı nədən ötrüdü bu zülmü fitən,
Yuxudan göz açıban seyr elə, əfsus olsun,
Bizi məyus edən dəhrdə məyus olsun.

## MİRZƏ NƏSRULLAH BƏY DİDƏ

Şeirlərini "Didə" təxəllüsü ilə yazan Mirzə Nəsrullah bəy Qurbanbəyov XlX əsrdə yaşamış istedadlı şairlərdən biridir. Onun doğum tarixi məlum deyil. İlk təhsilini Şamaxıda almış, sonra Təbrizə gedərək, mədrəsədə oxumuşdur. Şamaxıya qayıtdıqdan sonra şəhərdə mirzəlik etmiş, ömrünün sonlarında isə məktəbdarlıqla məşğul olmuşdur. Didə 1870-ci ildə Şamaxıda vəfat etmişdir.

Didənin şeirləri tam halda əldə yoxdur. Onun əsərlərindən bəzi nümunələri Salman Mümtaz 1928-ci ildə Azərnəşrdə çap etdirdiyi "Mirzə Nəsrulla bəy Didə" kitabında vermiş, 2004-cü ildə şairin həmin nümunələr əsasında hazırlanmış "Bahariyyə" adlı şeirlər toplusu Bakıda çapdan çıxmışdır. Buradakı örnəklər həmin kitabçadan götürülmüşdür.

### QƏSİDƏ

Xəyalü fikrə gətir şeşi-cəhət dünyani
Təvir eylə cəmiyyən caham-imkani.

Xəyali-dairəsin hərgız cahanə çəkib
Miyani-aləmi gəz diqqətanə hər yani.

Kamali-elminə çatdın o dəm mühəqqəq olur
Təmami-rəncü qinadır təmamisi fani.

Qərəz, bu faniyədə mənzili-bəqa qılmaq
Kamali-eyni xətadır dəlili nadani.

Həmin bu mənzili-dünya mürur mənzildir
Düşən kimi gedəsən, çün rəvani-ruhani.

Nəinki burda əsasi-qəbilələr qoyasan
Tədarükati-mərtəb muradi-tulani.

Xəyal eyləsənə masabiq qəbilələri
Sənə bəyan qılım birbəbir, görək hani.

Neçə sənədir aləmi-cəhanə gərdiş edib
Alıb gəzib-dolanıb ta fəzayi-zülmani.

Neçə kəyani-şahənşah vücudu xakə dönüb
Qubari-dəşt olub padişahi-Sasani.

Neçə-neçə başi gühərnigar sahibi-tac
Şahənşahın başı olmuş ləhdidə pünhani.

Dəfin xak olub dövlətilə sən Qarun
Həzar badə gedib xeyməyi-Süleymani.

Hanı şərareyi-aləmi-əsasi-Çingiz
Ki qətli-ami-moğol dağıtdı dünyani.

Nə oldu Nadir, Keyfi satan gövhərtac
Ki fəth qılıb alıb hind ilə Dağıstani.

Çıxartdı Rum ilə qeyri-zəmin-İrandan
Nə saf qıldı cədidən fəzayi-İrani.

Neçə vəzirü müşir ki, həlqeyi-fikri
Fələkdə bəndə çəkə xuni-fəşan keyvani.

Neçə həkimi-müəssis fühuli-danişmənd
Fəzayi-alələmə gəlmış, xüsusi yunani.

Neçə alimü müdərris dəqiqi-şərhi-aləm
Mülki-Tahir edib mədh edə bu insani.

Neçə lətif süxənvər, bəliği-vaizlər
Fəsahəti unuda, laf-bafi-səhbani.

Neçə təbib müdəqqiq ki, şəmsdən gövhər
Üsuli-şivələrilə sədayi-həmmani.

Neçə şəbih dolur hiz bir sahibi-tağ
Qılafi-qəbrə gedib tiğuş töküb, qani?!

Neçə cəmilə-camalü bədiyyə-ayinənur
Ki hüsnü məhv qıla dilbərani-kən, anı.

O ləbdülər nə qədər lalərəng zibalar
Bitibdi qədrinin üstə şəqiqi-nümani.

Xülasə, silsiləyi-kainat hər fərqə
Gəlib durub keçinibdir gədası ya xani.

Qılıbdı ziri-ləhdidə solub təğfin edib
O şux nərgisi gözlər o rəngi-rəmani.

Qərargah degildir bu dəhr-viranə
Duşlək eyləməz əsla əqval-viranə.

Cahan faniyədir, balbədahə muyasi
Zəmanə hadisədir müntəha hərəmani.

Əgərçi zahiri zordur, tələzzizi şirin
Və leyk xanei-zənburdur - bəla kani.

Məəttələm ki, neçün nitqü əql ilə insan
Təcrid eyləyə bilməz məqami-heyvani.

Eşşək ki cümlədə nafəhmdari-həqiqətdir
Vəli, təfəhhüm ediyor çox dəqiq əmmani.

Deyəndə çoş, yerir, çoş desən, dayanı-durar,
Ki, nəsibü cəzm bulur elmi-nəhvi-ünvani.

Əcəb bu natiqi-insan əməldə kahaltər
Təmyiz eyləyə bilməz təriqi-ürfani.

Xülasə, mətləb odur, ey kirvə əhli-bəşər,
Gərəkdi arif ola müddəi imani.

Nə aldadıbdı səni cifəhayi-darqürur,
Nə çox fəribə çəkibdir həvayi-nəfsani?!

Beş-altı aqça səni eyləyib nə çox məgrur,
Fərəh-fərəh nə yerirsən çü mürğı-Tehrani?!

Beş-altı gün də dayan nagəhan məsid-qəza
Gəmişdirir canına bil məmati-tərlani.

Yetişdi, aldı vücudun, dağıtdı tüklərini
Büküldü bir kəfənə, get görək o pul hani?!

Aya qəniyyül-əyyamü, nəbirəyi-Qarun
Nə hərisdir bu qədər cəmi mali-dünyani.

Nə şövqdür bu qədər şaiqi-imarətsən
Sipehrə çəkməyəcəksən rəvani-eyvani.

Mürüvvət eylə, nə çox təşnəsən bu dünyaya
Məgər tamam içəcəksən mühiti-dəryani?!

Açıbdı ağzın əcəl xışmanan əjdər kun
Dəf eyləmək olmaz hücumi-Şəbani.

Gələndə həmhəməyi-zühuri çan şiri-əcəl
Muğan-qəbə düşər səd həzər Xaqani.

Xəyal eyləsənə bir ölüm zəmanəsini
Fəqirə eyləsənə biqərar ehsani.

Qəsəm xudayi-kərimə əməl qalır ancaq
Vəfası yox, yığasan gər həzar milyani.

Qərəz, vəsiyyət idi eylədim bu moizəni
Həmişə Didə deyibdir kəlami-həqqani.

Bəli, maariki-bəqqə şücai-şir gərək
Həmişə şir-şücaət-ümidi-Şirvani.

## MÜXƏMMƏS

Əhli-halə, sanma, ey dil, bu cahan məqbuldur,
Aqilə cahi-dolali-dövləti məxzuldur.
Bəzl qıl kim, nəfü sudin etdigin məbzuldur
Vay o nəfs mali-dünya yığmağa məşğuldur,
Ayeyi-veylul ləküll halına məşmuldur.

Zərrəni bica demə ya nur, o pişi-afitab
Ya dutubdur cüğdi-arif guşəyi-künci-xərab
Onların məqsudidir dinarü dirhəm bihesab
Biri gögdən, biri yerdən eyləyirler iktisab
Hər biri öz aləmində talibi-məmuldur.

Ey cahanı çox sevən bəxti siyah, ey dərbədər,
Ey ölüm yaddan çıxarmış biqəzavü-biqədər,
Bu qədər şövqün nədir təhsilü cəmi-simü zər,
Vallahi hər kəs əgər dünyavü mafiha sevər,
Doşti-Xəsranın çölündə bir biyabani-quldur.

Ey xumar aludeyi-qəflət, sərapa bəd əməl,
Talibi-dünyayi - fani bər cü zənburi-əsəl,
Pula, mala rağib olma, yadına sal bir əcəl,
Oylə ban olma ki, bebavər yəqinən laəqəl,
Çün ölüm hər zinəfəsdən dəmbədəm mənquldur.

Hal-dünya bir binadır – çəkmə anın həsrəti
Aləmi-mənadə biridir üsrət ilə işrəti.
Pişvallar hər zaman dünyadan etmiş nifrəti,
Çək ayağın bu fənadan, dut fəriqi-söhbəti
Söhbəti-irfani hər bir firqədə məqbuldur.

Filməsəl, dünyayi dövlət səndə oldu həsbi-kam,
Pulu malü mülkü cahi əşhəbi-göhərləgam
Səndə gər bəxşayiş olmaz - feyz aparmaz xasü am
Hər nə dövlət cəm edibsən, tən olur beynələnam
Həmrəhin zəhmət çəkən carubikeş məzbuldur.

Bu cahanı şövq edən Firon ilə Şəddadıdır,
Gör oların guşnişini hancarı bir badıdır
Eyləmə təşbih özün onlara, gəl imdadı dur
Zimmi-dünyayi-əcuzə bir tükənməz zadıdır
Bu əsasən şərhi-mətni xətm olunmaz, tuldur.

Sərbəsər vəzü nəsayihdir bu şeri-pürhəqiq
Həqq - məzmun uzun - guya ki, dəryayi-əmiq
Hər sözü dürdaneyi-afaq, çün ləlü əqiq
Lölöi-məknundur, Didə düri-nəzmi-dəqiq
Filməsəl, guya sədəf tək gövhəri-kəşkuldur.

## BAHAR ŞİRVANİ

XlX əsrin ikinci yarısında klassik poeziya ənənələrini yaradıcılıqla davam etdirən, onu yeni poetika-sənətkarlıq keyfiyyətləri ilə zənginləşdirən Mirzə Nəsrulla Bahar Şirvani Azərbaycan ədəbiyyatında lirik şerin ideya-estetik məzmun və bədii forma baxımından zənginləşməsində mühüm xidmətləri olan sənətkardır. O, 1835-ci ildə Şamaxıda tacir ailəsində doğulmuşdur. Hələ uşaqlıqdan iti fəhmi və qabiliyyəti ilə diqqəti cəlb edən Bahar Şamaxı mədrəsəsində təhsil almış, ərəb, fars dillərini, hesab, nücum, şəriət elmlərini öyrənmişdir. Atası vəfat etdiyindən ailəni dolandırmaq üçün bir müddət ticarətlə məşğul olmuş, lakin bu işdən tez uzaqlaşmışdır. O, İrana gedib altı il Şiraz, Rey, Tus və Xorasanda yaşadıqdan sonra Şamaxıya qayıtmışdır. Lakin şair Şamaxıda qala bilməmişdir. Hindistana səyahətə getmiş, oradan İrana dönərək, Tehran, Xorasan, İsfahan və başqa yerləri gəzmişdir. O, Təbrizə gəlmiş və ömrünün axırına qədər burada yaşamışdır. Şair 1883-cü ildə Təbrizdə vəfat etmiş və məşhur Surxab qəbristanlığında dəfn olunmuşdur.

Bədii yaradıcılığa yeniyetməlik dövründə başlayan Bahar Şirvani əsərlərini klassik ənənələrə uyğun olaraq, əsasən, Azərbaycan və fars dillərində yazmışdır. Lakin onun zəngin irsinin az bir qismi əldədir. Bu kitabda verilən nümunələr Seyid Əsim Şirvaninin "Təzkirə"sindən (Əsərləri, III cild, Bakı, 1974)və "Poetik məclislər"' (Bakı, 1987) kitabından gotürütmüşdür.

### QƏZƏLLƏR

Ləli-ləbin ki, xəiq deyərlər şərab ona,
Xasiyyəti-şərab tapar yetsə ab ona.

Zülfün salıb oda özünü ruyinə yetib,
Öz tutduğu işində nədir piçü tab ona?

Şirin ləbin ki, el ürəyin qanə döndərib,
Yoxdur özündə qanı, demin ləli-nab ona.

Baxmaq şüayi-arizüvə kimdə tab var?
Bitablıq edib nə salırsan niqab ona?

Dönə-dönə saraldı görüb hüsnünü yenə,
Girməz yerə ki, qarşi çıxar aftab ona.

Nəfyi-vücudi-nöqteyi-mövhum edər həkim,
Ağzın verəydi kaş açılıb bir cavab ona.

Zahid ki eşq küfrünü inkar edər, Bahar,
İmanə gəlməz oxuyasan yüz kitab ona.

* * *

Aç qəra zülfünü ta səfheyi-ruxsan tuta,
Xoş olur sünbül əgər açıla, gülzarı tuta.

Hər zaman müşki-Xətadən iy oğurlar zülfün,
Möhtəsib hanı ki, bu düzdi-xətakarı tuta.

Bilməyirsən neçə min aşiq olub zülfünə bənd,
Zülf qalmaz sənə gər hər biri bir tarı tuta.

Hiç insaf deyil, zülfinə canım qurban,
Mən duram, özgələr ol türreyi-tərrarı tuta.

Qorxum oldur ki, görə zülfünü zabid nagəh,
Buraxıb səbbeyi-səddanəi, zunnarı tuta.

Nə əcəb etməsə ol şux mənimlə güftar,
Neyləsin, yox o qədər ağzı ki, güftarı tuta.

Yalvara-yalvara zülfün nə olur tutsa Bahar,
Çox əcəb sanmayın əfsungər əgər marı tuta.

* * *

Yetməz tamamə zülfi-siyahın hekayəti,
Bir qissədir uzun, onun yox nihayəti.

Axırda etdi xaluvu da qan içən ləbin,
Yoldaşlığın, bəli, olur axir sirayəti.

Öylə ki, tari-zülfün ona hər zaman dəyir,
Axırda incinib, üzün eylər şikayəti.

Dedin ki, kim əlac edər zəxmi-sinəvə,
Qəmzən edər əlac, əgər olsa inayəti.

Qəddin hədisi aləm ara saldı fitnələr,
Şuriş düşər yetəndə, bəli, məhşər ayəti.

Tapmazdı ləblərində könül çeşmeyi-həyat,
Xizri-xətin gər eyləməyəydi hidayəti.

Derlər ki, hicr qayəti hicrandır, Bahar,
Yarəb, hara yetə, görəsən, hicr qayəti?

* * *

Tutsam şərabı gər ləbüvə tay, haramdır,
Gər sim söyləsəm tənüvə, hərfi-xamdır.

Ruxsarın üzrə zülfüvə baxdım o qədr kim,
Gördüm ki, gün qürub eyləyib, vəqti-şamdır.

Mahi-təmam səhv ilə bir gün dedim sənə,
Hər kəs eşitdi, dedi: bu söz natəmamdır.

Zalım, bu qədr könlümü qan etdiyin nədir?
Qan etmədim, dedim ləbüvə-ləlfamdır.

Zahid bilirmi hiç miyanın hekayətin,
Nazik sözü nə bilsin o kəs kim əvamdır.

Zahid, təvafi-Kəbəni qoy, bir güzar qıl
Meyxanə içrə, gör  səfalı məqamdır.

Dedim ki, şəhddir ləbın, ey cani cismimin,
Dedi: Görün Baharı nə şirinkəlamdır.

* * *

Şadəm, gəl, ey sənəm, məni eşqində qanə çək,
Gər bavər etməsən, sözümü imtahanə çək.

Şəm ruxundən ayrılığım etdi kül məni,
Pərvanə tək özün tərəfə yenə-yenə çək.

Şayəd ki, bir də arizinə düşməyə gözüm,
Yüzdən o qara zülfünü, gəl, bircə yanə çək.

Ol səngidil nigarə məgər eyləyə əsər
Könlümdən, ey şərareyi-ahım, zəbanə çək.

Hicrin günündə, bəlkə mənə qəmküsar ola,
Hər qədr var qəmin, bu dili-natəvanə çək.

Ollam həlak yadi-rüxünlə baxıb gülə,
Ey yari-həmnişin, məni az gülüstanə çək.

Etmək Bahar könlünü aşüftə istəsən,
Naz ilə, gəl, o zülfi-pərişanə şanə çək.

** *

Gər zülfün ilə beylə ola aşina gözün,
Axırda başıma gətirər min bəla gözün.

Ey bivəfa, cəhanə gözün saldı fitnələr,
Zülfün gərək edə, niyə eylər xəta gözün.

Könlümlə zülfünün var idi əvvəl ülfəti,
Axırda eylədi anı da bivəfa gözün.

Məcruh sinədə yenə könlüm görünməyir,
Billah, ya qaşın aparıb anı, ya gözün.

İmanım almamış eləməz qəsd qətlimə,
Həm qanımı tökür, həm alır xünbahə gözün.

Zülfü xətin ümidimi səndən kəsər, vəli
Eylər arada özgə işarət mana gözün.

Eylər Məsih ləblərinə çox nəzər, məgər
Bimardır mənim kimi, istər dəva gözün?

Can verməyib nigahına müşkül deyil, vəli
Bir cana müşkül eyləyəcək iktifa gözün?

Min rəngilə Baharı salıbdır bəlalərə,
O ağ üzün, o al yanağın, ol qara gözün.

* * *

Mey nuri cilvə eylədi cami bülurdən,
Cami-büluri gor ki, ləbaləbdi nurdən.

Cami-bülurdə məni mey yaxdı durdən
Əlbottə yandırar düşə gər gün bülurdən.

Xət gəlmək ilə ruyüvə hüsnün olurmu kəm,
Nöqsan yetərmi mülki-Süleymanə murdən'?

Zahid sözüylə nə bütü meyxanədən keçim,
Özü görək keçirmi behişt ilə hurdən?

Ol gülüzar necə vəfadan əlim tutar?
Basmaz ayağını gözümə çün qürurdən.

Naz ilə bir xuramə gəl, əmvatə qıl güzar,
Ta mərhəba səsi gələ əhli-qüburdən.

Meyxanəyə Bahar şüur ilə meyl edər,
Zahid qüsurə meyl qılır, gər qüsurdən.

* * *

Hər kim ki hicri-yar üə düşsə dəmağdən,
Heç açılarmı könlü onun seyri-bağdən?!

Saldı mey içrə yoxsa ləbi əks saqinin
Kim, bir əyağ ilə məni saldı əyağdən.

Ölməkdən özgə yox mənə eşqində bir xəyal,
Pərvanə yanmağın sevər ancaq çirağdən.

Bir laləyüzlü yar çəkib dağ sinəmə,
Ya rəb, sən etmə sinəmi xali bu dağdən!

Yetdikdə gül dodağüvə mey bilməzəm alır,
Meydən dodaq nəşəni, ya mey dodağdən?!

Sənsiz əgər bahar ola (yüz) istəməz Bahar
Nə lalə dağdən çıxa, nə qönçə bağdən.

* * *

Derdim o məst gözlərüvün çox bəlası var.
Gördüm o qarə zülfü, onun da xətası var.

Hərgiz behiştə meyl eləməz, huri istəməz,
Hər aşiqin ki sən kimi bir dilrübası var.

Derlər bahadır ağzına can, bilməzəm neçin
Bu yox olan zadın bu qədər çox bahası var?

Hər ləhzə sinəm üzrə xədəngin qoyar başın,
Səndən genə xədəngüvün artıq vəfası var.

Müjganın ilə çeşmüvi gər sorsalar nədir?
Bimarə bənzəyir ki, əlində əsası var.

Badami gözləridir edən xəstə könlümü,
İnnab ləblərindən o dərdin dəvası var.

Bir naz ilə xuramə gəl, ey sərv, ta görək
Hüsn içrə hansı sərvqədin iddəası var?!

Yox eybi gərçi hicrin ilə ölməgin, vəli
Hüsnün görəndə ölməgin özgə səfası var.

Fəxr eylə kim, qulamınam, ey xublər şəhi,
Hansı şəhin Bahar kimi bir gədası var?!

* * *

Zülfün kimi qaraldı günüm dudi-ah ilə,
Eşqində iddəa edirəm bu güvah ilə.

Netsin o tari-zülf ilə bu qan olan könül,
Mümkündür başarmaq o zülfi-siyah ilə?!.

Hər guşəsində gör gözüvün min bəla yatıb,
Neyçün can almasın belə göz bir nigah ilə?!

Xətt ilə yığdı dəsti-qəza hüsnü ruyüvə,
Necə ki, bağiban gülü bağlar giyah ilə.

Müjgan səfini sinəmə çəkmək rəva deyil,
Gəlmək xərabə mülkə nə lazım sipah ilə?!

Derlər günahi-eşqüvə yanmaq cəza, xoşam
Yandırsalar məni oda gər bu günah ilə.

Meyxanəyə Bahar girib "ya sənəm" deyib,
Zahid girirsə Kəbəyə gər "lailah" ilə.

# SEYİD ƏZİM ŞİRVANİ

XIX əsr Azərbaycan poeziyasının ən qüdrətli nümayəndəsi Seyid Əzim Şirvanidir. O, 1835-ci ildə Şamaxıda ruhani ailəsində doğulmuşdur. Yeddi yaşında atasını itirdiyindən anasının və babasının himayəsində qalmışdır. İlk savad təlimini babasından almış, sonra Yaxın Şərqin Bağdad, Şam, Qahirə kimi mədəni mərkəzlərinə gedərək təhsilini təkmilləşdirmişdir. Şamaxıya qayıtdıqdan sonra yeni üsulla məktəb açmış, müəllimlik etmişdir. Şair 1888-ci ildə ölmüş və Şamaxıda Şaxəndan qəbristanlığında dəfn olunmuşdur.

Bədii yaradıcılığa XIX əsrin 50-ci illərində başlayan Seyid Əzimin zəngin ədəbi irsi qalmışdır. Bu irsin böyük bir qismini lirik şeirlər təşkil edir. Poetik gözəlliyi ilə ürəkləri fəth edən həmin əsərlər dəfələrlə Tlbrizdə və Bakıda nəşr olunmuş, bəziləri rus dilinə tərcümə edilərək xarici ölkələrdə yayılmışdır. Bu kitabdakı şeirlər şairin üç cildlik "Əsərləri"nin birinci cildindən (1967) və "Dahilərin göz yaşı" (1990) kitabından gotürülmüşdür.

## QƏZƏLLƏR

Gecə gördüm səni, ey afəti-dövran, yuxuda –
Ki, edərdin mənə yüz lütfi-firavan yuxuda.

Görmüşəm ləlüvi, lazımdı tökülsün qanım,
Etibar olmaz əgərçi görələr qan yuxuda.

Zahirən abi-bəqayə yetəcək xəstə könül
Kim, bilibdir dəhənin sirrini pinhan yuxuda.

Nola ləlin görübən zövq ilə xəndan olsam,
Rəsmdir: - şad olu hər kim ola giryan yuxuda.

Var ümidim ola cəmiyyəti-vəslin məqdur
Ki, qara zülfüvi göz gördü pərişan yuxuda.

Gecə gördükdə sefeyi-rüxüri, ey Kəbeyi-hüsn.
Kaş olaydım, dolanıb başuva, qurban yuxuda.

Seyyidi-zar görüb vəslüvi bidar olmuş,
Bir gədadır ki, görüb özünü sultan yuxuda.

* * *

Olmasaydı qəmi-eşqin dili-viranımda,
Saxlamazdım onu bu izzət ilə yanımda.

O qara xab mənə versələ qanın içərəm,
Nə üçün mənzil edib arizi-cananımda.

Tutanı müshəti-rüxsarüvi ol kafər xət,
Görünür gör nə xələllər mənim iymanımda.

Eyləməz aşiqi bir lütf ilə xürrəm, ya rəb,
Bu nə rəftardır ol sərvi-xuramanımda?

Düşəni xublərin könlümə fikri, Seyyid,
Əlli Yusif tapılar külbeyi-əhzanımda.

* * *

Verməɴəm könlümü bir dilbərə bundan sonra,
Olmanam aşiq o siminbərə bundan sonra.

Aldı iymanımı əldən, məni bidin elədi,
Aşina olmanam ol kafərə bundan sonra.

Oxşayır mahi-fələk çünki üzari-yarə,
Baxmanam mən bu məhi-ənvərə bundan sonra.

Badənin ləli-ləbi-dilbərə çün nisbəti var,
Tökmənəm badəni mən sağərə bundan sonra.

Ənbərin zülfüvün ol qədr ziyanın deyərəm,
Kimsə rəğbət eləməz ənbərə bundan sonra.

Dəxi ol sərvqədin kuyinə cənnət deyibən,
Gəzmənəm küçələri heyvərə bundan sonra.

Etmənəm zülfuvün ovsafını, şair deməsin,
O pəri Seyyidi-qəmpərvərə bundan sonra.

* * *

Ey könül, məscid yolun tərk et, rəhi-meyxanə tut,
Tutma əldə zahidin tasbihini, peymanə tut

Zahidü məscid təmənnasm çox etmə, ey könül,
Zahidi bir cüğd bil, həm məscidi viranə tut.

Xublar zülfündə görsən bu pərişan könlümü,
Boynu bağlanmış, onu, zəncirə bir divanə tut.

Ol məhi-namehriban istər ki, zülfün darəsin,
Sən götür ayinə, ey gün, ey qəmər, sən şanə tut.

Can verib canan‌ə, yan şəmi-rüxündən dilbərin,
Gər kəmal istərsən, ey dil, şiveyi-pərvanə tut.

Xublar eşqində gör şimdi mənim rüsvalığın,
Qisseyi-Fərhad ilə Məcnunu bir əfsanə tut.

Girmə sən məscidlərə namərd zahidlər kimi,
Seyyida, meyxanədə peymanəni mərdanə tut.

* * *

Hanı o malı ilə mən işrət etdigim gecələr,
Tülui-sübhə kimi söhbət etdigim gecələr.

Gedəndə yar, durub naz ilə kənarından
Alıb ələ ətəgin, minnət etdigim gecələr.

Düşəndə xatirimə göglərə çıxır ahım,
O mahparə ilə xəlvət etdigim gecələr.

Ayaq yalın, baş açıq, zəmzəmi-sirişk töküb,
Təvafi-kuyi üçün niyyət etdigim gecələr.

Gəlib nihani dəri-yarə, üz qoyub xakə,
Qübarın öpməgə ol cürət etdigim gecələr.

Düşərmi bir də olə, ey xudayi-həyyü əhəd,
O sərvqamət ilə ülfət etdigim gecələr,

Deyəndə yar mənə dərd, mən deyərdim can,
Məzaqə təlx sözün şərbət etdigim gecələr.

Mükərrər eyləyib ol acı sözlərin, Seyyid,
Özüm-özümə dönüb ləzzət etdigim gecələr.

* * *

Səni əhli-vəfa bilmişdim, ey gül, bivəfasənmiş,
Bağışla, bilmədim biganələrlə aşinasənmiş.

Səni ayineyi-məqsud sandım rubəru durdum,
Göründü əksi-surət, annadım kim, kəcnümasənmiş.

Səni Yusif bilib, verdim könül mülkündə sultanlıq,
Əzizim, nuri-eynim,sən gəda oğlu gədasənmiş.

Səni üşşaq üçün söylərdim əvvəl rəhməti-həqsən,
Vəli, ey mahru, sən gögdən enmiş bir bəlasənmiş.

Kimin zülfünə bənd oldunsa, Seyyid, bivəfa çıxdı,
Şikayət etmə bir kəsdən, özün bəxti qərasənmiş.

## MÜXƏMMƏSLƏR

Bəlayi-eşqə düşdürt, ey büti-mehparə, səbr eylə,
Günün oldisə gər hicran əlindən qarə, səbr eylə,
Ümidi-vəsli-cənnət eyləyib yan narə, səbr eylə,
Düşüb Məcnun kimi səhranı gəz avarə, səbr eylə,
Cəfayi-dövri-gərdun dunü kəcrəftarə, səbr eylə.

Bu ahugözlülər bağlar kəməndi-zülf ilə şiri,
Tökübdür çoxların qanın bu yolda eşq şəmşiri,
İtirmə kəsrəti-qəmdən, əzizim, rahi-tədbiri,

Məhəbbət pak olursa, çox olur əlbəttə təsiri,
Edər ahın əsər ol dilbəri-xunxarə, səbr eylə.

Oxurdum məktəbi-üşşaqdə təsnifi-Loğmanı -
Ki, gördüm səbt olub hər müşkülə bir növ samanı,
Bu qədri çəkmə hicri-yar əlindən ahü əfqanı,
O hansı dərddir kim, olmasın aləmdə dərmanı,
Yazılmış dəhrdə hər dərd üçün bir çarə, səbr eylə.

Vuran Mənsurluq lafın qəmi-darından inciməz,
Özün pərvanə tək şəmə vuran narından inciməz.
O şirin ləlin, aşiq, təlx göftarından inciməz,
Gülüstani-cahanda gül sevən, xarından inciməz,
Əgər yar istəyirsən, təneyi-əğyarə səbr eylə.

Nə qəm, olsa sənə, ey dust, düşmən cümleyi-aləm –
Ki, mülki-hüsn içində, tacidarım, şahsən sən həra,
Çəkib müjgan sipahı eylə yeksər aləmi bərhəm,
Və lakin zəxmi-tiri-yarə hərgiz istəmə mərhəm,
Yetə gər sinən üzrə yarə üstən yarə, səbr eylə.

Əgərçi xurdü xabı eşq üşşaqə həram eylər,
Xəyali-zülfü rüxsarı günün möhnətlə şam eylər,
Nə Əflatun bu dərdin çarəsin, nə Cəm, nə cam eylər,
Olur ki, vəsli-dilbər bir gün, ey meh, iltiyam eylər,
Əgər Seyyid kimi könlün ola sədparə səbr eylə.

* * *

Guş qıl, ey ki bilirsən özüvi vaqifi-kar,
Agəh ol gör ki, nədir naleyi-ney, nəğmeyi-tar,
Nədir ol xüşk olan çubdə bu naleyi-zar –
Ki, sədasından onun qarət olur səbrü qərar,
Açma sən pərdəni, hər pərdədə var yüz əsrar.

Qoymaz ol tarı müğənni niyə ağuşindən,
Düşməz ol xanəbərəndazlərin duşindən,
Huş ilə guş edə hər kimsə, gedər huşindən,

Pənbeyi-qəfləti çək sən dəxi can guşindən,
Ta ki, əsrari-nihanə olasan bərxurdar.

Ləhni-Davudi ilə könlüvü qıl xürrəm sən,
Ərş baminə, gözüm, nəğməni tut sülləm sən,
Olma qal əhli, qıl əmdən özüvi əbkəm sən,
Kəsb elə elmü ədəb feyzin əgər adəmsən,
Fəhm qıl, gör ki, nədir musiqiyü müsiqar.

Tut bərabər dəmi-İsayə mübənni dəmini,
Qılıb ehya özüvi, seyr elə ruh aləmini,
Ziri-qəm olma, eşit nəğmeyi-zilü bəmini,
Çəkmə, aqilsən əgər, dəhri-müxalif qəmini,
Şurə gəl, nəğmə ilə çək qəmi-dünyayə həsar.

Musiqi məclisinin əhli gərək əhli-bəsər,
Ta görə pərdeyi-əsrardə yüz nəqşü süvər,
Kim ki, zövq əhli-degil, ani hesab eylə həcər,
Ləhni-Davud eləməz növi-cəmadatə əsər,
Məni ərbabı edər guş süxən, ey huşyar.

Fəhm qıl, gör ki, nədir çəngü dəfü bərbətü ud,
Nədir onlarda bu ahəngü bu ləhnü bu sürud,
Arif ol, rəmz bil ey mahəsəli-qeybü şühud,
Ud hər ləhzə gəlib şurə deyər: ya məbud,
Tar hər ləhzə gəlib vəcdə deyər: ya səttar.

Zahida, tarıya bax, məclisi-ürfandır bu,
Tarı əsbabi-mənahi demə, böhtandır bu,
Meyi gör, saqiyə bax, Kövsərü qılmandır bu,
Cümləsi pərtövi-rüxsareyi-sübhandır bu,
Meydə hər nurunu gör, səhvinə qıl istiğfar.

Ey könül, məhrəmi-raz eyləmə biganələri,
Vermə naəhl əlinə bu dolu peymanələri,
Çək rümuzat ilə zülfi-süxənə şanələri,
Seyyida, Mehdiyə yalvar ki, bu dürdanələri
Eyləsin məclisi-şəhvari-Kərim bəgdə nisar.

## MÜSƏDDƏS

Xoş ol zaman kı, yar mənə həmzəban idi,
Bəzmim cəmali-yar ilə rəşki-cinan idi,
Sultan idim ki, hər yana hökmüm rəvan idi,
Dövlət qulam idi mənə, bəxtim cəvan idi,
Cani-həzinə həmdəmü arami-can idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Xurşidgun şərablə dolmuşdu camımız,
Ol mah ilə keçirdi bizim sübhü şamımız,
Dövri-fələkdə hasil olurdu məramımız,
Xaki-dərindən özgə yox idi məqamımız,
Bülbüllərə o sahəti-qüds aşiyan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Hicrin əgərçi görmüş idim mübtəlalərin,
Dildən-dilə eşitmiş idim macəralərin,
Bunca təsəvvür eyləməz idim bəlalərin,
Can çəkmiş idi möhnəti-hicran cəfalardan,
Xəlvətsərayi-vəsldə dil kamran idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Könlüm o mahdən açılırdı kərəm görüb,
Mehrin ziyadə, cövrü cəfasını kəm görüb.
Ol gül mənə açıldığını dəmbədəm görüb,
Bəzmi-visalda özünü möhtərəm görüb,
Rəşk ilə qönçə tək dili-bədxah qan idi;
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Ol gül mənimlə həmdəm idi hər bahardə,
Gəh daməni-çəməndə, gəhi laləzardə,
Bülbül təki işim yox idi ahü zardə,
Seyyid ki məskən etmiş idi kuyi-yardə,
Ezaz ilə bir Adəmi-cənnətməkan idi;
Dəmlər o dəmlər idi, zamam ol zaman idi.

## NÖVHƏLƏR

Bir çarə qıl, ey əmmə, mən ölsəm kəfən olmaz,
Tabutü hənutum götürüb dəfn edən olmaz.

Qəssalimə mən ölsəm əgər kim xəbər eylər?
Quran kim oxur, qəbrimin üstə güzər eylər?
Axır ki, yetiməm, mənə bu, çox əsər eylər,
Qardaşım ölüb, başımın üstün kəsən olmaz.

Bu Şamda heç mən kimi bir ac yatan var?
Xak üstə qaranlıqda quru yerdə qalan var?
Sən Şümrə de açsın qolumu, məndə nə can var?
Hər növ əsir olsa, qolunda rəsən olmaz.

Bundan sonra hər qədr ki, dünyadəyəm, əmmə,
Hicrin oduna yanmağa amadəyəm, əmmə,
Hərçənd yetiməm, yenə şahzadəyəm, əmmə,
Şahzadə balasına xərabə vətən olmaz.

Bu Şümr qoyanda məni qardaşıma həsrət,
Röyada dəxi olmamışam ləhzeyi rahət.
Kül başıma olsun, mənə dünyadə nə ləzzət,
Qardaş deyən vəqtdə bir can deyən olmaz.

Zülm ilə edən vaxtda bizi məclisə azim,
Bağlandı qolum, olmadı bir Əkbərə nazim.
Zəncir məni-bikəsə, qardaş nə lazım?
Hicrində mənimtək belə zillətçəkən olmaz.

Gördü bu gözüm Əkbəri bihayilü pərdə,
Kəsdilə başın, saldıla cismin quru yerdə.
Cəllad soyan vaxtda deyirdi ki, bəşərdə
Mən görməmişəm, bir belə siminbədən olmaz.

Gördüm ki, nə növiləYezidi-səği-məlun,
Etdi babamın ləli-ləbin çub ilə pürxun.
Döndərdi, mənim göz yaşımı eylədi Ceyhun,
Urduqca deyirdi belə şəkkərşikən olmaz.

Çün gördü mühasini olub qanına qəltan,
Öz cahi-cəlalını qılıb xalqa nümayan,
Tən ilə deyirdi ki, oyan, şahi-şəhidan,
Bu rəngdə billah, əqiqi-Yəmən olmaz.

Hərçənd daşıb, Seyyidi-biçarə, günahın,
Təsir eləyib cümlə hamı xəlq üçün ahın,
Xof eyləmə, məhşər günü axırda pənahın
Bir kimsənə qeyr əz şəhi-gülgünkəfən olmaz.

* * *

Qasımım, zülfi-xəmin üzdə hüveyda görünür,
Bu əcəbdir ki, gün üzrə şəbi-yelda görünür.

Ey süpehri-şərəf üzrə məhi-tabanım oğul,
Zülməti-hicrivə qoydun məni cananım oğul,
Ey xəti Xızr, ləbi çeşmeyi-heyvanım oğul,
Ləbi-ləlində sənin nitqi-Məsiha görünür.

Ey oğul, qaldı qara günlərə biçarə ərus,
Gülü əldən gedibən, yalvaracaq xarə ərus,
Al duvağın götürüb, başə salıb qarə ərus,
Bülbülün solsa gülü, başəna sevda görünür.

Kakilin həbli-mətinimdi, üzün ayeyi-nur,
Qaf məsturi-cəbinimdi, kitabi məstur.
Şəşəati-ruxi-pakin eləyib dəhrə zühur,
Kərbəla Tura dönüb, nuri-təcəlla görünür.

Oxşayırsan, ey oğul, gərçi məhi-ənvərə sən,
Al ələ tiği-hilalın, ur özün ləşkərə sən,
Çün gərək canını qurban verəsən Əkbərə sən,
Əkbərin qətlinə bu qövm mühəyya görünür.

Sənə qurban olum, ey novgüli-gülzari-Həsən,
Səni qurban verirəm şövqlə ol sərvərə mən.

Leyli öz Əkbərinin gərdəninə saldı kəfən,
Çeşminə indi nə dünyavü nə üqba görünür.

Cəddimə verdi xəbər həq, Zəkəriyya xəbərim,
Teşt içində kəsilən başı o Yəhya xəbərin.
Bil bu ayatıt, oğul, rəmz ilə ima xəbərin,
Zahiri təşnə Hüseyn, batini Yəhya görünür.

"Kafiha"da var, oğul, bir neçə məxfi məna,
"Kafi'dir Kərbübəla,"ha"yı həlaki-şühəda,
"Ya" yəqin eşqdi bu təşnələbi-Kərbübəla,
"Sat"i səbr olmasa, ey təşnə, nə məna görünür?

Seyyida, riştəyə çəkdin yenə yüz dürri-Ədən,
Sənə məhşərdə şəfaət eləsin ibn Həsən.
Mərhəbalar sənə, ey şairi-ecazsüxən,
Səndə feyzi-nəzəri-həzrəti-mövla görünür.

## RÜBAİLƏR

Ey qüdrətin asarı sənin ərzü səma,
Ey amri qılan kövnü məkanı peyda.
Vəchindən əgər almasa nurin, xürşid –
Bir zərrə qədər cahanə verməzdi ziya.

* * *

Şəhri-Qarabağə Şişə qoymuşlar ad,
Bu şəhr pərilərdən olubdur abad.
Təsxiri-pəri şişədə qılmaq xoşdur,
Əmma, bu pərirulər əlindən fəryad!

* * *

Bu Gəncədə bir gənci-nihanım qaldı,
Bir simbədən, qönçədəhanım qaldı.

Tanrı bili kim, tari-səri-zülfündə
Guya üzülüb rişteyi-canım qaldı.

* * *

Var Ərdəbilin xeyli gözəl torpağı,
Tər yoncası, göy səbzəsi, xürrəm bağı.
Hərdəm ki, düşər yadıma, həsrət çəkərəm,
Bali-Səbəlan ilə gomuş qaymağı.

* * *

Xaki-Nəcəfi-Əşrəfə oldum vasil,
Səd şükr xudayə, feyz aldım kamil,
Sərsəbz olub məzrəeyi-amalım,
Xirmən-xirmən səadət etdim hasil.

* * *

Tiflisdə bir sərvqədü siməndam,
Mehmanım olub bir gecə içdi neçə cam,
Sordum ləbini güldü, dedi: ey Seyyid,
Şər ilə məgər degil sizə badə həram?

* * *

Ey Şeyx Nizami, ey nizami dağılan,
Ey Gəncədə izzü ehtişamı dağılan,
Olmuşmu səninlə mən kimi aləmdə
Beyti, evi, məktəbi, kəlamı dağılan?

## İBRAHİM BƏY AZƏR

*İbrahim bəy Əli bəy oğlu Azər 1836-cı ildə Şuşada doğulmuşdur. Qasım bəy Zakirin nəvəsi, Abdulla bəy Asinin böyük qardaşıdır. Azər Mehdiqulu xanın tərbiya va himayəsində böyümüşdür. Təhsilini Şuşada almış, fars və rus dillərini gözəl bilmişdir. Bir müddət rus məhkəməsində vəkil işləmiş, 1885-ci ildə vəfat etmişdir.*

*"Məclisi-fəramuşan"m iştirakçılarından olan Azər klassik üslubda Azərbaycan və fars dillərində yazmış, lakin əsərlərinin az hissəsi qalmışdır. Burada verilən nümunələr Firidun bəy Köçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981) və "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Ahu kimi baxanda o məstanə gözlərin,
Baxdıqca eyləyir məni divanə gözlərin.

Fərhad kimi mən kimiyə dağı dəldirir,
Şirin baxışlı, Xosrova xubanə gözlərin.

Hər dəm ki, istəsə baxa bir kəc nigahilə,
Yüz min könül yıxar yenə cananə gözlərin.

Zənciri-eşqini salıban boynuma mənim,
Bak etməyib çəkər məni hər yanə gözlərin.

Eşqin edibdi Azəri-dilxəstəni cünun,
Məcnunsifət salı bu biyabanə gözlərin.

* * *

Məgər, ey bivəfa, heç yar olanlar yarı sormazlar?
Əsiri-möhnəti-qürbət olan biman sormazlar?

Məgər qayib olan yarı xəyala bir gətirməzlər?
Məgər gözdən düşüb yaddan çıxan əfkarı sormazlar?

Qəmi-zülfu rüsunla gecə-gündüzüm keçir yeksan,
Məgər, ey əhdü peymansız, belə qəmxarı sormazlar?

Səba, izhar qıl ol qönçələb yarə bu peyğamım,
Nolub rəsmi-vəfa bütlərdə, bu əsrarı sormazlar?

Təəccüb kim əzəl katiblərindən bu vəfa əhü
Neçün yoxdur vəfa bütlərdə, bu əsrarı sormazlar?

Xəyali-nərgisi-məstüqəmi-zülfi-siyahınla
Gecələr sübhədək fəryad edən biman sormazlar?

Nə çox izhari-hal eylərsən, ey Azər, bu adətdir
Kim, istiğnalı sultanlar gədayi-xan sormazlar!

* * *

Nə qəddir bu, nə qamətdir, sərapa şux rənadır,
Və yainki qiyamətdir ki, aləm içrə bərpadır.

Tənabi-zülfü göz cəlladı tutmuş yüz kəşakəşlə,
Çəkirlər dara mən divanəni, bir xoş təmaşadır.

Ərəqdir arizində, yoxsa şəbnəmdir gülə düşmüş,
Düzülmüş ya ki, məh ətrafına iqdi-Sürəyyadır?

Dəhanın nöqteyi-mövhumdur, ya qönçədir, bilməm,
Bunu kəşf eyləmək olmaz ki, bir müşkül müəmmadır.

Deyirlər ildə bir yol gün Əsəd bürcünə nəql eylər,
Bu nə xurşiddir daim Əsəd bürcündə peydadır?!

Sevib Əzranı Vamiq, Leylini Məcnun, olub rüsva,
Sənin eşqində, dilbər, Azəri-divanə, rüsvadır.

* * *

Arizin göstər gülə gülşəndə həmralənməsin,
Qəddi-rəna qarşısında sərv bəlalənməsin.

Zülü-mişkini-müsəlsəldə xəcil qıl sünbülü,
Çeşmi-məstin nərgisə göstər ki, şəhlalənməsin...

Mahi-nov kimdir günəş rüxsarın ilə bəhs edə,
Bir kəsinti dırnağınla hiç qürralənməsin.

Çün könül məhbusdur zülfündə, gəl bir rəhm qıl,
Vurma əl zəncirə zindan əhli qövğalənməsin.

Gər sənin eşqində Azər olsa rüsva, eybi yox,
Kuhkən Şirindən ötrü necə rüsvalənməsin?!

## MİRZƏ ƏLƏSGƏR NÖVRƏS

*Mirzə Ələsgər Növrəs 1836-cı ildə Şuşada doğulmuşdur. Uşaqlıqdan təhsilə xüsusi həvas göstərmiş, ərəb, fars dilləri ilə yanaşı rus dillini də öyrənmişdir. O, Şuşada kargüzar işləmişdir. 1912-ci ildə vəfat etmiş və Şuşada Mirzə Həsən qəbristanlığında dəfn olunmuşdur.*

*Bədii yaradıcılığa gənclik illərində başlayan Növrəs "Məclisi-üns"ün fəal üzvlərindən olmuş, eyni zamanda "Məclisi-fəramuşan"ın yığıncaqlarında iştirak etmişdir. Onun əsərlərindən nümunələr müxtəlif əlyazma və çap kitablarında qalmışdır. Şeirləri toplu halında ilk dəfə 1985-ci ildə Bakıda nəşr olunmuşdur. Buradakı nümunələr həmin kitabdan götürülmüşdür.*

### QƏZƏLLƏR

Könlüm elə pünhandır, geysulər arasında,
Şanə gəzibən tapmaz yüz mulər arasında.

İstər ki, çəkə Mani tərhini qaşın, bilməz,
Peyvəstə kəşakəşdir əbrulər arasında.

Məstanə xumar gözlər hərdəm mənə al eylər,
Qaldım nə yaman yerdə cadular arasında.

Bimar gözüm, cana, salmış məni bir halə,
Səhrayə düşüb gəzdim ahulər arasında.

Ta mən ki, cüda düşdüm ol yar vüsalından,
Varmı görəsən söhbət bədgulər arasında?!

Əğyarə vəfa etmək, üşşaqə cəfa, Növrəs,
Bilməm bu nə adətdir məhrulər arasında?!

* * *

Çəkər xəclət, gülüm, ol gül üzündən gül çəmənlərdə,
Üzündən qeyri yad etməz gülü bülbül çəmənlərdə.

Yenə ey şuxi-nuşinləb, xəyali-tari-zülfündən,
Əcəb olmuş pərişan haləti-sünbül çəmənlərdə.

Açılmaz həşrədək, ey qönçələb, yüz min bahar olsa,
Görübdür xəndeyi-pünhanini novgül çəmənlərdə.

Vüsalə həsrət oldum. mübtəlayi-hicrdir könlüm,
Tutam aranı sənsiz, ey gülüm, müşkül çəmənlərdə.

Fəğanü naleyi-dil munisimizdir, bir tərəhhüm qıl,
Deyil tənha, əzizim, Növrəsi-bidil çəmənlərdə.

* * *

Fələyin ruzi-əzəl mən belə pərvərdəsiyəm,
Ah, qəm ləşgərinin şövq ilə sərkərdəsiyəm,

Neçə müddətdi konül bəzmi-səfa təşnəsidir,
Zindədil hal bilən əhli-vəfa mürdəsiyəm.

Şəhr əhli neçəsi eylədi çox zülm mənə,
Qeybətü töhmətin axir belə pəjmürdəsiyəm.

Hər dənizadə mənim üstümə qalxızdı ayaq,
Deməzəm bir söz ona bəs ki, həya pərdəsiyəm.

Növrəsa, rövnəqi-əyyami-cavanlıq getdi,
Zövq əhli deyiləm, pirilik əfsürdəsiyəm.

* * *

Gel, ey dili-bimarimə olan təbib, ölürəm,
Vüsali-bəzmi mənə olmayan nəsib, ölürəm.

Cəmalın ayinəsin dutgilən nəfəs sari,
Ki, gör nə növ ilə hicrində bişəkib, ölürəm.

Xəyali-zülfin ilə cismin-natəvan əriyib,
Məriz edibdi məni çeşmi-dilfirib, ölürəm.

Bərabərimdə bu halimə bir qiyam eylə,
Ki, ruzi-məhşər ola bəlkə ənqərib, ölürəm.

Nə qəmküsar, nə yar, nə bir vəfalı nigar,
Nə bir ənis, nə munis, nə bir həbib, ölürəm.

Bu Növrəsin rəhi-eşqində bilmədin qədrin,
Get, indi zövqi-səfa eyləsin rəqib, ölürəm.

* * *

Məni-bimarə müddətdir olub yaği qara gözlər,
Könüldə tari-müjganın qalıb baqi, qara gözlər.

Töküb peyvəstə qanım mərdümü, dünyayə faş olmuş,
Olubdur ogri qaşının qan ortaği, qara gözlər.

Dəgil eymən xətasından nəzər ərbabı, ondandır,
Olub məkri-fusuni-hiylə yığnağı qara gözlər.

Əzizim, məhvəşim, şuxim, nigarım, bəs nədir bais,
Qara gündə qoyubdur əhli-üşşaqi qara gözlər?!

Nə cürm etmiş, nəzərdən saldın axır rüzgar içrə,
Dəmadəm Növrəsi-məhzuni-müştaqi, qara gözlər.

## TƏXMİS

*Füzuliyə*

Mən həbibi-pakizadəm, ey günuhi-əşkiya,
Bulmuşam kuyi-vəfada rahi-təslimi-riza.
Aşiqəm yüz min bəlayə "əlbəla-ül-livəla",
"Qəd ənarəl-eşqə lil üşşaqi-minhacəl hüda,
Saliki-rahi həqiqət eşqə eylər iqtida".

Fükri-zikrim dəmbədəm hərfü kəlami-eşqdir,
Eyləyən sərxoş məni hər dəmdə cami-eşqdir,
Aşiqi-sadiq cahan içrə imami-eşqdir,
"Vadiyi-vəhdət həqiqətdə məqami-eşqdir
Kim, müşəxxəs olmaz ol vadidə sultandan gəda".

Sərxoşam cami-məhəbbətdən, ayə, qövmi-zəlam,
Badeyi-eşq aşiqə hüşyarlıq eylər həram,
Şövqü zövqü eşqi-canan aşiqə olmuş həram,
"Eşqdir ol nəşəyi-kamil kim, ondandır müdam,
Meydə təşviqi-hərarət, neydə təsiri-səda"

Ey deyən hər dəm mənə, sidqi-iradət tərkin et,
Eşqə, gəl qoyma qədəm, rahi-səlamət tərkin et,
Hər iki dünyadə sən rahi-səadət tərkin et,
"Ey ki, əhli-eşqə söylərsən: məlamət tərkin et,
Söylə kim, mümkünmüdür toğyiri-təqdiri-xuda?"

Mərhəba kuyi-məhəbbətdə sücudi-aşiqə,
Qıl nəzər ruzi-qiyamətdə nümudi-aşiqə,
Tənə qılma, baş verib cananə cudi-aşiqə,
"Eşq kilki çəkdi xət hərfi-vücudi-aşiqə
Kim, ola, sabit həqq isbatında nəfyi-maəda".

Əlqərəz, mehrü vəfadır xəstə dilər mərhəmi,
Mən kənar etməm qədəm rahi-məhəbbətdən dəmi,
Olmuşam mən sakinani-kuyi-eşqin həmdəmi,
"Eyləməz xəlvətsərayi-sirri-vəhdət mərhəmi
Aşiqi məşuqdan, məşuqi aşiqdən cüda".

Ey könül, rəncü ənasir zövq buldun eşqdən,
Aşiqi-həqsən, cəfasız zövq buldun eşqdən,
Fəxr qıl, Növrəs, bəhasız zövq buldun eşqdən,
"Ey Füzuli, intəhasız zövq buldun eşqdən,
Böylədir hər iş ki, həqq adilə qılsan ibtida".

## HACI AĞA FƏQİR ORDUBADİ

*XIX əsrdə yaşamış şairlərdan biri "Fəqir" təxəllüsü ilə yazan Hacı Ağa Ordubadidir. O, 1836-cı ildə Ordubadda tacir ailəsində doğulmuşdur. Təbriz və Şirazın tanınmış alimlərindən dərs almış, təhsilini tamamladıqdan sonra bir müddət Ordubadda müəllimlik etmişdir. Əsərlərində fırıldaqçı din və mənsəb sahiblərinə toxunduğu üçün təqibə məruz qalmış, bir müddət Türküstanda yaşamışdır,*

*Ordubada qayıtdıqdan sonra xırda alverlə məşğul olmuşdur. Həyatının sonlarında gözləri tutulmuş, 1885-ci ildə vəfat etmişdir.*

*"Əncüməni-şüəra" ədəbi məclisinin təşkilatçılarından və fəal üzvlərindən olan Hacı Ağa Fəqirin lirik və satirik üslubda çoxlu şeirləri qalmışdır. Onun seçilmiş əsərlərindən ibarət "Ağlar qələm əlimdə " kitabı 1989-cu ildə Bakıda nəşr edilmişdir. Buradakı nümunələr kəmin kitabdan götürülmüşdür.*

### QƏZƏLLƏR

Heyf, məndən ol mələksima pəri can istəməz,
Cismi-bimiqdarımı rahində qurban istəməz.

Mən ümidi-vəsl ilə çox şakirəm hicran üçün,
Aşiqi-sadiq degil hər kəs ki, hicran istəməz.

Könlümə yüz karvani-qəm gəlir, mehmanlanır,
Kaş o ev viran ola, yarəb, ki mehman istəməz.

Ey xoşa, ol dərdməndə kim, təbibi yar ola,
Əhli-eşq ol dərd üçün talibdi, dərman istəməz,

Tarmar olsun o dil kim, yan yox, dildarı yox,
Canəvərdir, can deyil, hər kəs ki, canan istəməz.

Ey gözəl, zülfün kimi könlüm pərişan eyləmə,
Kişvəri-mülkün şahənşahlar ki, viran istəməz.

Canımı qurtar bu qəmlərdən mənim, tök qanımı,
Qorxma, məşuqindən aşiq həşrdə qan istəməz.

Qaməti-sərvin görən, gül tək cəmalın xoşluyan,
Bağə baxmaz, gülşənə getməz, gülüstan istəməz.

Ləblərin şəhdin içən aşiq həyati-Xızr alır,
Meyli-şəhdi-şəkkər etməz, abi-heyvan istəməz.

Küfri-zülfün sevməyən imanı yoxdur, dini yox,
Hansı mömindir kim, o, zülfündən iman istəməz?

Rəhm qıl, miskin Fəqirə, eylə ahindən həzər,
Beylə gündə kafəri, gəbri müsəlman istəməz!

* * *

Düşmüşəm seyd kimi damdə səyyad əlinə,
Bivəfa, qaniçici kafirü cəllad əünə.

Qanımı tökmək üçün əbruyi-xunrizi müdam,
Gör nə xişm ilə alıb xəncəri-fülad əlinə.

Nə səbəbdən bu qədər didələrin qəsdim edər?
Məni məqtul eləməkdən gəlü bir zad əlinə!?

Qoyma zülfi-siyəhin səfheyi-rüxsarə düşə,
Vermə, ey şux, behişti belə Şəddad əlinə.

Dövri-çeşmindəki xalin bəməsəl xatəmdür,
Yetişib hiylə ilə divi-pərizad əlinə.

Qılsın əmani-nəzər mürşidi-ustadi-əzim,
Hacı Mirzayi-Rəhim yetsə bu əfrad əlinə.

Duta gər nəzmi-kəlamında Fəqirin bir eyb,
Əfv qılsın onu kim, düşmüyüb ustad əlinə.

* * *

Salma bu qəra zülfünü rüxsarə, amandır,
Tapşırmagilən Kəbəni küffarə, amandır.

Kəbə yüzünü görməyə aləm yığılıbdır,
Göstər həcərül-əsvədi zəvvarə, amandır.

Tapşır o kamandar qaşına tiri-müjəndən,
Suzan sinəmə vurmaya çox yarə, amandır.

Zahid məni öldürdü məlamət eləməkdən,
Göstər yüzünü, ta qıla nəzzarə, amandır.

Məntək unuda dini, duta rahi-Məsihi,
Səcdə eliyə deyrlə zünnarə, amandır.

Mən canə yetişdim bu qədər cövrün əlindən,
Ərzə gedirəm axırı sərdarə, amandır.

Rəhm üzrə gəlib aşiqi-dilxəstəyi-zarün,
Qoyma gedə biganəyə yalvarə, amandır.

Göstər Fəqirə nuri-təcəllayi-cəmalin,
Musa kimi ta qalmaya avarə, amandır!

* * *

Ey gözüm, vermə könül bu gözü xummarılərə,
Olma mayil bu qara qürrəli dildarlərə.

Mahrulərdə tapılmaz əsəri-mehrü vəfa,
Hiç kəs olmıya aşiq belə xunxarlərə.

Bir qəra didəlinin zülfu salıb hülqümə ğüll,
Məni axır çəkəcək kuçəvü bazarlərə.

Ey yüzi gül, ləbi püstə, dəhəni qönçeyi-təng,
Unudub bülbülü, yar olmagilə xarlərə.

Yataram fikri ilə hər gecə ol türrələrin,
Yuxuda tuş oluram əfiyi-şahmarlərə.

Xəmbəxəm zülfinə bağlı nə mənim könlüm olub,
Bəlkə min xəstə könül bağlanıb ol tarlərə.

Ey Fəqir, yoxdu nigarın kimi bimehrü vəfa,
Hiç rəhm eyləmiri didəsi xünbarlərə.

* * *

Verəli dil o qarə tellərə naşad olubam,
Qanlı yaş cari edib, qəmlərə mötad olubam.

Xəmi-zülfündə məqam eyləyəli xəstə könül,
Qüssəyə tuş olub, xanəsi bərbad olubam.

Necə səhrayə gedim ahu şikar eyləməyə,
Mən özüm seydi-xəmi-həlqeyi-səyyad olubam.

Ey gözüm yaği, sənin həmdəmi-zarın mən idim,
İndi nolmuş sənə, mən özgə kimi yad olubam?!

Oğru zülfündən əgər könlümü alsam, dəxi mən
Verməräm dil ona, bundan belə ustad olubam.

Ey Fəqir, bu qədi sərvin qəminə tuş olalı,
Qəmi-dəbxi unudub sərvtək azad olubam.

## MÜXƏMMƏSLƏR

Eyləmə çox qəmzə, naz, bəsdir, aman, ey gözəl,
Alma əlimdən mənim tabü təvan, ey gözəl,
Payinə qurbandı bu baş ilə can, ey gözəl,
Qamətim əyri qaşun etdi kəman, ey gözəl,
Rəhmə gəl, etmə cəfa, bəsdir, usan, ey gözəl!

Tək yaradıb hüsndə xaliqi-yekta səni,
Məhz qələtdür dutam Yusifə həmta səni,
Dinə gəlir görsə gər kafirü-tərsa səni,
Cümlə bəladən görüm saxlaya mövla səni,
Canımı nahaq alıb eyləmə qan, ey gözəl!

Ey yüzi gül, işvəgər, ləbşəkər, incə kəmər,
Hüsnüvə aşiqdilər cümlə cahan sərbəsər.
Məzhəbi qalmaz sənə eyliyə hər kəs nəzər,
Sən kimi yox mahivəş, sən kimi şirin bəşər,
Sən kimi görmüb yəqin çeşmi-cahan, ey gözəl

Kakili-mişkinüvi şanəliyib, sal yüzə,
Gürci küləh başa qoy, sürmə siyəh çək gözə,
Tirmeyi-rəz əynüvə qurşanıban çıx düzə,
Lal elə bülbülləri, gülşən ara gəl sözə,
Gəlməz ələ bir belə fəslü zaman, ey gözəl!

Ləli-ləbindən öpən abi-həyat istəməz,
Şəhdi-yüzündən doyan qəndü nəbat istəməz,
Səcdə qılan qaşuva sövmi-səlat istəməz,
Görsə səni bütpərəst latü mənat istəməz,
Öpsə yüzündən olur pir cəvan, ey gözəl!

Qaşü gözün, kiprigün qətlümə eylüb kəmin,
İşvələrin saxlayıb aşiqi-zar ilə kin,
Hiç sədəf içrə yox sən kimi dürri-Yəmin,
Xadim olammaz sənə cənnət ara hurül-eyn,
Sən kimi Tiflisdə yox qönçədəhan, ey gözəl!

Gülşənə çıx, seyr elə, sərvi nigunsar elə,
Susənü gül, sünbülə aç yüzüvü, xar elə,
Məst gözün aç qıya, nərgizi bimar elə,
Zülfünü yüzdən götür, gül yüzün izhar elə,
Bağrına qoy lalənin daği-nihan, ey gözəl!

Qoy dolanım dəmbədəm başuva pərvanətək,
Kakilivə əl çəkim teldə gəzən şanətək,
Qoyma Fəqirin sənin tərk ola biganətək.
Öpsə əgər ləblərin sağərü peymanətək,
Daxil olur cisminə ruhi-rəvan, ey gözəl!

* * *

Rəhmə gəl, eyləmə bu könlümü viran, qara göz,
Qorx xudadan, bu qədər eyləmə tüğyan, qara göz,
Qüdrətin xaliq edib səndə nümayan, qara göz,
Dəxi sən hüsndə xəlq olmuyub insan, qara göz,
Elə şükri-əhədi-qadiri-sübhan, qara göz!

Gör nə surətdi çəkib, can belə nəqqaşə fəda,
Çəkdiyi xameyi-qüdrətlə o göz, qaşə fəda,
Türki çeşmin götürən xəncəri-xunpaşə fəda,
İşvəvü qəmzəvü naz ilə o pərxaşə fəda,
Yəni yüz can zənəxin xalinə qurban, qara göz!

Dərini gördü gözüm, görmədi məscidlə künişt,
Məni divari-sərayində hesab etgilə xişt,
Sən qəbulumsan əgər xub olasan, ya rüxü zişt,
Bəsdü vəslin mənə, həqdən diləməm bağı-behişt,
İstəməm gər ola yüz hurivü qılman, qara göz.

Əyri qaşın nə səbəbdən olub amadeyi-cəng?
Kiprigün beylə olub hər biri bir tiri-xədəng,
Can bulardan qurtarammaz ola gər şirü pələng,
Bəlkə Birzü ilə Gudərzü Fəramərzü Peşəng,
Rüstəmü Küstəhəmü Samü Nəriman. qara göz!

Günümü qarə qılıb öz yüzü tək qarə telin,
Məni çalmağa dönübdür genə şahmarə telin,
Səni həqq, şanə alıb dəstinə, az darə telin,
Oxşuri yavəri-sərtibi-sipəhdarə telin,
Az qalıb eyliyə dil mülkünü talan, qara göz!

Sərvdə yoxdu belə işvəfi qamət, nə deyim?
Yerisən xəlqə qopar ruzi-qiyamət, nə deyim?
Güldə yoxdur bu qədər nazü nəzakət, nə deyim?
Bu nəzakətlə sitəm eyləmə adət, nə deyim?
Yoxudur mehrü vəfa, sən kimi dövran, qara göz!
Bir zaman sərsəri-piri bu gülüstanə əsər,

Dəxi qalmaz bu qədi-sərv belə tazavü tər,
Nə kənarinə onun mən kimi bir qumri gəzər,
Ondan əqdəm ki, görünməz bu vəcahətdən əsər,
Vəslin et aşiqi-nalanuva ehsan, qara göz.

Qoyaram dərgahinə sübhü məsa ruyi-niyaz,
Qılaram olmasa gər zümm o rüxsarə namaz,
Aldı hicran canımı, eyləmə bu həddidə naz,
Gül yüzündən bu Fəqir iylədi bir zərrəcə, az
Onu yəni edəsən busəyə mehman, qara göz!

## FATMA XANIM KƏMİNƏ

*XIX əsr Azərbaycan ədəbiyyatının tanınmış nümayəndələrindən olan Fatma xanım Kəminə 1841-ci ildə Şuşada ziyalı ailəsində anadan olmuşdur. O, "Fani" təxəllüsü ilə şeirlər yazan Ağa Mirzə Bəybabanın qızıdır. Dövrünə görə yaxşı təhsil almıs, ana dili ilə yanaşı fars dilini də mükəmməl öyrənmişdir. Qarabağın Saracıq kəndindən olan Sadıq bəy Mirzeynal oğluna ərə getmiş, beş övlad dünyaya gətirmişdir. Ömrünün sonlarında iflic xəstəliyinə tutulınuş və 1898-ci ildə Şuşada vəfat etmişdir.*

*Kəminə şeirlərini Azərbaycan və fars dillərində yazmışdır. Məhəmməd ağa Müctəhidzadə "Riyazül aşiqin " kitabında onun böyük divanı olduğunu və bu divanı şəxsən gördüyünü yazır. Ancaq həmin divan bu gün əldə yoxdur. Sairin müxtəlif cünglərdə və əlyazma kitablarında qorunub saxlanan əsərlərini Əziza Cəfərzadə toplayaraq 1971-ci ildə "Gənclik" nəşriyyatında çap etdirmişdir. Buradakı şeirlər həmin kitabdan götürulmüşdür.*

### QƏZƏLLƏR

Cana, bu nə cadudur, qaşü göz arasında,
Nitqim tutulur görcək hərdəm, söz arasında.

Gər görsə Züleyxavu Yusif səni bəzmində,
Məbhut qalar onlar yüz min qız arasında.

İnnab ləbin, cana, təşbih edib aşiqlər,
Nar danəsidir, guya, düşmüş buz arasında.

Ey dil, eləmə artıq nalən yerinə yetdi,
Saldın özün odlara, yandın köz arasında.

Əhdində vəfa varsa, məbhut nə durmuşsan?
Var kuyə, yügür-yort ta canın öz arasında.

Xuni-cigərim gözdən ol qədr rəvan olmuş,
Laf etmə. Kəminə, çox, gül tək üz arasında.

* * *

Xali-mişkinə baxın, arizi-cananə düşüb,
Deyəsən bir həbəşi səfheyi-İranə düşüb.

Mürği-dil daneyi-xalın görəli nalə çəkər,
Qisməti ruzi-əzəl ah ilə əfqanə düşüb.

Arizi-aldədir xali-siyahi, əlhəq,
Xəti-mişkin necə kim laleyi-nemanə düşüb.

Ey gözüm nuri, yüzündə bax o xali-siyahə,
Xəbər et mürği-dilə kim, odu bir danə düşüb.

Mürği-dil daneyi-xalın həvəsilə düşmüş,
Həlqeyi-zülfə ki, zəncirə çu divanə düşüb.

O kaman qaşə qoyub qəmzə oxun, türk yüzün,
Şəhrə aşub salıb, hər biri bir yanə düşüb.

Görəli dil səri-zülfini könül bənd oldu,
Misrdə Yusifi-Kənan necə zindanə düşüb.

Derimiş dilbər kim, könlü degil məndə müqim,
Dil dönüb qanə o gündən ki, bu böhtanə düşüb.

Nöqteyi-xalü gözü qaşı yığılmış niyə,
Dövrdə zülfü Kəminə kimi peykanə düşüb.

Ənbərin buyu əgər dolmuş o geysulərdə,
Belə xoş buy dəxi olmaz o xoşbulərdə.

Gər deyəm müşk, o, ahuyi-Xütəndə tapılur,
Etmişəm bəlkə xəta, yox o iy ahulərdə.

Tərbiyə etmiş onu, bəlkə, mələk, ya ki, pəri,
Var güman: gözdə olur çünki o cadulər də.

Zülfi-müşkinin alıb dövri-rüxün halə sifət,
Belə bir halət olur cümlə o məhrulərdə.

Bənd olub zülfə dəxi qaşü göz ilə xalə,
Bilməzəm ondadımı könlü və ya bulərdə?!

Gözümü kəsmənəm ol gözdən ölüncə, bəlkə,
Dili-gümgəştəni çün tapdım o yarğulərdə.

Bivəfadə nə məhəbbət, nə dəyanət, nə vəfa?!
Ey Kəminə, tapılur bəlkə də dilculərdə.

* * *

Mərizi-eşqə əlac eyləməz təbib, ölmə!
Bu dərdə çarə edər visləti-həbib, ölmə!

Visalə talib olan aşiqə bəla yetişür,
Fəraqə səbr elə, sən munca bişəkib, ölmə!

Xəyali-zülf səni xeyli natəvan edəcək,
Səni məriz edər çesmi-dilfərib, ölmə!

Fəğanü nalə çəkib, qılma hicrdən şikvə,
Budur üınid, sənə vəsl ola nəsib, ölmə!

Demə vətəndə mənə bir ənisü munis yox,
Sənə ənis qəmi-eşqdir, qərib, ölmə!

Qiyam qılmasa gər, sərvqəddü siməndam
Ki, ruzi-həşr sənə olmaz ənqərib, ölmə!

Şikayət etmə, Kəminə, rəqib cövründən,
Kəməndi-hicrə düşəp, sən kimi, rəqib, ölmə!

* * *

Şuri-eşqin eyləyib bəs ki, məni divanə,
Şöhreyi-şəhr olubam aləm-əra əfsanə.

O qədü qaməti gördükcə xudadan dilərəm,
Dolanım başına kim şəmə necə pərvanə,

Qan tutub gözlərini məst ikən peyvəstə,
Ruzi-əzzəl necə kim, tutdu mənə peymanə.

Dəst busin mənə gər mümkün ola ömrümdə,
Xaki-payinə düşüb, can verərəm mərdanə.

Lütf eylə əlimi tut ki, məni-üftadə,
Məstlikdən ayılıb bəlkə gəlim imanə.

Görcək ol zülfünü küfrə dəyişib imanı,
Gözüm öz əlim ilə, mən nə deyim Sənanə?

Eşq dərdinə ətibba qamusu acizdir,
Vəsl əlac edə məgər bu mərəzi-pünhanə.

Baxma ahuyi-Xütən vəh ki, xətaya saldı
Məni bir çeşmə-siyəh baxmaq ilə məstanə.

Dəhrdə hicr oduna yandı Kəminə, yarəb,
Həşrdə hifz elə kim, ta nə qalıb niyranə.

* * *

Nə etmişəm fələkə, boylə qıldı zar məni?
Diyari-hicr-ara zarü dilfikar məni.

Həvayi-sərvqədinlə kəman olub qəddim,
Bu çərxi-pir eləyib indi əşkbar məni.

Bəsani-surəti-bican bu künci-pünhanda,
Salubdu həlqeyi-zəncirə zülfi-yar məni.

Düşübdü kuhü biyabanə Qeysi-bipərva,
Qoyubdu həsrəti-nəzzarə aşikar məni.

Bu əşki-çeşmilə söndürrəm atəşi-hicri,
Sipəndvəş eləyib çünki biqərar məni.

Təməllüq əhli degildim, nə var idi bakim,
Kəməndi-zülfilə etmiş yarım şikar məni.

Kəminə şükr ilə hər ləhzə, hər zaman söylər:
Edibdi dərdü qəmə laşərik yar məni.

Pozuldu rövnəqi-gül, əlri-gülüstan getdi,
Saraldı gülləri, əl çəkdi bağiban getdi.

Durubdu sərv, əgər, bağin içrə müstəhkəm,
Diriğ, sərvi-rəvan getdi, əlaman, getdi.

Nə qoydu dəhrdə bir kam alub murada yetəm,
Nə aldı canımı qurtardı, cansitan getdi.

Çəməndə lal gəlib getdi dəhzəban susən,
Ki, çeşmi-nərgisi-məst oldu xunfəşan, getdi.

Nə qoydu xar ki, gül əndəlibə meyl etsin,
Nə əndəlib öz əhdində kamiran getdi.

Dönüb o əlif qədi dalə bir güi hicrində,
Diriğ, bülbül olub pir, o növcavan getdi.

Nihan olan qəmini faş qıldi mərdüm üçün,
Kəminə, dərdi-dilin oldu dastan getdi.

## ABDULLA BƏY ASİ

*Abdulla bəy Əlibəy oğlu Asi 1841-ci ildə Şuşada anadan olmuşdur. Qasım bəy Zakirin nəvəsidir. Asi təhsilini Şuşada almışdır. Ərəb, fars, rus dillərini, həmçinin Ə.Nəvaini dönə-dönə oxumaqla cığatay dilini də gözəl bilmiş, hətta bu dildə bir neçə qəzəl də yazmışdır.*

*Asi cəmi 34 il ömür sürmüş, 1874-cü ildə vəfal etmişdir.*

*Müasirlərinin dərin hörmət və məhəbbətini qazanan Asi "Məclisi-fəramüşan"ın üzvlərindən olmuş, Seyid Əzimlə dostluq etmişdir. Əsərlərinin çoxu itib-batmış, az bir hissəsi qalmışdır. Buradakı nümunələri F.Köçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981), "Poetik məclislər" (1987), "Dahilərin göz yaşı, Mərsiyələr" (1990) və "Necə qan ağlamasın daş bu gün" (1993) kitablarından götürülmüşdür.*

### QƏZƏLLƏR

Daima mən zardən ol dilbəri-bədxu qaçar,
Guya səyyad görmüş, rəm qılıb ahu qaçar.

Yoxsa kim bilmiş deyildir saz yarə müşkilə,
Rəhm edib zəxmi-dərunə yari-mişkinmu qaçar.

Bilməzəm, aya necə zülfilə xu tutmuş könül,
Rəsmdir çün nerdə bir şahin görə teyhu qaçar.

Şöleyi-rayinə məhvəşlər dəm urmaz hüsndən,
Guyiya kim, möcüzi-Musa görüb cadu qaçar.

Gizlənib könlüm hücumi-dərdü qəmdən zülf ara,
Xofdan divanə nerdə görsə hayuhu, qaçar.

Sərvqədlər içrə guya görməyibdir sərvəri,
Qumriveş dil axtarır hər su deyib "gu-gu" qaçar.

Asiya, görmüş ki, gül ol gülruxə həmta deyil,
Bəhs etməkdən səninlə bülbüli-xoşgu qaçar.

* * *

Qara gözlü, qara oldu günüm zülfün kimi qarə,
Pərişan halım ondandı, bulunmaz dərdimə çarə.

Alıb zülfi-müsəlsəl dövri-mahi-arizin yeksər,
Hərəm rahın və ya məsdud edib ərab zəvvarə.

Əcəb olmaz əgər lal olsa tuti qönçə tək qəmdən,
Açan dəm ləli-şəkkərbarını hər ləhzə güftarə.

Könül lafi-ənəlhəq eşqi-ruyində urar daim,
Nola Mənsur tək çəksə qara zülfün anı darə.

Könül mayildi nuş etsin ləbi-ləlin şərabından.
Sədai-hicr rəf olsun ki, düşmüş rənci-xummarə.

Töküb zəbri-həlahil kami-canə əfiyi-zülfün,
Nola tiryaki-ləlin eyləyə bu dərdə bir çarə.

Yetib həddi-nisabə hüsni-ruyin, müstəhəqqindir,
Zəkati-hüsnünü, ey şux, lütf et Asiyi-zarə.

* * *

Rəhm qıl, dəymə, səba, zülfi-kəci-dildarə,
Nə rəva kim, düşə vüsətdə ikən dil darə.

Eşqi-ruyində urub lafı-ənəlhəq guya,
Çəkilib zülfdə Mənsursifət dil darə.

Hər xədəngin səfi-müjganda gər kəm bulsa,
Kimsəyə etmə güman, zülfün ara dildə arə.

Qoyma kira, şanə dəyə zülfə, özün məhrəmsən,
Şərhə-şərhə ol onun tək, anı, ey dil, darə.

Asiya, çini-səri-zülfdə kim buldu könül?
Zülməti-şəb tanımaq qüdrəti yox dildarə.

* * *

Fəna mülkinə aşiq girməyincə nəfsi ram olmaz,
Məqami-"liməəllah" sirri anınçun təmam olmaz.

Könül, piri-müğanın feyzü lütfi gər ola şamil,
Meyi-vəhdət əyağın al ələ, bu mey həram olmaz.

Əzəl şəmsinə ol talib həqiqi hüsn ondandır,
Məcazi dilrübalər hüsni aləmdə müdam olmaz.

Hərimi-Kəbə, səbni-deyr yeksandır, könül, billah,
Əgər məlumə talibsən sənə fərqi-məqam olmaz.

Məqami-qürbi-yarə vasil ola aşiqi-sadiq,
Rizayi-dustdən özgə ona aləmdə kam olmaz.

Necə vasil olum ol şahə kim, gər olmasa nəzmi,
Mahü mehrü büruci-nəcm seyrində nizam olmaz.

Təriqi-eşqə, Asi, laübali qoy qədəm bir dəm –
Ki, əhli-eşqdə pərvayi-canü nəngü nam olmaz.

* * *

Olmuş məqami zülfi-pərişanı könlümün,
Bir dəm kəsilməz ah ilə əfğanı könlümün.

Rəhm eylə, səxt dəymə, səba, tari-muyinə,
Ol piçü tabə tabı görüm hanı könlümün.

Mötad olub qara günə zülfündə xoş keçər,
Min zülm yetsə, şami-qəribanı könlümün.

Zünnar zülfünə uyuban küfrə uğradı,
Salim qalır nə növ bəs imanı könlümün.

Kuyində, Asiya. bu qədər nalə eylərəm,
Təsir edərmi ol məhə əfganı könlümün'?

**NOVHƏLƏR**

Mən Hüseyni-bikəsü biyarəm ey sultani-Qeys,
Bir ələmdarı ölən sərdaram ey sultani-Qeys.

Gör nə əhvalə salıblar peykari-sədparəmi,
Bir tərəfdən ləşgəri-əşrar üzübdür çarəmi,
Səsləyəndə sən məni bağlardı Zeynəb yarəmi,
İstəsə hər kim ona qəmxarəm, ey sultani-Qeys.

Əhli-beyti qoymuşam küffar içində gəlmişəm.
Xarə çox gül tapşırıb, gülzar içində gəlmişəm,
Qoymuşam bimarımı əşrar içində gəlmişəm,
Gərdişi-çərx ilə mən çox xarəm, ey sultani-Qeys.

Getdi əmval ilə ənsarım, sınıb balü pərim,
Neynəva dəştində zülm ilə qırıldı ləşgərim,
Təşnə qurban oldu on səkkiz yaşında Əkbərim,
Gör ki, mən bitaqəti-rəftarəm, ey sultani-Qeys.

Qasimə toy eylədim bir ləhzədə yas etdilər,
Növcavan qardaşlarım bir-bir əlimdən getdilər,
Cəddimin düşmənləri hər yerdə kamə yetdilər,
Paymali-təneyi-əğyarəm, ey sultan-Qeys.

Çün məni meydanda həm Şümri-sitəmgər axtarır,
Bir şikarı-zəxmdarı, əldə xəncər axtarır,
Bir yaralı seydi yüz min fövci-ləşgər axtarır,
Mən ki, seydi-Şümri-bədkirdarəm, ey sultani-Qeys.
Qorxma, gəldim mən səni şirin əlindən qurtaram,
Taqətim yoxdur at üstə durmağa, çoxdur yaram,

Yeddi qardaşdan sora, insafdır mən sağ qalam,
Lərzə tutmuş peykərim, xunbarəm, ey sultani-Qeys.

Çün şəhi-ləbtəşnəni sən sələdin fəryadinə,
Parə-parə cismlə gəldim yetişdim dadinə,
Ağla çün əhvalimə hər dəm düşəndə yadinə,
Oğlu ölmüş həsrəti-didarəm, ey suitani-Qeys.

Hər nə gəlsə razıyam mahi-mədinəm başına,
Od düşübdür hicri-Əkbərdən bu sinəm başına,
Şümri-kafir vurmasın qamçı Səkinə başına,
Mən özizü Heydəri-Kərrarəm, ey sultani-Qeys.

Asinin göz yaşı mərhəmdir yaralı sinəmə,
Sidqi-avaz ilə səslər qıl şəfaətsən mənə,
Rüzü şəb qan ağlaram ta həşr olunca mən sənə,
Çünki mən də qəbrinə zəvvarəm, ey sultani-Qeys.

* * *

Gözün aç, gəldi oğulsuz atan imdadə, oğul,
Dur otur, qoyma gəlim bir belə fəryadə, oğul.

Şamə döndərdilə Şam əhli işıq gündüzümü,
Qəlbimə dağ çəkib, qoydular ağlar gözümü,
Əli, səndən sora ölmüş görürəm mən özümü,
Dirilik səbdi sənsiz mənə dünyada, oğul.

Əli, peykani-bəla qəlbimi bica oymaz,
Əşgimə mane olam şöleyi-ahim qoymaz,
Sən kimi oğlu ölən gərdü qübardan doymaz.
Olmaz öz mərginə hər ləhzədə amadə, oğul.

Bir ürək ki, Əli, sən tək bir oğul dağı ola,
Çox çətindir, o ürək şad ola, bir də açıla,
Qan ola qəlbi gərək, gözləri əşk ilə dola,
Hər qədər sağdı, gələ naləvü fəryadə, oğul.

Nə sitəmkardı o kəslər ki, vurub yarə sənə,
Nə sənə həqqi gəlibdi, Əli, nə rəhmi mənə,
Döndərib cismüvi oxdan gül açan bir çəmənə,
Gətirib möhnətü qəm gülşəni icadə, oğul.

Göyün ulduzlarını yaraların san veriri,
Baş açıb hər yarə cismində, Əli, qan veriri,
Başın üstündə atan, sən tək oğul can veriri,
Bəli, bir ruh iki qəlbidədi mənadə, oğul.

Bilisən, xatiri-zarım doludu nisgil ilə,
Niyə dinmirsən, Əli, dindirirəm hər dil ilə,
Mənlə bir kəlmə danış, qoyma bu suzi-dililə,
Ola tainki təsəlli dilə, şahzadə, oğul.

Qəlbimin sirrini Allah bilər, özgə nə bilir,
Necə mən ağlamayım, sən kimi bir oğlum ölür,
Baxıri halıma Səd oğlu şəmatətlə gülür,
Vururi tənə oxun bu dili-naşadə, oğul.

Bu gözəl cismüvi gördükcə quru yerdə, Əli,
Ürəyim başı yanır, dil gəliri dərdə, Əli,
Elə dərdi ki, sağalmaz bilirəm bir də,Əli,
Bexüsusi ki, müasir ola əkbadə, oğul.

İstərəm zəxmi-dili-Leylini bəlkə bitirim,
Verməmiş can səni ol bikəsü yarə yetirim,
Bilmirəm nəşüvi nə növ ilə yerdən götürüm,
Baxıram, xərməni-səbrim gediri badə, oğul,

Bənd-bəndindən edib cismivü əşrari-zimən,
Pozulan gülşənə bənzər, Əli, bu parə bədən,
Səni nə növ ilə bilməm aparım xeyməyə mən,
Yox təvan həmlinə mən bikəsü tənhadə, oğul.

Göstərir, zəxmi-sərin ayəti-şəqqülqəməri,
Bu necə zəxmdi, ey nəxli-ümidim səməri,

Günü qara eləyib itrəti-Xeyrulbəşəri,
Qoymayıb zilvə məhi-ənvəri-bəthadə, oğul.

Əli, sidq ilə olub Asi sənə növhəsəra,
Eyləyibdir o gözəl adıvı ünvani-büka,
Bir səni hər iki dünya bilir ümmidü rica,
Həmi dünyadə əvəz ver, həmi üqbadə, oğul!

* * *

Ağlama, etmə fəğan, yandım oğul, ağlama,
Yox südüm, ölsün anan, yandım oğul, ağlama,

Mən bilirəm təşnəsən, neylim, Əli, yoxdu su,
Su yolunu bağlayıb zülm ilə qövmi-ədu,
Halıva baxdıqca mən qıllam ölüm arizu,
Yox sənə mən tək yanan, yandım oğul, ağlama.

Halıvı izhar edəm, yoxdu, Əli, qardaşın,
Gəlmə belə şivənə, tökmə üzə göz yaşın,
Mən sənə qurban olum, qoy sinəm üstə başın,
Səbr elə, bir az dayan, yandını oğul, ağlama,

Gəh salıram mən səni bu quru püstanıma,
Gəh basıram can kimi sineyi-suzanıma,
Olmusan aram, oğul, od salısan canıma,
Yox suya məndən güman, yandım oğul, ağlama.

Laylayıma baxmısan, dil deyirəm ağlısan,
yandırırsan qəlbimi, əşgin üzə bağlısan,
Gəh əmisən ləblərin, sinəmi sən dağlısan,
Etmə məni bağrıqan, yandım oğul, ağlama.

Mən də, Əli, təşnəyəm sən kimi, bəs bilmisən?
Dindirirəm hər qədər, bir danışıb gülmüsən,
Hər kəs, oğul, haluva baxsa görər ölmüsən,
Bir quru candır bu can, yandım oğul, ağlama.

Əldən alıbdır, Əli, səbrimi suzi-ətəş,
Hər iki bli-ləbin solmuş, oğul, qönçəvəş,
Mən görürəm, eylisən qollarım üstündə qəş,
Kaş, Əli, ölsün anan, yandım oğul, ağlama.

İndiyədək bir nəfər görmüb, Əli, bir bəla,
Üç gecə-gündüz, oğul, sən kimi ətşan qala,
Təşnəlik aclıq ilə səbrin əlindən ala,
Qalmaya onda təvan, yandım oğul, ağlama.

Sən bilisən suzi-qəm qəlbimi eylib kəbab,
Vardı nə sinəmdə süd, nə Əli, bir cürə ab,
Bir belə gündən əzəl kaş öləydi Rübab,
Eyləməyəydi bəyan, yandım oğul, ağlama.

Ey şəhi-ləbtəşnənin gülşəninin növ gülü,
Həll edə, var Asinin dildə, ƏIi, müşkülü,
Aləmi odlar yəqin bikəs anan bu dili,
Ağlama, etmə fəğan, yandım oğul, ağlama.

## İSMAYIL BƏY NAKAM

*Əsərlərini "Nakam" təxəllüsü ilə yazan İsmayıl bəy Hacı Məhəmməd bəy oğlu Sədrəddinbəyov 1841-ci ildə Nuxa (indiki Şəki) şəhərində mülkədar ailəsində doğulmuşdur. İlk təhsilini doğma şəhərində almış, dövrünün biliklərinə dərindən yiyələnmişdir. Firidun bəy Köçərli yazır ki, Nakam qırx yaşına qədər dövlətli və əmlak sahibi-mülkədar olub ehtiyacsız güzəran edirmiş və lakin qırx yaşından sonra dövləti və əmlakı getdikcə əlindən çıxıb, məişəti genişlikdən darlığa çevrilmiş və ömrünün axırlarını əlində baqi qalan bir para mülkdən gələn cüzi mədaxil ilə keçirərmiş. Şair 1906-cı ildə Nuxada ölmüş və orada dəfn edilmişdir,*

*Nakamın "Gənci-ədəb" və "Qəzəliyyat" adlanan əlyazma kitabları qorunub saxlansa da, əsərləri tam halda çap edilməmişdir, Buradakı nümunələr F.Köçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Keçindin aləmi-heyrətdə, ey dil,
Keçirdin ömrünü qəflətdə, ey dil!

Görüb bu aləmi-adəmfəribi
Unutdun əhdi bir röyətdə, ey dil!

Fəraqət hasil et, tərki-səva qıl,
Yetər ah etdiyin möhnətdə, ey dil!

İrişdi aşiqan yeksər vüsalə
Həmin sənsən qalan firqətdə, ey dil!

Mücərrəd ol, mücərrəd ol da, gör də,
Nələr var guşeyi-vəhdətdə, ey dil!

Həzəran dərdi-rühazar çəkdin
Yenə töhmətdəsən, töhmətdə, ey dil!

Olub Nakamə dil nakam oldun,
Yaxıldın atəşi-həsrətdə, ey dil!

* * *

Fəğan ki, künhi-qəmi-can bilinmədi, qaldı,
Təvəqqeyi-dili-nalan bilinmədi, qaldı.

Simati-dəhrdə hər kəs nəsibini buldu,
Nəsibi-zümreyi-rindan bilinmədi, qaldı.

Cəfayi-firqəti-canan bilindi muybəmu,
Səfayi-vəsl kəmakən bilinmədi, qaldı.

Cahanda hər mərəzə bir əlac olub peyda,
Fəraq dərdinə dərman bilinmədi qaldı.

Kitabi-eşqdə dərki-üqul əcz bulub,
Həzar nükteyi-pünhan bilinmədi, qaldı.

Bilindi qisseyi-aləm səbahi-həşr oldu,
Hekayəli-şəbi-hicran bilinmədi, qaldı,

Kimin əsiri, kimin namuradiyəm, Nakam,
Nədir bu etdiyin əfğan bilinmədi, qaldı.

* * *

Cami-səfadə qalmayıb artıq əsər-məsər,
Mirati-dildə qət-qət olubdur kədər-mədər.

Müşkülsə də iqamət əgər kuyi-yardə,
Mümkün deyil bu büqədən, ey dil, səfər-məfər.

Təzvirdir, fəribdir axır nəticəsi,
Hər bir kəlamın olsa məali əgər-məgər.

Getmiş qərar təndə Süleymani-rubdən,
Yoxdur hənuz hüdhüdi-dildən xəbər-məbər.

Məcnun kimi kənar olub adabi-eşqdən,
Hər Leylivəş cəmalına qılmam nəzər-məzər.

Mən aşiqəm o şahidə kim, çıxsa pərdədən,
Nabud olur süphdə xur-mur, qəmər-məmər.

Nakam, yandın atəşi-nıöhnətdə, bəd əz in,
Yaxmaz səni cəhimü məhimü səqər-məqər.

## QƏSİDƏ

Mənəm əgərçi o tərdaməni-siyəhkirdar –
Ki, ruzü şəb əməlimdir xətayi-nahəmvar.

Vəli yeganəgiyi-xaliqi-rəvanbəxşə
Dəmi-ələstdə bissidq etmişəm iqrar -

Ki, eybpuş, günəhbəxşdir, qəfurdur o,
Odur həlimü səburü şəkur, odur səttar.

Odur rəhimü Ğəfurü Rəufli Heyyü Vədud,
Qədimü Qadirü Qəyyumü Vahidü Ğəffar.

Bir ismi-əzəmi Allahdır, biri Rəhman,
Bu iki ismdə min nükteyi-bəşarət var.

Digər risalətini xatəmün-nəbiyyənin
Ki, ruzi-həşrə odur həm şəfiü həm salar.

Edib zəban üə iqrar, qəlb ilə təsdiq,
Kəminə ümmət olub, olmuşam, sədaqətkar.

Həbibi-xaliqi-rəbman nəticeyi-lövlak,
Rehimi-rəhməti-aləm, Məhəmmədi-muxtar -

Ki, cümlə ümməti-müzniblərin şəfaət edib,
Alıb behiştə gətirmək deyil ona düşvar.

Digər məvəddəti-qürəba, məhəbbəti-əshab,
Sədaqəti-şürəfa, həm iradəti-ənsar.

Dilimdə sabit olub, dəmbədəm təzayüd edib,
Bəsani-ruh bulubdur, rüsux olub padar.

Ələlxüsus o yarani-bivəfanın kim,
Biri cənab Əbubəkirdir, o sidqşüar.

Təriqi-dində həqqin rizasini gözədüb,
Cəmii-maməlekin bəzl qıldı, etdi nisar.

Həbibi-əkrəmü əfxəm yolunda ğar içrə
Təni-əzizini qıldı fədayi-niştəri-mar.

Biri də həzərəti-Faruqdur ki, ol sərvər
Cahanda qıldı ədalət nə olduğun izhar.

Ucaltdi çar cəhətdə livayi-islami,
Olub da rövnəqi-şərə şüyu, dinə mədar.

Götürdü küfrü cahanda, cahanı pak etdi,
Sipahi-nüsrətəsər sövq edib diyar-diyar.

Biri də həzrəti-Osman cənabi-Zünnureyn –
Kodurüsumi-vəfada səramədi-ibrar.

Hesab olursa əgər əhdinin fütuhatı,
Dehatü şəhrü qərayə olur həzar-həzar.

Həyavü helm idi ol pakizədə xas ancaq –
Ki, baxmaz idi səmayə, edib həyadan ar

Biri dəxi şəhi-Düldül-səvar Əlidir kim,
Bir adıdır Əsədullah. digəri Kərrar.

Məhi-sipəhri-imamət, düri-künuzi-vəfa,
Kilidi gənci-əmanət, xəzineyi-əsrar.

İmami-cinnü bəşər, şahi-övliyadır o,
Müridi-müxlisidir cümlə övliyayi-kübar.

Deyil o kimsədə kim, bübbi-Mürtəza mövcud,
İki cahanda o bədbəxtdir səzayi-təbar.

Digər zəbaneyi-hübbi-əimmeyi-məsum
Dilimdə dağ yaxıb eyləmiş şəqayiq var.

Dilim bu atəşi-hübb içrə dəmbədəm yaxılıb,
Bu kimya ilə olmuş künun tamam eyyar.

Bəli, o kəsdə ki, vardır vidadi-ali-nəbi,
Halaldır ona cənnət, haramdır ona nar.

Bəli, o dildə ki, vardır məhəbbəti-sibteyn,
Səadəti-əzəlidir o hübb, ol asar.

İnayət eylə mədəd, ya Əli ki, bari-günəh,
Qılıb xəmidə məni aləm içrə etmiş xar.

Gözüm piyaləsi dönmüş piyaleyi-zəlirə,
Olub qəmi-Həsəni-Müctəbadən atəşbar.

Necə anıb ləbi-xüşkün Hüseyni-məzlumun,
Yaxılmasın cigərim nari-qəmdə leylü nahar.

Çıxarmı xatiri-ümmətdən ol cəfayi-əlim,
Olarmı hiç fəramuş o cövri-dilazar -

Ki, Kərbəladə Huseyni-şəhidə eylədilər
Fədaiyani-şəqavət müaşiri-füccar.

İmami çarüm Zeynəlibad eşqindən
Edib fəğan, oluram ta səhər sitarəşümar.

Dilimdə qönçeyi-hübbi-Məhəmmədi-Bağır,
Olub şikiftə, edibdir vücudumu gülzar.

Bu buyi-hübb ilə xaki-məzarım əlyəqdir,
Olursa qibtəgəhi-nafeyi-qəzali-tatar.

Əcəb deyil əsəri-hübbi-Cəfəri-Sadiq
Məni edərsə güli-tazə tək şüküftəüzar.

Təriqi-eşqinə Musayi-Kazimin, billah,
Səzadır olsa dilü canım ər fəda sədbar.

Bərati-hübbi-Əliyyür-Rizayi canımda
Nicati-ruzi-cəzadan çox etmişəm əzxar.

Müjə səfindən ələ abnus əsa almış,
Təvafı-rövzəsi şövq ilə mərdümül-əbsar.

Xəyali-nəti-Məhəmməd Təqüədix könlüm,
Dürudxani-Məhəmməd və itrəti-əthar.

Səfayi-eşqi-cəmali-Nəqilə bulmuşdur
Bu ünsüra-qəfəs içrə hümayi-ruh qərar.

Bu ol Əliyyi-Nəqidir ki, xəsmü münkirini
Sənü-xamə olan nəqhü şir qıldı şikar.

Təəşşüqi-Həsənül-Əsgəri (ilə) daim
Fəzayi-şövqdə könlüm neyi-cününə səvar.

Yəli-məhəbbətidir ərseyi-vücudimdə
Müdam ərbədəkarü həmişə nizəgüzar.

Digər Məhəmməd Mehdi, kodur imami-zaman,
Qüdumuna nigərandır əleddəvam ənzar.

Yolunda verməyə can qalmışam füsuskönan,
Həmarə didə berəh bil-eşiyye vei ibkar.

Dəxüi-lütfünüzəm, lütf edin, ey ali-nəbi,
Nəzərdən eyləməyin həşrdə məni də kənar.

Sükut qıl dəxi, Nakam kim, açıb siirin
Gərib rəngdə qıldın sədaqətin işar.

Bu bəzmi-eşqdə qəmxaneyi-məhəbbətdən
Bəhər dəqiqə peyapey bəhər nəfs təkrar.

Meyi-məhəbbəti-ali rəsuldan, ya rəb,
İnayət eylə mənə bir piyaleyi-sərşar.

## MÜSƏMMƏN

Ol dəmdə kim ədəmdə vücudim nihan idi,
Birəng idim, qərargəhim binişan idi,
Şənim şükuhi qibtəgehi-qüdsiyan idi,
Zülfi-nigar mürği-dilə aşiyan idi,
Baği-səfadə bülbüli-can nəğməxan idi,
Canana can, dilbərə dil mehriban idi,
Vəslətdə idi canü könül, şadiman idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Nə qifli-"nun"güşayişinə "Kaf" olub kilid,
Nə eyləmişdi aləmi-imkani müstəfid,
Nə əql idi mükəlləf, nə nəfs idi ənid,
Nə vədə dilgüşa idi, nə qəmfəza vəid,
Nə bimi-dilxəraş, nə canbəxş idi ümid,
Adəm hənuz abü gil içreydi napədid,
Mövcud cümlə müntəziri-kunfəkan idi.
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Dərkar olub bu tarimi-niliyyi-nöhqübab,
Ta olmamışdı ünsüri-əcsam feyzyab,
Əhdi-şəbab keçmək üçün ömr edib şitab,
Fövq olmayırdı dəbdebeyi-mövsümi-şəbab,
Mülki-vücudi qılmağa seyri-fəna xərab,
Dövr etməyirdi aləmi-heyətdə inqilab,
Mahiyyəti-vücudə qədr pasiban idi
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Nə intizam bulmuş idi nəzmi-kainat,
Nə olmuş idi zatə əta kisveyi-sifat,
Nə gəlmiş idi zahirə eyni-təəyyünat,
Nə kambəxş vəsl idi abayə ümməhat,
Nə kəşf idi nükati-müəmmayi-hadisat,
Nə əql idi məşvəşi-rəmzi-təəllüqat,
Nə dil səqimi-keşməkeşi-inü an idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Xoş ol zaman ki, aşiqi-gümnam idi könül,
Varəsteyi-təəllüqi-övham idi könül,
Dərbəndi-çini-zülfi-siyəhfəm idı könül,
Gah, saqi, gəh şərab, gəhi cam idi könül,
Pərvərdeyi-sükun idi, aram idi könül,
Bəzmi-vüsali-yardə nakam idi könül,
Peyvəstə səbzü xürrəmü kamran idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

Ta gəlməmişdi mövsümi-həngameyi-ələst,
Zərrat idi müəzzəzü məsudü həqpərəst,
Səngi-qürur şişeyi-əhdi qılıb şikəst,
Qədri-büləndruh hənuz olmamışdı pəsl,
Damani-vəsli şahidi-məna idi bədəst,
Qılmışdı canı şərbəti-didari-yar məst,
Gərm idi bəzm, sağəri-mey dər miyan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

İrdi zamani-zilləti-hicran ehtiqar,
Tərkib olundu qeydimə bu ünsüri hisar,
Bu məhbəsi-küduratə naçar edib güzar,
Nakam gəldim aləmi-nasutə xarü zar,
Getdi əlimdən axır o rifət, o etibar –
Kim, bulmuş idim ərseyi-lahutdə qərar,
Bir Adəm idim onda, məqamım cinan idi,
Dəmlər o dəmlər idi, zaman ol zaman idi.

**MÜLƏMMƏ**

Nədir, ey dil, bu təfazül, nədir, ey dil bu rüqud,
Hanı peymanı-ələstü hanı əşrafü ühud?
Sərf qıl seyini, kəsbi-şərəf et, olma künud,
"Şərəfi-nəfs bəcudəst, kəramət bəsücud,
Hər ki, in hər dü nədarəd, ədəməş beh zi vücud".

İrməmiş mərhəleyi-əmniyətə bir rəhrov.
Ədəmabadə gedər ləhzədə min rəhrovi-nov,

İftixar etmə olursansa bəsani-xosrov,
"Ey ki, dər neməti-nazi, bəcahan qürrə məşov -
Ki, məhaləst dərin mərhələ imkani-xülud".

Etmə qəm, olsa da idbarə mübəddəl iqbal –
Ki, bu deyri-kürənin cilvəsidir zilli-zəval,
Dəyməz ənduhinə bu qəmkədə, bu dari-vəbal,
"Ey ki, dər şiddəti-fəqriyyü pərişaniyi-hal,
Səbr kön kin dü-sə, ruzi bəsər ayəd mədud".

Peyrovi-xahiş olub az üçün az eylə təlaş,
Olma məğrur olub aşüfteyi-alayiş faş,
Naxüni-ücb ilə etmə dili-insafi xəraş,
"Xaki-rahi ki, bər u migüzəri sakin baş –
Ki, üyunəstü cüfunəstü xüdudəstü qüdud".

Budur ol günbədi-mərdümkəşi-viranpərəst, -
Ki, edib bəzmi-cahanda neçə peymanə şikəst,
Eyləmişdir neçə eyvani-fələkrifəti pəst,
"İn həman çeşmeyi-xurşidi-cahanəfruzəst –
Ki, həmitaft bər arəmgəhi-Adü Səmud".

Nə olub bihudə idbari-cahan ilə novan,
Nə baxıb cilveyi-iqbalma ol nazkönan,
Olma məftuni-cahan olsa sənin mülki-cahan,
"Xaki-Misri-tərəbəngiz nə bini ki, həman,
Xaki-Misrəsti vəli bər səri-Fironü cünud".

Getməmiş hiç cahandust cahandan xürsənd,
Əcəbəm kim yenə aləmdir ona xahişmənd,
Ey xoşa kim ki, bu dünyada deyildir dilbənd,
"Dünya an qədr nədarəd ki, bəru rəşk bərənd,
Ey bəradər ki, nə məhsud bemanəd, nə həsud".

Hiteyi-rənci-zərurətdə olub müztər əgər,
Nari-üsrət yaxılsa dilü canım yeksər,
Etmə hər nakəsü kəmhimmətə izhari-kədər,

"Dəsti-hacət çü bəri, pişi-xudavəndi bər –
Ki, kəriməstü rəhiməstü ğəfürəstü vedud".

Odur ancaq məliki-zəlkərəmü zəlehsan,
Hadiyü münimu vəhhabü rəufü rəhman,
Samü-nalişi-puşideyi-hacətməndan,
"Kərəməş namütənahi, niəməş bipayan,
Hiç xahəndə əz in dər nərəvəd biməqsud".

Cilvə qıldıqca dəmadəm niəmi sııybecu,
Eyləyib çeşmeyi-ixlasda təcdidi-vüzu,
Dərgahi-izzətinə cümlə qoyur əcz ilə ru,
"Əz səra ta bə-Sürəyya bəübudiyyəti-u,
Həmə dər zikrü münacatü qiyaməndü qüud".

Ruzü şəb sabit olub daireyi-əhddə, sən
Həqqə təslim olub feyz bulub taətdən,
Eylə nuri-şərəfi-zatını gün-gün rövşən,
"Qiyməti-xudra bəmənahiyyü məlahi məşikən,
Gərət iman dürüstəst bəruzi-mövud".

Daməni-piri edib eşqdə, Nakam, bədəst,
Pəndi-canbəxşinə ləbbeyk dedin ruzi-ələst,
Olmamış sən kimi bir müxlisi-piranpərəst,
"Pəndi-Sədi ki, kilidi-dəri-gənci-sədəst,
Nətəvaned ki, bəca avarəd illa məsud".

## MİRZƏ RƏHİM FƏNA

*Mirzə Rəhim 1841-ci ildə Şuşada doğulmuşdur. Təhsilini Şuşanın görkəmli alimlərindən sayılan Mirzə Əbdülqasımdan atmışdır. Atası Mirzə Məmmədbağır Mehdiqulu xanın saray mirzəsi olmuş, xanlığın mədaxü-məxaric işlərinə baxmışdır, Mirzə Məmmədbağır öləndən sonra, yəni 1872-ci ildən onun vəzifəsini oğlu Mirzə Rəhim yerinə yetirmişdir. Şair 1931-ci il fevral ayının 11-də Bakıda vəfat etmişdir.*

*Mirzə Rəhim "Məclisi-üns"ü təşkil edənlərdən biridir. Əvvəllər Aşiq, sonralar Fəna təxəllüsləri ilə Azərbaycan və fars dillərində yazmışdır. Klassik poeziyanın hər növündə şeirləri olmuş, lakin əsərlərinin çoxu itib-batmışdır. Fəna həm də "Tarixi-cədidi-Qarabağ" ("Qarabağın yeni tarixi") adlı əsərin müəllifidir.*

*Burada verilən məlumat və şeirlər "Poetik məclislər" (1987) kilabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Nə məlamət əsər etmiş görəsən dildarə
Ki, çəkib yardan əl, uydu yenə əğyarə?

Hansı məşuqə deyir aşiqinə, eşqi unut?
Hansı tacirdi rəvac istəmədi bazarə?

Bivəfa yari-cəfakarım urub səngi-cəfa,
Şişeyi-xatiri məhzunum olub sədparə.

Məni aşüfta edən qeyrilə yar olmağıdır,
Cövri-hicrilə könül gəlməz idi zinharə.

Nə bileydim ki, səri-zülfi giriftarı olub,
Qalar axırda qara günlü könül avarə.

Ey könül, səbr elə kim, xameyi-təqdir yazıb,
Yar ola qisməti-əğyar, yetə gül xarə.

Bülbüli-zarə deyin, keçdi sənin əyyamın,
Vəqt odur kim, tapa yol zağü zəğən gülzarə.

Gülşəni-eşq xəzan buldu, Fəna oldu xəmuş,
Bir də indən belə haşa ki, gələ göftarə.

* * *

Hicrin edibdi könlüm evin qarət, ağlaram[1],
Çün ağlamaq olubdu mənə adət, ağlaram.

Ta var idi fəraqına tabım, səbur idim,
İmdi yoxumdu səbr, nedim taqət, ağlaram.

Qəddin fəraqı başıma gətdi qiyaməti,
Ta həşr olunca hər dəmü hər saət ağlaram.

Zülfü rüxün xəyalına sərf oldu ruzü şəb,
Ömrümdə ruzü şəb olmamışam rahət, ağlaram.

Xəlqə nədir ziyanı mənim əşki-didəmin?
Bidərdlər edəllə mənə töhmət, ağlaram.

Söhbət macalı olmadı bir dəm səninlə heyf,
Həm dəm qılıb xəyalın ilə söhbət, ağlaram.

Bu giryədir açan dili-qəmgini-zarımı,
Göz yaşım ilə yoxdu mənə halət, ağlaram.

Ruyin fəraqıdı səbəbi-giryeyi-Fəna,
Didarına qoyubdu fələk həsrət, ağlaram.

* * *

Bir k’s ki, qəm düçan ola, ağlar, ağlamaz?
Ənduhü qüssə yan ola, ağlar, ağlamaz?

---

[1] M.R.Fəna bu qəzəli gizli ınəhəbbət bəslədiyi Natəvanı nəzərdə tutaraq yazmışdır

Şaxi-mürada mürği-dili qonmamış hənuz,
Səyyadi-qəm şikarı ola, ağlar, ağlamaz?

Zülfün əsiri oldu könül sərneviştdən,
Kim tirəbəxti-tarı ola, ağlar, ağlamaz?

Vəsli-nigarə adəl edib şadkam olan,
Dərdi-fəraq zarı ola, ağlar, ağlamaz?

Bir bülbülün ki, gülşəni pamali-xar olub,
Misli-xəzan baharı, ola ağlar, ağlamaz?

Məhnət oxu dəyibdi dili-dərdiməndimə,
Ha boylə zəxmkan ola, ağlar, ağlamaz?

Yoxdur könüldən özgə həyatımda bir güman,
Hər kim ki, böylə yarı ola, ağlar, ağlamaz?

Hər kim əsiri bir gülün ola mən kimi,
Yarı dilində xan ola, ağlar, ağlamaz?

Bidil Fəna vəfa diləyib, yara can verib,
Əğfara yar yarı ola, ağlar, ağlamaz?

## ŞAHNİGAR XANIM RƏNCUR

*XIX əsr şairlərindan olan Şahnigar xanım Rəncurun həyat və yaradıcılığı, lazımınca öyrənilməmişdir. Firidun bəy Köçərli onun haqqında yazır ki, "Qazax şüərasının naziktəblərindən birisi hesab olunur". Qazax şəhərinin yaxınlığında Ăğköynək kəndində doğulmuş və "təmami Qazaxda "Mollaxanım" ləqəbi ilə iştihar bulmuşdur (şöhrətlənmişdir - Z.Ə)... "Mollaxanım" ziyadə möminə və abidə, ismətli və həyalı bir övrət idi ki, vaxtının çoxunu ibadət və riyazətdə keçirirdi. Ol səbəbdən ona "Mollaxanım " ləqəbi verilmişdir...*

*Rəncurun yaradıcılığının əksəri münacat, ınərsiyə, maddeyi-tarix və sair dost və əhibbaları arasında vüqua gələn nəviştəcat (əsərlər - Z.Ə.) qismindən olub, qəzəliyyati - vəsfi-dilbər kimi əsərləri azdır. Hacı Mirhəmza Əfəndinin müridlərindən olduğu üçün əşarü kəlamının çoxunda ol cənab tutduğu məsləkdə olduğunu bildirib, iluhiyyat və mənəviyyat aləmindən bəhs edilir.*

*Şahnigar xanımın əsərləri bütöv şəkildə əldə yoxdur. Buradakı şeirlər F.Köçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981) kitabından gotürülmüşdür.*

### QƏZƏLLƏR

Könül çün qəsri-şövqündür, ilahi, beyti-qəm qılma,
Dəxi ol iştiyaqından cüda bir ləhzə dəm qılma!

Xəyali-şur ilə, şahim, pərişan etmə dil şəhrin,
Qədim dəhr içrə ol dərdü qəmin dəstində xəra qılma!,

Üzü qara qulam bir bu fənayi-bibəqa içrə,
Rəhima, rəhmini məndən inayət birlə kəm qılma!

Məhəbbət dürcünü hifz et, dəmadəm mehri-kəndində,
Rəqibin vermə məqsudin, əlim bicami-Cəm qilma!

Cahanda dur qıl bizövq olan qəmlərdən əmma ol
Qəmi-eşqinlə Rəncurun üzün biəşkü nəm qılma!

* * *

Ey dəriğa kim, o şahın məh camalın görmədim,
Üz sürüb dərgahına, rüxsari-alın görmədim.

Ötmədim kuyində hər şəb ta səhər bülbül kimi,
Yetmədim məqsudə bir dəm, gül vüsalın görmədim.

Dəsti-pakin bus edib, həm hər tərəf "hu-hu" deyə,
Seyr edən sərməsti-rindi-laübalın görmədim.

Ey dəriğa kim, o mahın həlqeyi-üşşaqdə
Seyri-çalakın, vücudi-bimisalın görmədim.

Ey dəriğa, dərgahında aşiqi-şeydasının,
Xub avazın, dəxi şirin məqalın görmədim.

Əfv qıl, ya rəbbanə, hər dəm dili-divanəmi
Cürmü üsyan ilə gördüm, yaxşı halın görmədim

Dər cahan, əlhəmdülilləh, xəsteyi-Rəncurənin
Mədhi-şahından səvayi bir kəlamın görmədim.

***

Aludeyi-sərməstəm, bu kar nədir bilməm,
Saqi ilə həmdəstəm, sərşar nədir bilməm.

Aludeyi-bir yarəpı, eşqində bu gün zarəm,
Dəymə ki, sızıllarəm, azar nədir bilməm.

Aludeyi-gülzarəm, dillərdəki göftarəm,
Sanmaz məni kim, xarəm, gülzar nədir bilməm.

Aludeyi-həmsayəm, düşməz dərinə sayəm,
Çün şeirdürur mayəm, göftar nədir bilməm.

Aludeyi-dildarəm, hər şamü səhər zarəm,
Bir çeşmə giriftarəm, xummar nədir bilməm.

Aludeyi-şahmarəm, yalvarmada bir marəm,
Zülfilə günüqarəm, terrar nədir bilməm.

Aludeyi-in karəm, aşüfteyi-bir yarəm,
Mən talibi-dildarəm, əğyar nədir bilməm.

## GƏRAYLI

Nə küfrüm var, nə imanım,
Nə dinim var, nə ədyanım,
Fəəmma şahi-qüfranə
Ümidim, biimanəm mən.

Nə dindarəm, nə islaməm,
Nə meynuşəm, nə pürcaməm,
Nə Bəsrə əhli, nə Şaməm,
Nə əz Hindü İranəm mən.

Nə şiə, sünniyəm pürlaf,
Çahar yarə könlüm saf,
Nə əhli-zülmi-biinsaf,
Nə mərziyə inanəm mən.

Müavi həqqinə ləni,
Edərəm müttəsil, yəni,
Bulardır küfri-biməni,
Bu əhl ilə yamanəm mən.

Nə hüsn əhli kəmalım var,
Nə bir sahibcamalım var,
Nə mülkim var, nə malım var,
Deyirlər bir şəbanəm mən.

Nə göftarım həqiqətdir,
Nə rahım bir təriqətdir,
Danışsam, nə bəliğətdir,
Nə bir əhli-iqanəm mən.

Nə dünya, əhli-üqbayəm,
Nə sövda, əhli-rüsvayəm,
Nə rahətdə fərəhzayəm,
Nə həqdən bigümanəm mən.

Nə bəxtim var, nə də biqəm,
Nə əladır, nə bəxtim kəm.
Nə şad oldum, nə çeşmim nəm,
Nə rüsvayi-cahanam mən.

Nədir talib, nədir mətlub,
Nədir rağib, nədir mərğub,
Nədir cazib, nədir məczub,
Nə zənn olsa, cinanəm mən.

## MOLLA MƏHƏMMƏD ZÖVİ

*Molla Məhəmməd Zövi 1843-cü ildə Şamaxıda doğulmuşdur. Doğma yurdunda mədrəsə təhsili aldıqdan sonra Muğana köçüb, uzun müddət müəllimlik etmişdir. Seyid Əzim Şirvaninin dərin rəğbətini qazanan Zövi "Beytüs-səfa" ədəbi məclisinin üzvlərindən olmuşdur. Onun şeirlər divanı AMEA Füzuli adına Əlyazmalar İnstitutunda saxlanılır. Əsərlərinin bəziləri F.Köçərlinin "Azərbaycan ədəbiyyatı" (II cild, 1981), Seyid Əzim Şirvaninin "Əsərləri" (III cild, 1974) və "Poetik məclislər" (1987) kitablarında dərc edilmişdir. Buradakı nümunələr həmin mənbələrdən götürülmüşdür.*

### QƏZƏLLƏR

Cəzbə nədəndi hüsni-dilarada bümədim,
Nəşə nədəndi badeyi-həmradə bilmədim.

Xaliq deyil ki, bir şeyə möhtac xəlqdən,
Nə rəmz var bu xilqəti-əşyadə bilmədim.

Bimərifət qənidi, fəqir əhli-mərifət
Fəqrü ğina nədəndi bu dimyadə bilmədim.

Xab içrə hər nə görsə, yəqindir oyanmamış,
Nə sirr var bu aləmi-röyadə bilmədim.

Nə gəldiyim məqamımı, nə getdiyim yerim,
Gəlmək bu getməyə nə var ortadə bilmədim.

Ağzında söz deyib danışan şəxsi qanmadım,
Kimdir baxan bu dideyi-bünyadə, bilmədim.

Can özgə, cism özgədi ya müttəhiddilər,
Can hansı cüzvdür tənü əzadə bilmədim.

Göz görməyən cəvahiri mən necə dərk edim,
Zahirdə çün nə var bu məvada bilmədim.

Öz kəsbidirmi, Zövi, cahan içrə nikü bəd,
Ya həq veribdi aləmi-mənada bilmədim.

* * *

Xoş ol ki, meykədə aşiyanəmiz vardı,
Müdam qülqüli-meydən təranəmiz vardı.

Edəndə məscidə dəvət bizi müəzzinlər,
Suali-rəddinə yüz min behanəmiz vardı.

Xərabə mülki zürufü füruş əbavü qəba,
Şərabə sərf elədik hər təvanəmiz vardı.

Əgərçi olmuşuq indi əsiri-qeydi-əyal,
Deyildi böylə, bizim də zəmanəmiz vardı.

Əgərçi Zövi kimi indi xanəbərduşəm,
Xoş ol ki, meykədə küncündə xanəmiz vardı.

* * *

Olu, ya rəb, bu ki, mən rövzeyi-rizvanə gedəm?
Rahəti-canım üçün xidməti-Şirvanə gedəm?

Qurtarıb məhbəsi-səhrayi-Muğan cövründən,
Rəşki-firdovsi-bərin sahəti-Şirvanə gedəm?

Xarü xaşakü qarağani-Muğandan qutarıb,
Gülü gülzari-Şəmaxidə gülüstanə gedəm?

Qurtarıb səbhəşümar olmaqdan məsciddə,
Səhni-meyxanədə nuş etməyə peymanə gedəm?

Təngə gəldim bu riyaməslək olan zahiddən,
Ey xoş ol bəzmi-səfa, məşribi-rindanə gedəm?

Məscid əhlində ki, yox zövq, xudaya, nolu bir
Guşeyi-meykədədə məclisi-ürfanə gedəm?

Zövi tək bangi-müəzzindən olub asudə,
Nəğmeyi-taru dəfü bərbəti-xoşxanə gedəm.

* * *

Məcnun oluram ol büti-məhpeykəri görcək.
Əlbəttə ki, məcnun olu mərdüm pəri görcək.

Bilməm ki, mənə naz eləyir, ya ki, sitəmdir,
Qafil ki ötər yar məni-müztəri görcək.

Hər ləhzə ki görsəm, dilərəm ləlüvü öpmək,
Tuti nə təhəmmül eləsin şəkkəri görcək.

Od tutdu könül zülfüvü ruyündə görəndə,
Ol növ ki beytülləh ara kafəri görcək.

Qurbanın olum, gəl bu qədər etmə təğafül,
Qurbanın olan Zöviyi-qəmpərvəri görcək.

* * *

Qoymuşdu gər fələk məni həsrət cəmalına,
Səd şükr, aqibət ki yetişdim vüsalına.

Hicri-rüxundə giryə ilə kur olan gözüm,
Baxdı doyunca arizi-fərxəndəfalına.

Artar könüldə şövqi-təmaşayi-arizin,
Baxdıqca həsrətilə sənin xəttü xalına.

Qəm çəkmə, ey könül, dəxi eyşü nişat qıl –
Kim, oldu çarə möhnətü dərdü məlalına.

Qorxum budur ki, rəşk edə bu çərxi-kəcmədar,
Həsrət qoya genə məni, ey gül, cəmalına.

Lütf etmə qeyrə, öldürü rəşk, ey pəri, məni,
Düşmə dəxi amandı, əzəlki xisalına.

Bil vəsli-yar qədrini, gəlməzmi, Zöviya,
Hicrində çəkdiyim qəmü möhnət xəyalına?

***

Gözlərim bəs ki tökər hicrin ilə qan, sənsiz,
Qandan axır salacaq aləmə tufan sənsiz.

Xari-matəmgədədir çeşmimə, billah əgər,
Eyləsəm gəşti-gülü seyri-gülüstan sənsiz.

Qıl tərəhhüm, elə bir tiğ ilə sədparə məni,
Nəyə lazımdı sərü cismü dilü can sənsiz.

Gəlməyir çeşminə xəlqin gecələr hiç yuxu,
Bəs ki ey məh, qılıram naləvü əfqan sənsiz.

Gər yolun düşsə səba, Ağdaşa, məndən sölə kim.
Verdi can möhnət ilə Zöviyi-nalan sənsiz.

* * *

Nə saqiyü nə ləbi-ləlfamə müştaqəm,
Nə rahi-ruhəfzayə, nə camə müştaqəm.

Bəsani-zəhr məzaqımda təlxdir şəkkər,
Zibəs ki ol məhi-şirinkəlamə müştaqəm.

Əzəldə istər idim vəslüvü, vəli hala
Nəvidi-qətl verən bir pəyamə müştaqəm.

Nə sərvə meyl edərəm, nə sənubərə kim, mən
O qədr ol büti-tubaqiyamə müştəqam.

O şəms vəsli deyil arizu mənə, Zövi,
Dilindən ol sənəmin bir səlamə müştaqəm.

## MİRZƏ ƏLİ XAN LƏLİ

*Ləli XIX əsrdə yaşayıb yaratmış görkəmli Azərbaycan şairlərindəndir. 1845-ci ildə Təbrizdə anadan olmuşdur, Gənc yaşlarında ticarətlə məşğul olmaqla bərabər təhsil də almışdır. Sonralar ticarəti tərk edib, əvvəlcə Tehranda, sonra İstambulda tibbi təhsilini başa çatdıraraq Şəmsülhükəma ləqəbi qazanmışdir. Ömrünün son illərində səfərə çıxan şair Qafqazın müxtəlif yerlərində, İstambulda və Misirdə olmuşdur. 1907-ci ildə Tiflisdə vəfat etmişdir.*

*Ədəbi yaradıcılığa kiçik yaşlarından başlayan Ləli lirik və yumoristik əsərlər yazmışdır. Onun azərbaycanca və farsca divanı dəfələrlə Təbrizdə çap edilmişdir. Əsərlərindən nümunələr və haqqında verilən məlumal "Cənubi Azərbaycan ədəbiyyatı antologiyast" II cild, 1981) kitabından götürülmüşdür.*

## QƏZƏLLƏR

Gətirdi nəşeyi-mey, saqiya, nə şurə məni,
Ki, şövqi-arizi-canan çəkib hüzurə məni.

Cəmali-şahidi-qeyb istərəm Kəlimasa,
Amandı tez yetirin cilvəgahı-Turə məni.

Zəmirim olmadı biganə məşrəbindən saf,
Qıl aşina genə bir sağəri-bülurə məni.

Həvayi-arizin, ey afitabi-aləmtab,
Gətirdi zərrəsifət, ərseyi-zühurə məni.

Qüsuri-əql yoxumdur mənim bu aləmdə,
Ki, vaiz, eyləmə məftun cəmali-hurə məni.

Hanı təraneyi-mey-mütrüba, ki, mahi-siyam,
Gətirdi təngə məsaciddə həmd-surə məni.

Könüldən olmuşam aşiq o xali-məğrurə,
Həvayi-nəfs salıb gör necə qürurə məni!

Cahanda xosrovi-əhli-sükut idim, Ləli!
Xəyali-söhbəti-Şirin gətirdi şurə məni.

* * *

Xalından uçdu mürği-xəyalım ləb üstünə,
Qismət çəkib gətirdi nə xoş məşrəb üstünə.

Könlüın xəyali-zülfi-pərişanda cəm idi,
Birdən dağıldı xalü xətü ğəbğəb üstünə,

Eylər silahi-hüsni-rüxun aləmi xərab,
Zülfun açılsa pərçəmi, bu məvkəb üstünə.

Qaşındı bu ki, guşəsi zülf üstə meyl edib,
Ya Zülfüqardır, əyilib Mərhəb üstünə.

Bu siminab üzarını simab tək ərəq,
Bir aya bənzədir, düzülə kövkəb, üstünə.

Övc etdi çahidən mehi-nəxşəb, vəli, çıxıb
Çahi-zənəx, üzündə məhi-nəxşəb üstünə.

Cövlan edəndə hər tərəfə, can şikar edər,
Kimdir bu şəhsüvar, çıxıb mərkəb üstünə?!

Piçidə olma zülfünə çox, busədən danış,
Çox tul vermə bu sözə, keç mətləb üstünə!

Tök sinəm üstə zülfünü, zülfün çalıb məni,
Əqrəb çalan yerin qoyulur əqrəb üstünə.

Canan ki, bircə busəsinə nəqdi-can alır,
Ləli, bu candan əl götü, qoy ləb, ləb üstünə.

* * *

Boynuma kakilin, ey şux, kəmənd eyləmisən,
Bir uzun fikrə mənim başımı bənd eyləmisən.

Sayeyi-mərhəmətin başıma düşməz, nə səmər,
Ki, səhi qəddini bir sərvi-bülənd eyləmisən.

Bir nəfəs ləli-ləbin zikri dilimdən düşməz,
Məni tuti kimi tiryakiyi-qənd eyləmisən.

Göyə də çıxsa, müqabil dura bilməz qaşına,
Bir hilali ki, onu nəli-səmənd eyləmisən.

Afəli-çeşmdən, ey müğbəçə, təşviş etmə,
Könlümü məcməri-hüsnündə sipənd eyləmisən.

Bu gözü qaşına qurban oluın, ey məhparə,
Məni bu qaşü gözündən giləmənd eyləmisən.

Hamı heyran dolanır daireyi-zülfündə,
Neçə divanə bu zənciridə bənd eyləmisən?

Ozünə nəzr deyibsən məni qurban edəsən,
Mənə zibəndədi sən hər nə pəsənd eyləmisən.

Cümlə aşiqlərin azad gəzər aləmdə,
Bircə Ləlini giriftari-kəmənd eyləmisən.

* * *

Eyləmişdim, sənəma, vəslinə adət gecələr,
İndi sənsiz mənə bərpadı qiyamət gecələr.

Alır aramımı əzbəski, o bimar gözün,
Dili-rəncurumu qoymaz yata rahət, gecələr.

Ruzi-vəslində mənim səbrü qərarım yox idi,
Necə mümkündü fərağında fərağət gecələr?

Gecələr bəs ki, qəmindən çəkirəm naləvü ah,
Ahü naləmdən edir xalq şikayət gecələr.

Düşə bir də şəbi-vəslin ələ, ey mahi-tamam,
Eylərəm bircə tamaşayə qənaət gecələr.

Qamətin fikri açılmaz gecələr başımdan,
Başa gəlməz bu qiyamətdən əlamət gecələr.

Gündüzüm hər necə pürdərdü məlal olsa keçər,
Olu dərdi-qemim, ey şux, ziyadət gecələr.

Baxsa ayineyi-rüxsarına, ey mehri-münir,
Öz camalından olur mah xəcalət gecələr.

Xəmi-zülf içrə üzündən gözüm olmaz qafil,
Sübhü bidar tapar əhli-ibadət. gecələr.

Sübhə dək nalə çəkib, yatmaram, ey sərvi-qiyam,
Qaimülleyl məni qılmış o qamət, gecələr.

Bilmisən başıma zülfün nə müsibət gətirib,
Çəkərəm zülfün əlindən nə riyazət, gecələr.

Xabi-naz içrə özün sübhə kimi rahatsan,
Bilmisən zahir olur məndə nə halət, gecələr.

Gündüz, ey məh, sənə mümkün deyi gəlmək, bilirəm,
Eylə bari məni-bimari əyadət, gecələr.

Kəbeyi-ruyunu ol kimsə ziyarət qılmaz,
Ki, üzün etməyib əşkilə təharət gecələr.

Algilən canımı, qurtar qəmi-hicranından,
Yoxdu Ləlidə bu hicranıma taqət, gecələr.

## ƏBÜLHƏSƏN VAQİF

*Əbülhəsən Vaqif 1845-ci itdə Salyan şəhərində bərəçi ailəsində doğulmuşdur. İlk təhsilini Salyanda mədrəsədə almış, fars dilini və klassik ədəbiyyatı öyrənmişdir. Lakin maddi çətinlik üzündən təhsilini davam etdirə bilməyən Vaqif mədrəsədən çıxaraq atasının yanında işləmişdir. Yalançı ruhanilər əleyhinə yazdığı tənqidi şeirlər onun təqibinə səbəb olmuş vs şair 1888-ci üds Salyanı tərk edərək Bakıya köçmüşdür. Vaqif Bakıda yaşayarkən "Məcməüş şüzra" ədəbi məclisinin yığıncaqlarına getmiş, Əbdülxaliq Yusif, Cənnəti, Seyid Zərgər və başqa şairlərlə yaxınlıq vs dostluq etmişdir, O, 1914-cü ildə Bakıda vəfat etmiş və Şıx (Bibiheybəi) qəbristanlığında dəfn olunmuşdur.*

*İlk şeirlərini gənclik illərində yazan Vaqifin bəzi qəzəlləri XX əsrin əvvəllərində mətbuat səhifələrində görünmüşdür. Lakin onun əsərləri tam halda əldə yoxdur. Ədəbiyyatşünas - alim Cənnət Nağıyeva şairin boyük zəhmət bahasına ələ gətirə bildiyi əsərlərini toplayaraq, 2000-ci ildə Bakıda nəşr etdirmişdir. Burada verilən örnəklər həmin kitabdandır.*

### QƏZƏLLƏR

Ey qönçədəhan, sən kimi qönçədəhən olmaz,
Gülşəndə üzüntək gülü bərgü səmən olmaz.

Sordum nə qədər sirri-dəhanın ürəfadan,
Böylə dedi: get-get belə rəmzi bilən olmaz.

Çin-çin eləyib tökmə üzə zülfi, xətadır,
Dil yarəsinə məlhəm ol müşki-Xütən olmaz.

Ey sərvqədim, gülşəni-hüsnün gül açıbdır,
Gülzari-behişt içrə bü sərvü çəmən olmaz.

Sındırdı könül şişəsini nərgisi-məstin,
Eşq içrə könül, sən kimi peymanşikən olmaz.

Təlx etmə mənə badəni ey zahidi-nadan,
Vaqif kimi hərgiz dəxi şirinsüxən olmaz.

* * *

Bağlamış övraqi-əqlə eşqdən şirazə söz,
Əqllə eşqə çəkib bir cild möhkəm tazə söz.

Məhrəm ol ey dil sözə, sözdür ənisi-əhli-dil,
Çun ərusi-bərkdir qoymuş özüni nazə söz.

Söz deyən məşşatədir, zinət verər şerə müdam,
Şeir rüxsarın edər göyçək həmişə ğazə söz.

Şairin şeri degil əndazəsiz, ey dil, sakin,
Düz nizamə nəzmi-şeri, demə biəndazə söz.

Can fənadır, yox bəqası, doğru sözdür ey könül!
Söz həyati-cavidandır, hər kim ey dil yaza söz.

Söz ki, var şəhbazdır, çıxsa şikarə seyd əgər,
Açsa şəhpər edib, gəlsə əgər pərvazə söz.

Şeir meydanında hər kəs bir qədr cövlan edər,
Bilməyənlər dəmbədəm, lakin çökər xəmyazə söz.

Söz sadə qılınc deyil, bir qaladır şəhr üçün,
Kim ki, şəhrə girmək istərsə açar dərvazə, söz.

Dün mənə vaiz dedi: söylə mənayi-şeir,
Qanmayıbdır bir tüki Vaqif, deyəm qanmaza söz.

* * *

Xali ki, düşüb cana, ol ləli-tər üstündə,
Sandım ki, miçək düşmüş şəhd-şəkər üstündə.

Zülfündü tutub, ey məh, rüxsarın edib tirə,
Ya əbri-siyəh çin-çin yatmış qəmər üstündə.

Purpiç olub zülfün, ruyində vurub həlqə,
Əfidi yatıb güya ganci-gövhər üstündə.

Meyxanədə gər olsa bəhs ol ləbi-ləlindən,
Qönçətək ağız açma, qanlar düşər üstündə.

Cəllad gözün çəkmiş uşşaqə əcəl tiğin,
Amadə durub şaha qaşın bəsər üstündə.

Ruyində o kəc zülfə  əl vurma, aman, Vaqif,
O hələm ilə o məh üzündən əqrəb gəzər üstündə.

* * *

Verdim könül, inandım bir bivəfa nigarə,
Aldatdı, cövr qıldı, dil oldu parə-parə.

Zövrəq kimi vücudum qərq olmaq islər indi,
Qəm mövci başdan aşdı, çək ey xuda, kənarə.

Göz yaşım oldu cari, şəb ta səhər, üzümdən,
Yoxdur göy üzrə billah böylə axan sitarə.

Yoxdur təbibi-haziq, avarə qalmışam mən,
Bu dərdimə kim eylər, xaliqdən özgə çarə

Ey çərxi-dun, bəsimdir canımda zəxmi-qəmlər,
Gəl bundan artıq vurma bu zəf canə yarə.

Keçdi bahar, gəldi fəsli-xəzan, yetişdi,
Ey əndəlib, könlüm ümidi yox baharə.

Vaqif deyildi Vaqif, təqdirə çarə yoxdur,
Ümmid əlin gətirdi dərgahi-girdikarə.

* * *

Yuxlayıb mürği-dilim naz ilə gisu içrə,
Dəymə ey şane, qoy asudə yatıb mu içrə.

Arizində görünən xali-siyahmış, nə bilim,
Kim görübdür ola hindubeçə minu içrə.

Oynayır mərdumin didədə göz yaşı ilə,
Tifli-üryandır çimir teştdə san, su içrə.

Zülf sövdası başımdan necə çıxsın, ey dil,
Toxunub rişteyi-canımda olan pu içrə.

Əşki-çeşmimdə gəzər əksi-ləbin fəsli-bahar,
San ki, gül yarpağı düşmüş dolanar su içrə.

Mən ki, sultani-qəməm, ləşkəri-ğəm çövrəm alıb,
Yoxdurur heç qəmim, qalmışam ordu içrə.

Yarımın surətin ayinədə gördüm, Vaqif,
Qaşı göz etdi mənə, mən ona güzgü içrə.

* * *

Dilbəra, cövrü cəfadan sən usandırma məni,
Bu qədər atəşi-hicranına yandırma məni.

Demədimmi sənə ey zülf kimi üzü qare,
Vədeyi-vəsl verib, başda dolandırma məni.

Badeyi-eşqin üçün yatmış idim məst, xərab,
Uyğudan söyləmədimmi, gəl oyandırma məni?

Dedim, ey qönçədəhan sorma mənim əhvalım,
Səndə yox rəsmi-vəfa, heç inandırma məni.

Eşq dərdinə təbibim, edə bilməzsən əlac,
Şərbəti-təlx ilə gəl, bunca bulandırma məni.

Nəzdi-hüsnündə məni mars qılıb etmə xəcil,
Arizində o qara xalə dadandırma məni.

Vaqifa, nüsni-hes getdi, daha gəlməz ələ,
Xəlq arasında umub busə, utandırma məni.

* * *

Bir ömrdür fəraqə giriftarəm, ağlaram,
Hicar evində talibi-didarəm, ağlaram.

Hərçənd ağlamaq eyləməz çarə dərdimə,
Nə çarə eyləyim? Yenə naçarəm, ağlaram.

Rahat yatarlar xalq tamamən bu şəhrdə,
Mən sübh olunca hər gecə bidar, ağlaram.

Ey Yusifi-zəmanə Züleyxayi-eşq kim,
Hüsni, cəmalə çünki xəridarəm, ağlaram.

Bıganə hər nə növi baxarsa gülər mənə,
Yoxsa mən hər bəlayə səzavarəm, ağlaram,

Təni-rəqiblərdən olubdur könlüm qara,
Əğyarlarla həmdəm olub, xarəm, ağlaram.

Hər dəm düşür o nərgisi-məstin xəyalıma,
Xumarlıqda gör necə hüşyaram, ağlaram.

İzzətlə qoymuşam üzümü asitanma,
Vaqif, səbəb budur ki, günahkaram, ağlaram.

* * *

Bülbülasa qönçə dövrində könül, xar istərəm,
Pasibandır, yar ətrafında əğyar istərəm.

Ey mənim qönçə dəhanım aç, göftara gəl,
Yoxmudur səndə ağız? Var isə göftar istərəm.

Vey qəddi sərvrəvanım, dür, qiyamət zahir et,
Sərvdə bir meyvə yoxdur, səndə bərvar istərəm.

Göz yaşımla sularam ey sərv, ayağın rüzü şəb,
Baği-sinəndən bu şərt ilə iki nar istərəm.

Könlümün mülkün xərab etdi fərağın ləşkəri,
Bu xarabı qılmağa abad memar istərəm.

Yusifasa çəksə gər bazari-ədlə nəzmimi,
Cövhəri-əşarıma Vaqif, xəridar istərəm.

## TƏXMİSLƏR

Könül, bel bağlama dünyayə, dünyanı fəna gördüm,
Həqiqət, ehü-eşqə dəhrdə əhli-bəqa gördüm,
Vəfalı kimsənin daim işin ahü nəva gördüm,
Vəfa hər kimsədən kim, istədim, ondan cəfa gördüm
Kimi kim, bivəfa dünyada gördüm, bivəfa gördüm.

Olubdur qüssəvi qəmdən gözüm sübhü məsa giryan,
Nə qədri dərdü qəm var isə göstərdi mana dövran.
Mənim bu dərdimə dərman edəmməz, gəlsə yüz Loğman,
Kimə kim, dərdimi izhar qıldım, istəyib dərman,
Özümdən həm bətər bir dərdə ani mübtəla gördüm.

Yumubdur mərdümi-bəxtim bu dünya içrə göz məndən,
Eşitməz ləbbey ilə ərz qılsam hiç söz məndən,
Dedi əl çəkmişəm səndən mən, ey bədbəxt, əl üz məndən,
Əgər su damenin tutdum, rəvan göndərdi üz məndən,
Vər gər güzgudən umdum sidq, əksi-müddəa gördüm.

Gələn gülzari-dünyayə, hərə bir növbəri dərdi,
Kimə verdi qəza dövlət, kimə verdi qəmü dərdi,
Töküb gərdun bəsirət çeşmimə xakistərü gərdi,
Qədəm basdım dəri-ümmidə, sərgərdanlıq əl verdi,
Hünər sərriştəsin tutdum, əlimdə əjdaha gördüm.

Kəsibdir çərxi-dun lütfin cahan içrə məgər məndən,
Vücudum qərq olub, behri-qəmə bu çeşmi-purnəmdən,
Gəlibdir təngə könlüm, Vaqifa, bu qüssəvü qəmdən,
Füzuli, eyb qılma üz çevirsəm əhli-aləmdən,
Nədən kim, hər kimə üz tutdum, ondan yüz bəla gördüm.

* * *

Bir əlifdir məqsədim, əbru hilalı neylərəm?
Nöqteyi-tövhidi bildim, xəttü xalı neylərəm?
Padişahi-gənci-fəqrəm, mən cəlalı neylərəm?
Şəmi-şami firqətəm, sübhi-vüsalı neylərəm?
Bulmuşam yanmaqda bir hal, özgə halı neylərəm?

Məsti-camt-vəhdətəm, piri-muğanım rəhnümun,
Badə canım qoymaram əldən yerə, gər olsa xun,
Edə bilməz çərxi-gərdun könlümü zarü zəbun,
Qeyrə ərz et hər nə əsbabın ki, var, ey dəhri-dun,
Mən bir əhli-zövqəm, əsbabi-məlalı neylərəm?

Məndə vardır vəsl üçün hicran ara səbrli səbat,
İstəsə qərq eyləsin dəryayə, ya versin nicat,
Dövləti-ümmidi-vəslə olmaya çünki bərat,
Yox əcəb, gər malə rəğbət, mülkə qılmam iltifat,
Mən gədayi-kuyi-eşqəm, mülkü malı, neylərəm?

Səbit olubdur lövhi-sinəm üzrə, ey dil, şövqi-vəsl,
Gərdənimdə bağlıdır ruzi-əzəldən tövqi-vəsl,
Var əməl könlümdə olsun firqətindən fövqi-vəsl,
Ehtimali hicr təşvişinə dəyməz zövqi-vəsi,
Vəsl kim, var onda hicran ehtimalı, neylərəm?

Kəs həyatın qeydin, ey dil, kim, fənadır hasilim,
Ol fənanı sorsalar, dərdim bəqadır hasilim,
Bu bəqa olmaqda cövr ilə səfadır hasilim,
Nəxli-qəddin istərəm, kandan bəladır hasilim,
Baxmazam şümşadə, bar verməz nihalı neylərəm?

Doldu bağı-ömrümə az ömrdə zağü zəğən,
Çox oolub dərdü qəmim, yoxdur onu dəf eyləyən,
Kamil oldun, Vaqifa, bu dərdü qəm çəkməkdə sən,
Ey Füzuli, qıl kəmalı-fəzl kəsbin yoxsa mən,
Kamili-eşqəm, dəxi özgə kəmalı neylərəm?

## SEYİD RZA SABİR

*Sabir təxəllüsü ilə şeirlər yazmış Hacı Seyid Rza Əmirzadə 1849-cu ildə Xoy şəhərində anadan olmuşdur. Şair ilk təhsilini mədrəsədə almış, iyirmi yeddi yaşında İrəvana köçüb ömrünün axırına qədər orada yaşamışdır, Onun Şimali Azərbaycana gəlməsi Bakıda "Əkinçi" qəzetinin nəşri başladığı tarixə təsadüf edir.*

*Firidun bəy Köçərli Hacı Seyid Rzanın çox rəvan təbə malik, "xeylixaş-söhbət və zərif bir şair" olduğunu qeyd edir və göstərir ki, o, "Əkinçi" yə nəsr ilə yazılmış bəzi məktublar da göndərirmiş.*

*Hacı Seyyid Rza Əmirzadə 1904-cü ildə İrəvan şəhərində vəfat etmiş və orada dəfn olunmuşdur. Onun əsərlərindən nümunə və şair haqqında məlumat "Cənubi Azərbaycan ədəbiyyatı antologiyası" (I cild, 1981) kitabından götürülmüşdür.*

### YEDDİLİK

Dilbəra, gəl, gəl ki, əyyami-baharın vaxtıdır,
Daməni-səhradə seyri-laləzarın vaxtıdır,
Mövsimi-gülkəşt, cami-zərnigarın vaxtıdır,
Sən kimi fərxəndəzati-gülüzarın vaxtıdır,
Dövri-ruxsarında zülfi-tabdarın vaxtıdır,
Lütf elə, can almağa çeşmi-xumarın vaxtıdır,
Görməyə ruxsarını bu dilfikarın vaxtıdır.

Sızlaram şamü səhər hicrində daim misli-ney,
Şahidi-halımdır aləmdə mütəlləq küllü şey,
Zövqi-könlümdür təmənnası ləbindən "mim"ü "bey",
Qaşların manəndi-Bismillah içində ikki "rey"
Olrauşam dərdi-qəmi-hicrinlə həmağuş hey,
Çəkmə gəl, xaki-məzəllət içrə ınunca qəhri-dey,
Dilbəra, gəl, gel, ki, əyyami-baharın vaxtıdır.

Rahzənük etdi çox eşqində ovbaşi-fələk,
Görmədi sahir sənin tək çeşm, nə qaşı-fələk,

Gözlərindən paybusun çox töküb yaşı-fələk,
Çəkmədi xəttin kimi bir xamə nəqqaşi-fələk,
Nəşə verməz badətək tiryak, xaşxaşi-fələk,
Döşəmiş işrət büsatın türfə fərraşi-fələk,
Daməni-səhradə seyri-laləzarın vaxtıdır.

Əndəlibasa gülüstan üzrə cəngü cuş edək,
Növərusi-şahidi-mənanı həmağuş edək,
Mərifətdən neççə əlfazi-qəribə guş edək,
Can dimağın badeyi-gülrəng ilə mədhuş edək,
Könlümüzü saqiyi-rənayə duşa-duş cdək,
Sağəri-peymanəni bəzm içrə nuşa-nuş edək,
Mövsimi-gülkəşt, camı-zərnigarın vaxtıdır!

Sübhdən bazarı-hüsnün gör nə rəngin eyləmiş,
Guşeyi-əbruların xətt ilə təzyin eyləmiş,
Ləli gövhərbarın ol Fərhadı Şirin eyləmiş,
Aşiqi -şeydanı ellərdə süxənçin eyləmiş.
Lütfünü eşq əhlinə qayətdə səngin eyləmiş,
Türrəsin badi-səba dəst ilə çin-çin eyləmiş,
Dövri-rüxsarında zülfi-tabdarın vaxtıdır.

Munca kim, eşqin yolunda etdim onu cüstcu,
Üzdü övqatı-qərarım, dəşti-qəmdə rah, bu,
Demədim ol zülfi-mişgəfşanə halım mubəmu,
Rəşheyi-ləli-ləbindən könlüm eylər arizu,
Xəsmi-can etmiş cigərdən ikki xunxari-ədu,
Əylənib bu macərada bir-birilə rubəru,
Lütf elə, can almağa çeşmi-xumarın vaxtıdır,

Ey Rza, aşiq deyil kim eyləsə namusu nəng,
Eyləməz eşq əjdərilən mütləqa aşubi-cəng,
İçməyən cami-ələstdən key olar məsti-pələng,
Hanı məhrular içində sən kimi bir şuxü şəng?
Arizindən gül xəcil, həm ləblərindən qönçə təng,
Kəsmə gəl, payi-məhəbbət, başın üçün etmə ləng,
Görməyə ruxsarını bu dilfikarın, vaxtıdır.

## MİRZƏ İSA XƏYALİ

*Mirzə İsa Hacı Məhəmmədrəhim oğlu təxminən 1850-ci ildə Ərdəbildə doğulmuşdur. Təhsilini orada almış, 1891-ci ildə Lənkərana köçmüşdür. Bir məddət Lənkəranda müəllimlik etmişsə də əsas peşəsi ticarət olmuşdur. O, 1917-ci ildə Lənkəranda vəfat etmişdir,*

*Xəyali "Fövcül-füsəha " ədəbi məclisinin fəal üzvlərindən idi. Onun bədü irsindən bir neçə qəzəl və digər şeirləri qalmışdır. Buradakı örnəklər və şair haqqında məlumat "Poetik məclislər" (1987) kitabından gölürülmüşdür.*

### QƏSİDƏLƏR

Sahiba, bir nəfərəm dövlətü izzətdən uzaq,
Düşmüşəm şəhrdən avarə, vilayətdən uzaq.

Baxa hər kimsə mənim surətimə nifrət edər,
Eylə ki, oldu müsahib, olu nifrətdən uzaq.

Bir əcəb gövhərəm əslində, vəli səd əfsus,
Düşmüşəm qədrdən avarəvü qiymətdən uzaq.

Madəri-ınehrü vəfadan doğulan bir bəşərəm,
Verməyib dayə mənə şir sədaqətdən uzaq.

Şüğlsiz, kəsbsizəm, leyk nə kəsdən təməhim,
Əhli-iranəmü amma nə sədaqətdən uzaq.

Əhli-təqrirəmü amma həmə övqat xəmuş,
Əhli-kağız-qələməm, leyk kitabətdən uzaq.

Kamiləm hər hünəri fənndə, hər məşğələdə,
Pərvəriş tapmamışam kəsbi-ticarətdən uzaq.

Sürtülüb qurd yağı mənlən təməh ortalığına,
Şirəm, amma boğazım rişteyi-niyyətdən uzaq.

Gər əlim boşdu, gozüm toxdu, kürur olsa kürur,
Yaradıb könlümü xəllaq özü xissətdən uzaq.

Batinən şəri-rəsuli-nəbövi rəsmimdir,
Döyüləm rəsmdə yetmiş iki millətdən uzaq.

Deyiləm bəhrəsiz, hər elmdə bir hissəm var,
Həq məni eyləməyib hər cürə nemətdən uzaq.

Müflisəm müflis ilə, şeyxiyəmü şeyxi ilə,
Sufiyu cəbriyəm, amma nə həqiqətdən uzaq.

Babiyəm babi ilə, şeyxiyəmü şeyxi ilə,
Sazgarəm nə məzaq olsa, nəhayətdən uzaq.

Gərçi dərvişəmü hər məzhəbü millətlə rəfiq,
Deyiləm leyk həqiqətdə şəriətdən uzaq.

Gər adım müttəhim olsa, ürəyim ayinədir,
Şərəri-atəşəm, amma ki, hərarətdən uzaq.

Bircə eybim budu: bipuləmu biməşğələyəm,
Yoxsa tarı bili, bir nəfsəm hər illətdən uzaq.

Zahidəm, leyk başdan-başa məmlüvv yara,
Abidəm məscidü mehrabü ibadətdən uzaq.

Xoş deyib, xoş dolanıb, xoş gəzənəm, səd əfsus,
Fələki-süflə salıbdır məni vüsətdən uzaq.

Hər zaman gər mənə bir guşədə nan qismət olub,
Anı sərf etməmişəm əhli-məhəbbətdən uzaq.

Zahirən yetmiş iki millətilən seyrim var,
Dəsti-ümmid deyili şahi-vilayətdən uzaq.

Bu hamı vəsf ilə, gör, hikməti-xəllaqi yenə,
Bir zamanı deyiləm rəncü məşəqqətdən uzaq.

Rizq təhsili üçün bir neçə müddətdi məni,
Gərdişi-çərx salıb şəhrü vilayətdən uzaq.

Şəhrdən, əhldən avarə düşüb, hey gəzirəm,
Salmışam öz-özümü zillətə, rahətdən uzaq.

Bir ovuc buğdanı təhsil eləməkdən şəbü ruz
Düşmüşəm həzrəti-Adəm kimi cənnətdən uzaq.

Gəlmişəm bir yerə kim, rəsm deyil əl tutmaq,
Əhli-İrana görə xasə himayətdən uzaq.

Kimsə yandım deyənə bircə qaşıq verməz su,
Hamı piçidədir öz dərdinə, qayətdən uzaq.

Mümkünüm yoxdu ki, bir çarə qılım başıma mən,
Çəkərəm başımı yetmiş iki millətdən uzaq.

Çıxdı canım hisü dud içrə zavodlarda, haray!
Xizri-vəqt ol, məni sən eylə bu zülmətdən uzaq.

Düşdüm əldən, əlimi tut, əlimi tutsun Əli,
Məni tezliklə özün eylə bu heyrətdən uzaq.

Xəlqə yoxdu gözüm, sən mənə bir fikr eylə
Ki, sənin təbini derlər bu cəmaətdən uzaq.

Mümkün olsa mənəyol göstərib, ol Xizri-dəlil,
Bəlkə bir yana çıxam vadiyi-heyrətdən uzaq.

Deyiləm əhli-təvəqqə, varam əhli-kəsəbə,
Düşmüşəm məşğələvü kəsbi-ticarətdən uzaq.

Mənə xəllaq özü bir təbi-ğəni qılmış əta,
Heyf, səd heyf ki, salmış belə miknətdən uzaq,

Mən də gər olsa idim əhli-cahan kimi xəsis,
Əliboş düşməz idim çöllərə, dövlətdən uzaq.

Yenə həqdən dilərəm vüsəti, ta sərf qılıb.
Qoymaram təb ola öz qıldığı adətdən uzaq.

Barilaha, ver özün öz xoşlüğünü İsayə,
Bir dəqiqə, gör, olur eyşilə işrətdən uzaq.

Bir tikə nanü pəniri mənə ver, ey gərdün,
Gör, anı sərf edirəm əhli-məhəbbətdən uzaq?

Müxtəsər, vasitə ol kəsbə mənimlən, şayəd
Dövlətindən tez olam zəhməti-qürbətdən uzaq.

Qabiliyyət nə qədər məndə müşəxxəs görsən,
O qədər salmagilən çeşmi-məhəbbətdən uzaq.

Bəli, insan gərək əvvəl çəkə zəhmət, görə nəf!
O da bu əsrdə münıkün döyü minnətdən uzaq.

Kəsbilə zəhmət özü lazımü məlzum düşüb,
Necə ki, aşiq olan olmadı töhmətdən uzaq.

Səyü kuşeş gərək etmək nə qədər var ömrün,
Rizq təhsilini yazmıbia məşəqqetdən uzaq.

Qəbr evinə kimi lazımdı təlaş insanə,
Ələ bir loxma çörək düşmürü zəhmətdən uzaq.

Səy məndənü, kərəm səndənü ruzi həqdən,
Şükr dildən, yemək olmaz dəxi qismətdən uzaq.

Dəstü pavü hərəkət olmaq ilən kim oturar?
Bu ki, qeyrətdən iraqdır, bu ki, qeyrətdən uzaq.

Mətləbin xətmi, işin axırı, söz müxtəsəri:
Qıl Xəyalini xəyaləti-kəsalətdən uzaq.

* * *

Sahiba, gərçi varam zahirən həzrətdən uzaq,
Deyiləm batinən ixlasi-iradətdən uzaq.

Fələyin gərdişi hər dəm məni bir hala salır,
Qoymayır bir dəm olam rəncü məşəqqətdən uzaq.

Çox gəzib, çox dolanıb, çox qazanıb, az yemişəm,
Qismətim yoxdu, yemək olmuru qismətdən uzaq.

Bəxti-bəddən il ötüb, ay dolanıb, ömr keçir,
Taleyi-bəd məni qılmadı kəsalətdən uzaq.

Düşmüşəm xaliqi-aləm nəzərindən qətən
Ki, döyül mən kimi bir kimsənə zəhmətdən uzaq.

Ey xoş ol gün ki, bizim həm var idi vüsətimiz,
İşimiz yetmədi məxluqa himayətdən uzaq.

Yaxşılıqda hərəkət çox elədim, çərx əvəzin
Hərəkət eylədi əltafü mürüvvətdən uzaq.

Bir tikə nanü pənirə görə btı gərdişi-çərx
Şəhrdən həm qılıb avarə vilayətdən uzaq.

Müttəhim, şəhrdə çün bəllidi, bihörmət olur,
Qız ki, oldu ata mülkündə bəkarətdən uzaq.

Zahiri-surətim ər xəlqə xoşayənd deyil,
Ülfətim qılsa olur etdiyi fikrətdən uzaq.

Nə cahan əhli kimi hirsü təməh çoxlu varam,
Deyiləm bir nəfəs insafü mürüvvətdən uzaq.

Ülfətimdən sədəmə bir kəsə yetmibdi mənim,
Şöleyi-atəşəm, amma ki, hərarətdən uzaq.

Nola bir növ güman xəlq edə dərhəqqimdə,
Bəndeyi-xaliq olan olmadı töhmətdən uzaq.

Ey fələk, sahibi-müyon məni eylə, gör olur
Bir dəqlqə ürəyim bəzli-səxavətdən uzaq!

Xəlq tək gər mənə həm vüsəl ola, namərdəm
Gər olam bircə zaman eyşilə işrətdən uzaq.

Neyləyim, çərx məni yandırı fərq atəşinə,
Şüğldən şüğlə salır, rəhmü mürüvvətdən uzaq.

Gah sərraf qılıb verdi mənə milyanı,
Xəlq arasında nəfəs çəkmədim izzətdən uzaq.

Ərdəbil içrə bizi eylədi şəxsi-əvvəl,
İşimiz keçmədi məxluqə himayətdən uzaq.

Gəh qılıb kündəvü zəncir ilə Talışda əsir,
Salıb eldən məni avərə, vilayətdən uzaq.

Gahi baqqal qoyub adımı, gahi əttar,
Bir zaman istəmədi kəsb ticarətdən uzaq.

Gəh zavodlar arasında hisü düdə biləşib,
Nəcisaludə gəzib, qüslü təharətdən uzaq.

Gəh piristində neçə pirkeşik içrə oturub,
Rasparajet verib, olmadım hökmətdən uzaq.

Gah Bakuda təzə yer verib, etdi sakin,
Olmadıq şamü səhər hörmətü izzətdən uzaq.

Gəh neçə tifli-səğirə məni yoldaş qılıb
Hamı nadan, hamı bifəhmü fərasətdən uzaq.

Aqibət bir neçə əşxasə məni qıldı düçar,
Ki, hamı vəsfləri həddi-nahayətdən uzaq.

Seyyid Əhməd ağa bir şəxsdi bimislü nəzir,
Heyf dövran məni saldı elə həzrətdən uzaq.

Məşdi Həmidin Allah evin etsin məmur,
Bizi qoymadı olaq nazilə nemətdən uzaq.

Yer verib, pul verib, hörmət edib, qoymadı heç,
Özümü nemət ilə, cismimi xilqətdən uzaq.

İstərəm ömrumü tezliklə tamam edə xaliq,
Bu təriq ilə olam bəlkə xəcalətdən uzaq.

Hacı Əbdülqasıma siz deyin həmsöhbət ola,
Hər kəs istər ola dərdü qəmü möhnətdən uzaq.

Ağa Məmmədsəlimin təbinə maşaallah,
Nə ticarətdən uzaqdır, nə şəriətdən uzaq.

On manat mən deməmiş verdi, xəyalında dedi:
On manat səhldir olmaq bəlkə nikbətdən uzaq.

Yüz ilin taciri diqqətlə baxa, görməz onu,
Çörtgəvü dəftərü adabi-ticarətdən uzaq.

Kərbəlayi Atakişi özü göyçək, sözü düz,
Döyül əsla sözü adabi-ticarətdən uzaq.

Allah-Allah, nə əcəb yer, necə himmətləri var!!!
Barilaha, onları eyləmə izzətdən uzaq.

Kişilik şərti bu, mərdanəlik adabı budur,
Eyləsin onları Allah özü afətdən uzaq.

O qədər kim, mənə hörmət olunub, vallahi,
Yenə mən olmaram ölsəm də xəcalətdən uzaq.

Xiclətimdən götürüb başımı qaçdım axir,
Yoxsa kim öz-özünü istəri rahətdən uzaq?

Nə üzüm var olar sarı baxam, bir də gözüm,
Xiclətim bəs ki, varanı bihədü qayətdən uzaq.

Arzudan savayı indi nə iş var, nə gücüm,
Qoymayıblar məni hər vəqtdə həsrətdən uzaq.

Ey Xəyali, mənü xaki-dəri-ərbabi-hüquq,
Məni həm eyləsə dövran bu kəsalətdən uzaq.

# MƏHƏMMƏDAĞA CÜRMİ

*Məhəmmədağa Cürminin doğum və ölüm tarixi haqqında məlumat yoxdur, O, XIX əsrin 80-ci illərində Bakıda fəaliyyət göstərən "Məcməüş-şüəra" ədəbi məclisinin fəal üzvü və rəhbəri olmuşdur. Müasirlərindən Seyid Əzim Şirvani, Mirzə İsmayıl Qasir, Ağadadaş Sürəyya və başqalarının əsərlərində onun adının çəkilməsi göstərir ki, tanınan şair imiş. Ancaq əsərləri tam halda əldə yoxdur. Buradakı nümunələr "Deyilən söz yadigardır" (1981) və "Poetik məclislər" (1987) kitablarından gotürülmüşdür.*

## QƏZƏLLƏR

Xəta edib o ləbi-ləlinə şərab dedim,
Bu söz nə sözdü meni-xanimanxərab dedim.

Salıbdü zülfı ayağına, ahudur bu məgər?
Atıbdu dəşti-xəta Çinə mişktab dedım.

Şikənci-zülfi siyəhdən yüzünü göstərdi,
Tülu məğribdən qıldı afitab dedim.

Qədin görüb dedilər bu nə sərvi-rənadır?
Veribdü mərdümi-çeşmim bu sərvə ab dedim.

Ləbündü qönçə, qədin sərv, arizün lalə,
Bu çeşmi-məstinə çaşdım da nim xab dedim,

Deyəndə Cürmi bu şeri o qədr məst oldum
Ki, ləli-yarıma səhv eyləyib şərab dedim.

* * *

Kim ki, zülf içrə o mahın üzünü yad eyler,
Gecə-gündüz dilini qeyddən azad eylər,

Yetər eşqində görüb halımı güldukcə rəqib,
Ağlayıb bu dili-biçarə özün şad eylər.

Mövsimi-güldü, gül üzlüm, güzər et bir çəmənə,
Arizu-qamətini sərv ilə şümşad eylər.

Naz ilə qanımı ol çeşmi-siyahın tökdü,
Demədim kimsəyə can qəsdi bu cəllad eylər.

Cürmiya, mərdümi-çeşmim axıdıb seyli-sirişk,
Xaneyi-səbrimi bu seyl ilə bərbad eylər.

* * *

Derlər füsuni-qeyr səni meypərəst edüb,
Dil şişəsin bu səngi-məlamət şikəst edüb.

Mayil deyildi şəhd ləbin təlx badəyə,
Bilməm nə rəng ilə səni əğyar məst edüb.

Bir ahugözlü yar qılıb seyd könlümü,
Yarəb, kəmənd zülfü ilə paybəsi edüb.

Yadi-ləbinlə badəyə meyl eyləsəm nola,
Ləli-ləbinlə xəyali məni meypərəst edüb.

Cürmi, şikayət etmə qəmi-hicri-yardən,
Kilki-qəza rəqəm belə ruzi-ələst edüb.

* * *

Səhni-gülzar içrə ta naz ilə göftar eylədin,
Qönçəni şərməndə qıldım, bülbülü xar eylədin.

Laləyə rüxsarını göstərdin, ey şirinləbim,
Məskənin Fərhadtək aləmdə kuhsar eylədin.

Hər kəsə sehr ilə qıldın nərgisi-məsti nigah,
Çöhrəyi-alın təmaşasilə bimar eylədin.

Sünbüli-zülfün dağıtdın, tirə qıldın aləmi,
Sünbülü ol sünbülü -zülfə giriftar eylədin.

Düşdü rövnəqdən, təravətdən çəmən şahidləri,
Taki çini-zülfdən rüxsarın izhar eylədir,

Atəşi-hicranə yandım Cürmiyi-sərgəştətək.
Məhrəmi-bəzmi-vüsahn ta ki, əğyar cylədin.

* * *

Məndən o ahu gözlü nigarım rəmidədir,
Ram etmək olmaz ani ki, səyyaddidədir.

Bilməm, ilahi, neyləmişəm bivəfayə mən,
Məndən həzar nazüə damənkəşidədir.

Dil qeyrə vermisən deyibən, tərkim eylədi,
Qıldı bəhanə bir sözü kim, naşənidədir.

Kəsmiş, inan, taqətimi bir sənəmüzar,
Gülzari-hüsni-ruyinə xətə norəsidədir.

Ta gördü dami-zülfdə ol daneyi-xalın,
Dil mürğü aşiyani-tənimdən rəmidədir.

Dil vermə, gəl, bu zülfdə-sənəmsayə, Cürmiya,
Birəhmdir, cəfagərü imanbərəndədir.

## AĞADADAŞ SÜRƏYYA

*Ağadadaş Sürəyya 1850-ci ildə Bakıda doğulmuşdur. Təhsilini molla məktəbində atmışdır. "Məcməüş-şüəra" ədəbi məclisinin katibi olmuşdur. Məclisin bütün sənədləri, şairlərin oxuduğu və müzakirə etdiyi şeirlər onun evində saxlanılırmış. Sonralar itmişdir.*

*A.Sürəyya 1900-cı ildə Bakıda vəfat etmişdir.*

*Onun əsərlərinin az bir qismi qalmışdır. Buradakı nümunələr "Deyilən söz yadigardır" (1981) "Poetik məclislər" (1987) və "Dahilərin göz yaşı. Mərsiyələr" (1990) kitabilarından götürülmüşdür.*

### QƏZƏLLƏR

Qoymadi rahət olum bir dəm dili-şeyda məni,
Eytədi axir fəzayä-eşqdə rüsva məni.

Tazədən bir Leyliveş zülfünə bənd etdim könül,
Aqibət Məcnuni-dəşt etdi əcəb sevda məni.

Qaşlarm tağın qoyub mehrabı tutdum qibləgah,
Məsti-layəqəl edib bəs ol gözü şəhla məni.

Qətlimi gah qaşın istər qıla, gahi gözlərin,
Vadiyi-eşq içrə görmüşlər məgər tənha məni?

Ey Sürəyya, atəşin rüxsar ilən gördükdə xalq
Yazdılar pərvanədən yanmaqda bipərva məni.

* * *

Bilməyib bu gecə bir fikri-məhal eyləmişəm,
Arizuyi-hərəmi-bəzmi-vüsal eyləmişəm.

Meyi-gülfamı gətir, saqi, peya-pey bəzmə,
Gər həram olsa da mən anı həlal eyləmişəm.

Şəm tək hər gecə əbruyi-kəcin fikri ilə,
Əridib cismini, ey mah, hilal eyləmişəm.

Zövqi-ləlinlə girib gülşənə bəs ki, ey gül,
Eşqdə bülbüli-şuridəni lal eyləmişəm.

Ey Sürəyya, düşəni eşqinə ol mahvəşin,
Mərifət artinban, kəsbi-kamal eyləmişəm.

* * *

Can ilən canan, deyillər, can təmənnasındadır,
Baş verrəm, bilsəm ər, canan təmənnasındadır.

Əşkriz olmaqlığından anlaşır şəb ta səhər,
Nuh tək göz mərdümi tufan təmənnasındadır.

Sorsan ər: Sormaqda əsrari-dəhanımdan murad?
Aşiqin bir nükteyi-pünhan təmənnasındadır.

Bir pərivəş zülfünə meyl eylədi dil tazədən,
Yusifi-dil, mən bilən, zindan təmənnasındadır.

Nari-hicran dəfinə meyli-mey etdi dil yenə,
Qanə dönmüş, qanə-qanə qan təmənnasındadır.

Bir riyayi taət ilən zahidi-xudbini gör,
Oğlu ölmüş rövzeyi-rizvan təmənnasındadır.

Ey Sürəyya, mürği-dil meyli-ləbi-yar eyləmiş,
Sanma bica, qönçeyi-xəndan təmənnasmdadır.

* * *

Feraqı qismət edib çərxi-kəcmdar mənə,
Məhaldır ola mümkün vüsali-yar mənə.

Behiştə eyləmərəm meyl kuhi-yan qoyub,
Cəza günündə əgər qalsa ixtiyar mənə.

Xəyali-zülfü rüxünlə gecə sabahə kimin
Həramdır yuxu, ey yari-qəmküsar, mənə.

Əgər bu halətilən ölsəm asitanında,
Qazıb o yari-cəfapişə çün məzar mənə.

Yetir özün mənə, ey yari-qəmküsar, ölürəm,
Sabaha çıxmağa çün yoxdur etibar mənə.

Üzari-yan tutub qoymayıb nəzarə yeri,
Yüzü qaralıq edib zülfi-mişkbar mənə,

Xəyali-çərxdə bac istərəm Sürəyyadan,
Məsihvar əgər olsa bəxt yar mənə.

* * *

Etdi dollak yüzün dün xəti-tərdən xali,
Oldu ayinəyi-dü jəngi-kədərdən xali.

Şəmi qəddim, şəbi-hicran başıma yağdırır od,
Görəni sinəm evin ahi-səhərdən xali.

Sübhdən şamə kimi od vurub odlar məni yar,
Olanı naləyi-şəbgir əsərdən xali.

Tutcağın xət yüzünü ayinəyi-hiss oldu,
Nəzəri-mərhəməti-əhli nəzərdən xali.

Xaltək dövri-ləbində məkəs etməz məskən,
Olsa təngi-dəhənin abi-şəkərdən xali.

Tutsa idin əgər, ey əşk, o sərvin ətəyin,
Nəxli-ümmidimiz ofmazdı səmərdən xali.

Ey Sürəyya, qovulur it kimi hər bir yerdən,
Bu bir əyyamdir, hər icib ola zərdən xali.

* * *

Könül, cahanda qəmi-hicri-yarə səbr eylə,
Nə qədr vursa sənə yar yarə, səbr cylə.

Vüsali-yarə ki, yoxdur yolun, fəğan etmə,
Kənardan clə, cy dil, nəzarə, səbr eylə.

Mərizi-eşq oluban umma qeyridən dərman,
Ölümdən özgə buna yoxdu çara, səbr eylə.

Əli ürəkdə, gözü yaşlı gəzmə kuyində,
Özünü çək oradan bir kənarə, səbr eylə.

Vüsali-yarə, könül, məhrəm istəsən olasan,
Cəfayə tab, qəmi-ruzigarə səbr eylə.

Şikayət eyləmə çərxi-dəni əlindən heç,
Özün edibsən özün bəxtiqarə, səbr eylə.

Əgər xət aşiqisən, ey xəmidəqədd, səni,
Batırsa nəli-səməndər qübarə, səbr eylə.

Bu qədr etmə, Sürəyya, fəğanü naləvü ah,
Yetərsən axırı bir gün nigarə, səbr eylə.

**NOVHƏ**

Ey nəşi qalan yerdə, keçən başı eidayə,
Dur rəhm elə bu əlsiz-əyaqsız üsərayə.

Bir cismə bu qədri nə rəvadır dəyə peykan,
Fəvvarə kimi qan bədənində axa hər yan,
Ey təşnə ləbi-Kərbübəla bu təni üryan,
Aya necə tab etdi bu qayətdə yarayə.

Bir-bir edərəm cismi-şəhidanə nəzarə,
Görrəm sənicə dəyməyib heç bir kəsə yarə,
Ondan bilirəm həmdəmi-cansan məni-zarə,
Bais odu kəlləm başın üstündə nəvayə.

Kimdən soruşum harda düşüb şahi-şəhidan,
Baş ilə tanırlar bədəni, başına qurban,
Yetmiş iki tən hamısı başsız, hamı üryan,
Dindir bacını getməyə ta canı xətayə.

Başdan ayağa yarələnib cismi-zəifın,
Kim doğradı qardaş belə əndami-lətifin?
Başın hanı, bəs, kim bu əzayi-şərifin,
Ey başı düşən "qalu bəla"dən bu bəlayə.

Axır sənin istəkli bacındım məni-müstər,
Kim lütfinə bais na rəva, nazlı bəradər,
Dindir məni ey munisi-can, ey dili-xahər,
And verrəm, Hüseyncan, səni cani-şühədayə.

Səs gəldi o dəm Zeynəbə şahi-şühədadən,
Qurtarmayan ey Korbübəla içrə, bəladan,
Çox etmə, baci, ahu fəğan cövri-cəfadan,
Bundan sora səbr eylə qəmü cövri-cəfayə.

Hər mahi-mühərrəmdə gəl əfqanə Sürəyya,
Ahınla şərər vur belə dövranə Sürəyya,
Hüzzar ilə tut şahi-şəhidanə Sürəyya,
Bir təziyə kim, qabil ola sahibəzayə.

## HƏSƏNƏLI XAN QARADAĞİ

*Həsənəli ağa Xan Qaradaği 1850-ci ildə Şuşada anadan olmuşdur. Babası 1804-ci ildə Cənubi Azərbaycanın Qaradağ xanlığından Şuşaya köçmüşdür. Həsənəli ağa hələ ana bətnində ikən atası vəfat etmiş, anası və bibisinin himayəsində qalmışdır. Təhsilini rusca almasına baxmayaraq şəxsi mütaliə yolu ilə ərəb, fars dillərini da mükəmməl öyrənmişdir. "Məclisi-fəramüşan "ın fəal üzvlərindən olmuşdur.*

*Xan Qaradaği 1868-ci ildən başlayaraq uzun müddət müəllimlik etmişdir. Şuşada ilk dəfə parta və yazı taxtasından istifadə edərək dərs keçən Həsənəli ağa olmuşdur. 1922-ci ildə uzunmüddətli müəllimlik fəaliyyətinə görə ona ömürlük təqaüd təyin edilmişdir.*

*Xan Qaradaği 1929-cu ildə Şusada vəfat etmişdir.*

*Onun əsərlərindən ibarət "Fələyin bir belə dövrü olacaqmış"... kitabı 2003-cü ildə Bakıda nəşr olunmuşdur. Buradakı nümunələr həmin kilabdan götürülmüşdür.*

### QƏZƏLLƏR

Vədə verraişdi nədən ol yar gəlsin, gəlmədi?
Tuti dilli, bir şəkərgüftar gəlsin, gəlmədi.

Əldə mey camın tutub, göz intizarın çəkmişəm,
Gözlərəm, ol gözləri xummar gəlsin, gəlmədi.

Hər yetən kimsə könül mülkünü viran eylədi,
Mən dedim, dil sahibi sərdar gəlsin, gəlmədi.

Bu qədər təxir eylər yarım, nolmuş, bilməzəm,
Gəlməmək fıkri olub, ya var, gəlsin, gəlmədi.

Ol vəfalı bivəfa olmaz, yəqinimdir mənim,
Əhd edib, bir bu qədər, zinhar gəlsin, gəlmədi.

Ya Xətaya uğradı, ya kim Xütəndən istədi,
Ahu gözlü, kəc baxışlı dildar gəlsin, gəlmədi.

Könül istər, əl yetişməz, ey Qaradaği, nedim,
Bu xəzan içrə dedim, gülzar gəlsin, gəlmədi.

* * *

Hanı o yarə uyub, xəlvət etdiyim gecələr?
Ənisü-munis, olub söhbət etdiyim gecələr?

Necoldu, bir mən idim, bir də ol nigarım idi,
Hərimi-qürbidə mən şöhrət etdiyim gecələr?

Gözüm gözündə, əlim daməni-vüsalində,
Hanı o yarə durub minnət etdiyim gecələr?

Necoldu, bari-xudaya ki, yar ilə var idim,
Həmişə eyşdə mən, işrət etdiyim gecələr?

Mən fəraqində axir belə deyildim ki xar,
Vüsal şahidiyəm, izzət etdiyim gecələr?

Fəraqi-cövrünü bilməm, bu qədri mən çəkirəm,
Ki, bir də qismət ola, vəslət etdiyim gecələr?

Nəsib ola, Qaradaği, bana görüm bir də
O yar ilə qonuşub, ülfət etdiyim gecələr?

* * *

Ney tək nəvayə gəldi yenə, tutdu nar dil,
Bilməm nedim, nə çarə qılım mən, yanar dil.

Gül qönçəsi kimi bükülüb ləxtə-ləxtə qan,
Cövrü-cəfadan hər dəm udar su güvar dil.

Bir şişə tək cəfa daşma dəydi, neyləsin,
Ol sərdari-vaqif, israri-yar dil.

Durdu, dolandı başına, düşdü ayağına,
Yandı köz kimi şəm üzrə pərvanəvar, dil.

Dorda, tükəndi ömr, cahanda belah dil,
Bir şad olmadı ki, dcyim, tut qərar, dil.

Sübhi-məsa fəraqında ahu fəğan eylər,
Təngə gotirdi aləmi, şəb zindədar dil.

Səbr eyləməzmi, ol Qarabağı qərar ilə,
Görmüş dərdü qəmü biqərar dil.

* * *

Qəmginsən nədətı? Söylə, dildar bircə gül,
Yetmiş bahar, bir de, danış, yar, bircə gül.

Cövrü-cəfa bu aləm ara çəkmək adətin,
Dur bir ayağə, seyr eylə gülzar, bircə gül.

Sən bidamaq olma, tut saqidən ayaq,
Al bir əlinə, mən görüm, çal tar, bircə gül.

Ya bir qədər get səhni-çəmən gəz, dolan, otur,
Mən saz edim indi səmavar, bırcə gül.

Cəngü çəğan, neyü dəf, tarü bərbütü
Cəm etmişəm, qalıb clə mizmar, bircə gül.

İsi, Sadiq, Hacı Hüsü, ol Kərim ilə,
Hazır olarlar indicə bunlar, bircə gül.

Beylə deyil ki, yox, Qaradaği, bir əhli-dil,
Çoxdur bu yerdə həddindən aşar, bircə gül.

* * *

Fələyin bir belə dövrü olacaqmış, nə bilim?
Saralıb, bağü gülüstan solacaqmış, nə bilim?

Bitirib, bağ salıb, bir neçə güllər yetirdim,
Uzadıb bəsti-qoza kim yolacaqmış, nə bilim?

Ürəyim yaralənib, sinəmə dağlar çəkilib,
Gözümə qan sağılıb, yaş dolacaqmış, nə bilim?

Əl çəkib nakəsdən, çərx özü nakəsmiş,
Tək bana cövrü-cəfalar qılacaqmış, nə bilim?

Bəslədim zülfü, dedim, başıma salsın sayə,
Dolanıb boyna ilan tək çalacaqmış, nə bilim?

Aşiqə naz eləmək adət olub məşuqə,
Bu qədər naz eləyib can alacaqmiş, ne bilim?

Səltənət rütbəsinə naz qılardım şah ikən,
Məni başdan-ayağa qəm saracaqmış, nə bilim?

Dolanıb ruzigarın haləti bir özgə hala,
Ey Qaradaği, sana qəm qalacaqmış, nə bilim?

* * *

Bəh, bəh bu dilbərin nə əcəb xoş məqalı var!
Gülgün cəmalı üzrə gözəl xəttü-xalı var!

Gər afıtab olmaya məhşərdə, yoxdu qəm,
Çün günəşdən də ötə yarın cəmalı var.

Şəhbaz baxışı uçurubdur könül quşun,
Seyr etməyə yəqin edərəm kim, xəyalı var.

Ağlar gözüm, yanar ürəyim, bilməzəm kim,
İzhar edim, bu könlü ki, dərdü-məlah var.

Bir kəs ki qəm yatağı ola, gülməz, ağlayar,
Məzur eyləyə bu Qaradaği gülah var.

## MÜXƏMMƏSLƏR

Bir bəxşi-xudadır bu məlahət sənə, dilbər,
Göftarü-bəlağət, bu fəsahət sənə, dilbər,
Bu nazü-nəzakət, bu təravət sənə, dilbər,
Məxtum olub ol hüsnü lətafət sənə, dilbər,
Naz etmə gəl üşşaqə, əmanət sənə, dilbər!

Ey məh, nə əcəbsən, nə qəşəngsən, nə gözəlsən?
Xubluqda bu gün Yusifı-Kənanə bədəlsən,
Demək nə rəva, Yusifı-sani, sən əzəlsən,
Dur, mən dolanım başına, bir yanıma gəl sən,
Haşa edəməm bil ki, xəyanət sənə, dilbər!

Öldürdü məni dərdü-qəmü möhnəti-hicran,
Qurtarsa bu qəmdən məni gər xaligi-sübhan,
Nəzr eyləmişəm, canım edəm vəslinə qurban,
Yoxdur dəxi bir özgə qəmim, ey şəhi-xuban,
Gər yetsə, canım sağü səlamət sənə, dilbər.

Avara gəzərkən mən o divanələr içrə,
Düşdü güzərim bir neçə məstanələr içrə,
Saqi tökərək badəni peymanələr içrə,
Söylədi ləbin vəsfini meyxanələr içrə,
Yetməzmi bu tərif, bu şöhrət sənə, dilbər?

Olmaz bu gözəllikdə deyim, bir bəni-Adəm,
Heyrandı sənin hüsnünə bu məhvəşi-aləm,
Əhdinə vəfa eylə, qıl iqrarını möhkəm,
Ol səcdəgahım, səcdə qılım hüsnünə hərdəm,
Şayəstədi, əlbəttə, dəyanət sənə, dilbər!

Salma nəzərindən məni, ey vəlışi qəzalım!
Gündən-günə artır nə edim, dordü məlalım,
Rəhm et bana, zülfün kimi aşüftədi halım,
İnsafdımı, zalım, belə bu hal ile qalım?
Etməzmi görən, kimsə məlamət, sənə dilbər?!

* * *

Ey nəzakət çəməni içrə xüraman, gözəlim!
Xubilik kişvərinin təxtinə sultan, gözəlim!
Bu canım sədəqədir, qaş-gözə qurban, gözəlim!
Yaraşır bir baxışa kim, ala yüz can, gözəlim!
Belə getsə, tez olur dillərə dastan, gözəlim!

Hərəkatü rəvişin qıldı səhi-sərvini pəst,
Sünbülə türreyi-zülfün şikəni verdi şikəst,
Laləni dağə salıb, rayin edib badəpərəst,
Ey könül, qaş-göz ara sən nə gəzirsən belə məst?
Yoxdu qorxum ki, ara yerdə tökə qan gözəlim!

Ey mələk, nurlu yüzün gündümü, ya bədri-tamam?
Kim ki ruyindən olur məst, ona var badə həram.
Pərdəsiz cilvələnib, nazilə ver qəddə qiyam,
Küfr zülfin dağıdıb, məst çıxıb, eylə xüram,
Bilələr, ta ki nədir küfrilə iman, gözəlim!

Bu qədü qamətinə ətləsü-xara yaraşır,
Qaşların guşəsinə qətlimə ima yaraşır,
Edə gər zində ləbin nitqi-Məsiha yaraşır,
Səni hər kim ki görür, başına sevda yaraşır,
Olu sərgəştəvü-divanəvü-heyran, gözəlim!

Gün ki hər sübh çıxar, dərgahma səcdə edər,
Sərv rəftarə gələr, qılsa qədin bağə güzər,
Qönçələr ağzın ilə qarşı dura, boynun əyər,
Küfr zülfündə dolaşmış, Qaradaği, kafər!
Desələr, ona müsəlman, olu böhtan, gözəlim!

## MƏNZUM HEKAYƏLƏR

### AĞ YALANÇI

Bir xaric dövlətdən bir əmirzadə,
Gəlibdir Tiflisə, gəzib azadə.
Görüb minarədə ozan verəni,
İslamı namaza dəvət edəni.
Xəbər alıb bir cühuddan bu kişi:
"Nə deyir o adam, nə olmuş işi?"
Cühud deyib: "Deyir, böyükdür Allah,
Burası doğrudur, düz deyir vallah.
Söyləyir ki, var Məhəmməd peyğəmbər,
Bu yalandır, uydurulmuş bu xəbər".
Əmirzadə söyləyibdir: "Hər halda,
Yalanı sən dedin, qoy qalsın yadda.
Çünki mümkün deyil edilə bəyan,
Öylə uca yerdən söylənə yalan".

### YOXSUL

Bir yoxsul, bir zaman gedib hamama,
Soyunub, əl atıb çanağa, caına,
Doldurub çanağı, başma töküb,
Elə ki, canını isladıb, çöküb,
Söyləyib dəlləyə: "Mənə çək kisə,
Amma pulum yoxdur, qalsın nisiyə".
Dəllək gəlib fitələrdən götürüb,
Bir tərəfdə yer qayırıb, oturub,
Yoxsulu uzadıb, kisəni çəkib,
Sürtübdür bədənin çirkini töküb.
Deyibdir: " İndi də qaldır özünü
Qalmasın, qoy sürtüm dəxi üzünü".
Yoxsul deyib: "Ta kafıdir, çox yaşa!
Qara üzüm sən ağartma, çıx başa.
Ağ günə aləmdə bais paradır,
Əlim boşdur, mənim üzüm qaradır".
Üz ağlığı, Qarabaği, paraymış,
Yoxsul üzü ağ olsa da, qaraymış.

## ŞƏHRİYAR ŞİRVANİ

*Məşədi Mirzə Qsni Məhəmmədsadıq oğlu Şəhriyar Şirvani 1852-ci ildə Şamaxıda anadan olmuşdur. Kohnə üsul ilə mukəmməl təhsil almışdır. Cavan vaxtlarında altı il Teymurxanşurada yaşamış, sonra Irana getmiş, Raşt, Qum, Qəzvin şəhərlərinə səyahət etdikdən sonra Tehrana qayıdaraq orada tibb elmini öyrənmişdir. Mirzə Qəni on səkkiz il İranda qalmışdır. Vətəninə qayıtdıqda Şamaxıya getməyib, əvvəl Gəncədə, sonra isə Ağdaş va Göyçayda "Hacı Həkim " ləqəbilə təbiblik etmişdir. 1915-ci ildə Göyçayda vəfat etmiş, vaxtilə Göyçay-Ucar yolunun üstündə olan şəhər qəbiristanlığında dəfn olunmuşdur.*

*Ağdaş ədəbi dərnəyinin iştirakçılarındandır. Bəzi cünglərdə bir neçə şeri almışdır. Əsərlərindən nümunələr "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Keçə bu fəsli-xəzan, mövsümi-baharım ola,
Bahar bülbülü tək gülşənə güzarım ola.

Müyəssər ola əzadan çəməndə bəzmi-xas,
Gülü mülü meyü bülbül, mənü nigarım ola.

Nigar ola, gül ola, gül müqabili-lalə,
Güli nigara tərəf qəlbi-dağidarım ola.

Bir əldə dəsti-nigarım misali-çəng tutam,
Bir əldə zülfı-mütərrasi rəngi-tarım ola.

Nəvayı-eşqə çəkəm şur ılə ərşə nazın,
Müxalifı-qəmə mənsurdə hisarım ola.

Açanda şərhi-fəraqə zəbani susən tək,
Bənəfşə guş verə, nərgis intizarım ola.

Bəyan edəm keçən ruzigari-zarımdan,
Şərik ol qəmə, dilsuz ahu zarım ola.

Meyi-murad ilə məmlüvv sağəri-kamım,
Bu bəzmi-işratə saqi gülüzarım ola.

Sənə fəda mən olum, ver içim badə,
Bu ani eyləmə təxir etıbarım ola.

Xarab olub yetışəm məhfıli-xərabatə,
Bu bəzmi-meykədədən gər yetincə karım ola.

Verəm fəna yelinə gərdi-cani əhd etdim,
Misali-badi-səba dərgəhində barım ola.

Ölüncə vasil olaydım liqayi-didarə,
Cahanı-faniyədən bunca ixtiyarım ola.

O şəhsuvari-cəfapərvərin bu canımda
Qulami-qullarına qəlbi-Şəhriyarım ola.

* * *

Könül sirişk tökər, çeşmi-əşkbar ağlar,
Fəraqi-yardan hər ləhzə biqərar ağlar.

Könüldə tutmuş idim eşq sirrin gizlin,
Gözüm bəyana salıb hər dəm aşikar ağlar.

Xəyali-vəsli-rüxünlə şəbani-hicrində,
Fəraqi-şəminə pərvanə tək yanar, ağlar.

Gözümdə sinədə, novki-müjən sitarələrin
Gecə sabaha kimi eylələr şümar, ağlar.

Fəğanü nalə mənə-yar, həmdəmim-qüssə,
Ənisim ah, gözüm yaşı qəmküsar ağlar.

Qəmində mərdümi-çeşmim sirişk dürrələrin
Fədayi-fikri-ruxun eyləyər nisar, ağlar.

Təvanü təqatü səbrim apardı yəğmayə,
Hücumi-ləşkəri-qəm qıldı tarümar, ağlar.

Məgər əmir idi qəm karvanına könlüm
Sirişk naqələrin bağlayar qətar, ağlar?

İçibdi badeyi-eşqin, olubdu məsti-əbəd,
Yetincə vəslinə hicran verir xumar, ağlar.

Yetərmi güllərivə, dil dərərmi güllerüvü?
Bu həsrət ilə şəkər tul intizar, ağlar.

Xəyali-xam fəraqin oduna şölə çəkər,
Bişirdi bağrımı bu nari-xar-xar, ağlar.

Əcəb budur ki, camalında, ey şehi-xuban,
Rəqiblər yüzü güldükcə Şəhriyar ağlar.

## QƏSİDƏ

Xoş, gəlibsən gülşənə, ey mürği-xoşxan, əndəlib,
Məqdəmin qurbanı bu cismü dilü can, əndəlib.

Müddət idi hicrdən məhzun idin mən zar tək,
Xoş ola vəslin, gəlib fəsli-gülüstan, əndəlib.

Səndə gül şövqilə var xoş ləhcəvü avazlər,
Məndə var lücran şəbindən ahü əfğan, əndəlib.

Gül görüb yad eylərəm rüxsari-ali-yarımı,
Naleyi-bülbül görüb ollam nəvaxan, əndəlib.

Mən gülümdən cövr ilə, əyyamdır, ayrılmışam,
Şükrlillah, sən qəlıbsən teyyi-hicran, əndəlib.

Dərsi-eşqi məndən almış Vamiqü Fərhadü Qeys,
Gah sakit, gah samit, gah nalan, əndəlib

Şuri-sazın sövti-tarın, cəhcəhü çapçaplər,
Aldı dildən ixtiyar, oldu ciyər qan, ondəlib.

Zövqümə güftari-şirinin mükərrər qənddir,
Cəhcəhi təkrar qıl, dil söyləsin "can", əndəlib!

Bu nəvalar kim sənin var, eşq təlim eyləyib,
Ya cinan içrə səni bəslibdi Rizvan, əndəlib?

Eşqdəndirsə neçün məndə bu ahü zar var?
Bəs neçün tubada yox bu hüsni-əlhan, əndəlib.

Bir səda çək, canü dil olsun fədayi-solətin,
Bəzmdən zağü zəğən olsun gürizan, əndəlib.

Qəlbi qəmdən pak edən səndə həzaran nəğmə var,
Dərdi-bidərmanım ondan da firavan, əndəlib.

Gər həzaran nəğmədir vəslmdə iki feyz var,
Qəhqəhindən vəsllər, cəhcəhdə hicran əndəlib.

Sən xuraman, şad gül baği-cinanə oxşayır,
Qönçənin mən zar tək bağrı dolu qan, əndəlib.

Çərxdə rəxşan olur xurşid tək balü pərin,
Əylənəndə heykəlin şəmi-şəbistan, əndəlib.

Ləlü gövhər bəxş olur ağzın açanda gülşənə,
Künci-sinəndir məgər kani-Bədəxşan, əndəlib?

Hurisənmi, ya mələk, ya bəççeyi-ruhül-əmin?
Aşiqə səndən yetər ilhami-yəzdan, əndəlib.

Qəhqəhün bir hərfi min təhlildir tövhiddən,
Cəhcəhin bir kəlməsi təsbihi-sübhan, əndəlib.

Novki-minqarın sənin (sanki bir) almasdır,
Ol zəbani-natiqin yaquti-rumman, əndəlib.

Gözlərin inci kimi, fırüzə tək taci-sərin.
Pər zümürrüd, düm zəbərcəd, eylə teyran, əndəlib

Gərdənin şəmsü qəmər, sinən kəfi-simabdır,
Qamətin başdan dibə bir ləli-rəxşan, əndəlib.

Gah cəhcəh, gah cürcüh, gah züncül, gah sövt,
Həncərən cövfində var min dürri-qəltan, əndəlib.

Əl-ayağın qaşə bənzər, dırnağın müjganıma,
Bəd nəzərdən hifz ola bu qaş, bu müjgan əndəlib.

Çapçapın qönçə təkı məşkuf olsun dəmbədəm,
Lütfün olsun gül asıldiqca xoşəlhan, əndəlib.

Gəlməsin gülşənüvə badi-səba yəğmaləri,
Düşməsin gülzaruva taraci-dehqan, əndəlib.

Sövtü əlhanın mənə xoş hicrdən, qorxum budur:
Çeşmi-xummarım sala gülzara tufan, əndəlib.

Şəhriyarı da yetir sən kimi vəslin bağına,
Sövtü ləhnin vəsfinə olsa qəzəlxan, əndəlib.

## HACI RZA SƏRRAF

*Hacı Rza Sərraf 1853-cü ildə Təbrizdə tacir ailəsində doğulmuşdur. Atası Seyid Məhəmmədin Təbriz bazarında sərraf dükanı varmış. Hacı Rza ilk təhsilini Təbrizdə mədrəsədə almış, o dövrün biliklərinə yiyələnmişdir. Lakin atası vəfat etdiyi üçün o, təhsildən ayrılaraq dükanda atasının işini davam etdirməli olmuşdur, "Sarraf" təxəllüşü peşəsi ilə bağlıdır. 1907-ci ildə Təbrizdə ürək xəstəliyindən vəfat etmişdir.*

*Sərraf bədii yaradıcılığa gənclik illərində başlamış, əsərləri şöhrət tapdığı üçün dəfələrlə Təbrizdə və Bakıda nəşr olunmuşdur. Burada verilən örnəklər "Canubi Azərbaycan ədəbiyyatı antologiyası" (I cild, 1981) və "Dahilərin göz yaşı. Mərsiyələr" (1990) kitablarından götürülmüşdür.*

### QƏZƏLLƏR

Dilim yansın əgər dildən deyəni gəl tərki-naz eylə,
Vəli dildə təhəmmül qalmayıb, bir qədər az eylə!

Xədəngi-nazilən vurdun, məni yıxdın, qoyub keçmə,
Müsəlmanəm, mənə islam rəsmilən namaz eylə!

Kərəm qıl başımı torpaqıdan al, qoy bir dizin üstə,
Məni gəl, axır ömrümdə, əzizim, sərfəraz eylə!

Xərab etməkliyə dünyanı bir iyma kifayətdir,
Nə fıkri-qətlü qarət qıl, nə qəsdi-tərki-taz eylə!

Sənə kəc baxsa hər göz, qoyma gözdən, ey kəman əbru,
Onu tut əlbə-əl qurbani-müjgani-deraz eylə!

Bəlagərdanınam, rəhm et mənə, al canımı, qurtar,
Alım dərdin, məni gəl dərdi-sərdən biniyaz eylə!

Təmam eylə mühəddis, şərh vermə hali-Mahmudə,
Danışmaq halətin var söhbəti-hüsnı-Ayaz eylə!

Xədəngi-cansitani-qəmzeyi-canan gəlir, ey can,
Oturma cismdə, öz ruhunu çıx pişvaz eylə!

Tükəndi nəqdi-ömrün getdi, ey Sərrafi-bimayə,
Qocaldın, çarəsiz, öz dərdinə bir çarəsaz eylə!

* * *

Ey bala, ey quzu, ey şux məmə, qurban gözünə,
Olürəm, bir belə qoyma nəmə, qurban gözünə.

Xəmi-zülfün çəməni-arizə çəm tək döşəmə,
Mayil olma bu qədər çəm-xəmə, qurban gözünə.

Görürəm, xalq deyər qaşına qurban kəsilim,
Deyirəm mən yenə, bainhəmə, qurban gözünə.

Hər səri-muyi-kəcində, düzü, min aləm var,
Necə verrəm səni bir aləmə, qurban gözünə.

Var gözəlim, çün dəmi-İsa, dəmi-canbəxşində,
Gəl otur, bircə verək dəm-dəmə, qurban gözünə.

Dini yox, kafiri-sərgəştədi, bədnam olusan,
Vermə üz zülfi-xəməndərxəmə, qurban gözünə.

Necə kim, Yusifə dedilər: Bu mələkdir, nə bəşər,
Səndə var indi həman həmhəmə, qurban gözünə.

Qoymusan indi ki, Sərraf adını aşiq əmən,
Ver icazə ləbi-ləlin əmə, qurban gözünə.

* * *

Öz ıxtıyarımı mən vermışəm nıgar əlinə,
Yetibdi faili-müxtarın ixtiyar əlinə.

Könul, gər ıstəyırsən məstı-camı-eşq olasan,
İnani-huşunu ver yari-huşiyar əlinə.

O gün ki, qismət edibdir vücudu cüzvbəcüz,
Veriblə rişteyi-səbrü qərarı yar əlinə.

Həvayi-darilə Mənsurun əql şahbazi,
Uçub qonub səri-giysuyi-tabdar əlinə.

Nolurdu bircə gedəydi xəzan, gələydi bahar,
Düşeydi daməni-gül əndəlibi-zar əlinə.

Hənayə bax, necə gör bihəyadı, qanə dönüb,
Utanmayıb qızarıb, əl verib nigar əlinə.

Çəkibdi kamına könlüm quşun o zülfi-siyəh,
Udar, bəli, düşə güncüşk beççə, mar əlinə.

Əlində öz məməsin oynadırdı yar, dedim:
Ənari-tazə düşüb sərvi-gülüzar əlinə.

Demə bu aşiqə: Gəl, tari-zülfümə vur çəng,
Vücudu çəng olu gər düşsə bircə tar əlinə..

Bu növilən ki, yanar odlara, yanar Sərraf,
Xilas olunca salır nəqdi-xoşəyar əlinə.

* * *
Bir rəmzilə yarırn edər əhli-dilə qaş-göz,
Tari bili, xalq eyləyə bilməz elə qaş-göz.

Tapşırdı səbayə, dedi: Sal zülfü üz üstə,
İmanımı verdi mənim axır yelə, qaş-göz.

Bir əyri qaş oynatmağa verdim gözə min can,
Bundan belə eylər genə məndən gile qaş-göz.

Hərgiz, bu xətadidə kimi qaş-göz edəmməz,
Gər eyni Xətadan gələ min qafilə qaş-göz.

Bir yayıda min ox ata, bir tiri yayılmaz,
Qoymubdu, atıb vurmaq üçün, fasilə qaş-göz.

İnsan demək olmaz sənə, sən hurü pərisən,
Olmaz, bu müşəxxəsdi, bəşərdə belə qaş-göz.

Göz mərdüməkin-nöqtə, qaşın-sini-kəşidə,
Sərlövhi-camalında olub bismilə qaş-göz.

Min aşiqi bir tək tük ilə tük-tükə bağlar,
Zülfündə işarə qıla gər bir telə qaş-göz.

Göz üstə dedin, qaş eyləyib canını allam,
Qurbanın olum, dönmə sözündən, elə qaş-göz.

Eylər bu qədər aləmə qaşü gözü tərif,
Verməz niyə Sərrafına yarım, silə qaş-göz?

* * *

Qəddimi peyvəstə qaşın əydi çövgan eylədi,
Könlümü, həmvarə, zülfün yıxdı, viran eylədi.

İstədi çəksin fələk hər ay başında mahi-nov,
Qaşların tərhin götürdü, əldə invan eylədi.

Xizrdən sərməşq alıbdır, yoxsa bu göz mərdümü
Bigünəh bu tifli-əşki qanə qəltan eylədi.

Gördü çün könlüm xədəngin həmdəmi-cansuzdur,
Can kimi bağrına basdı, munisi-can eylədi.

Canımı almaqda işvən qanıma qıldı kərəm,
Qanımı tökməkdə qəmzən canə ehsan eylədi.

Qanlıdır xalın deməkdə qanımı bildi həlal,
Nütfeyi-Qabildi, axır qanına qan eylədi.

Tiri-eşqin sinədən çıxmaz, məgər canım çıxa,
Can ilən əvvəldə böylə əhdü peyman eylədi.

Çəkmə zəhmət, dərdimin dərmanı yoxdur, ey təbib!
Kim mərizi-eşqə bu aləmdə darman eylədi?!

Bilmədim yarın iki surətlə bir tək xalı var,
Oynadım xalilə, yandım mən, o talan eylədi.

Çıxmamış canım deyin Sərrafa tez gəlsin, məni –
Bir kəmanəbru nişani-tiri-müjgan eylədi.

* * *

Nolardı məclisimiz bir dəqiqə xəlvət olaydı,
Deyib danışmağa cananilən fərağət olaydı.

Bərabərimdə nigarım yanaydı şəm kimi,
Mən ahi-sərd çəkəydim, o gərmi-söhbət olaydı.

Gəhi duraydı qabağımda sərv qamətilən,
Gözüm görə-göra bn nəşədə qiyamət olaydı.

Deyib, gülüb, oturaydıq kəmali işrətilən,
Bəsani-ayinə, dil xali əz küdurət olaydı.

O qədr söhbət edəydik olaydı nisfülleyl,
Yataydı yar dizim üstə, başı rahət olaydı.

Kənarə can tək alaydıra o tifli-məsumu,
Bu şərtilən aramızda hicabi-ismət olaydı.

Təhəmmül etməyə bari-girani-möhnətə, kaş,
Özümdə səbrü təhəmmül, dizimdə taqət olaydı,

Günüzlü yaridə ya olmayaydı işvəvü naz,
Bu nazı çəkməyə ya inki, məndə halət olaydı.

Şərari-şəmilə gördüm yanaldı pərvanə,
Dedim: bu şivə, nolur əhli-eşqə adət olaydı.

Yetibdi təngə dəxi təngnayi-aləmdən,
Əcəl gələydi, bu Sərraf öləydi, rahət olaydı.

## NÖVHƏLƏR

Qurbanın olum, getmə, Əli, bircə dayan, dur,
Göz yaşıma bax, gör necə ardınca rəvandır.

Qardaş, nə anam var, nə bacım, xarü zəliləm,
Bu nərgisi-məstin kinü bimarü əliləm,
Gəl salma nəzərdən məni, rəhm eylə, dəxiləm,
Axır sənə bu dərdi-dilim şərhü bəyandır.

Sənsən, Əli qardaş, güli-gülzari-Mədinə,
Getsəm, pozular rövnəqi-bazari-Mədinə,
Bu halına ağlar hamı divari-Mədinə,
Qan ağlamayım mən necə, bağrım dolu qandır.

Səndən sora bir kəs mən ilə həmnəfəs olmaz,
Qeyr əz qəmü ənduhü bəla dadrəs olmaz,
Bu dərd, müsibət mənə dünyada bəs olmaz,
Düşdükcə anam yadə, işim ahü fəğandır.

Çün eyləmişəm dərdü bəla ilə əlaqə,
Bu bəstəri-qəmdən dəxi mən durmam əyağə,
Hərgiz deməərəm gər məni yandırma fərağə,
Bax gör dözə billəm, Əli, ondan sora yandır.

Bundan sora, qardaş, məni saldıqca xəyalə,
Ollam səri-zülfün kimi piçidə məlalə,
Müşkül görürəm bir də yetəm bəzmi-vüsalə,
Cismim əriyir, yerdə qalan bir quru candır,

Getsən cigərim lalə sifət qan olu sənsiz,
Məmurəyi-eyşim,Əli, viran olu sənsiz,
Bu şəhri-Mədinə mənə zindan olu sənsiz,
Gəl getmə gözüm nuru, ayaq saxla amandır.

Saldıqca sənin xali-xətin yadə vətəndə,
Bundan sora gəlləm, Əli, fəryadə vətəndə,
Heç kimsə qərib olmaya dünyadə vətəndə,
Qürbət qəmi, bimar qəmi eşqə yamandır.

Bu dərdılə mən olməyin axır nə rəvadır,
Çün şərbəti-vəslin dili bimarə şəfadır,
Fikri-xəmi-zülfün mənə zənciri-bəladır.
Zikri-ləbi-ləlin mənə bir ruhi-rəvandir.

Yanmış anasızlıq oduna bəs ki, bu canım,
Qalmıb qəmi-hicranə dəxi tabü təvanım,
Vardır yeri dünyanı tuta əşki-rəvanım,
Tufani-bəla çeşmeyi-çeşmimdən əyandır.

Sərrafi-günəhkarəm əya, qadiri-qəffar,
Gözdən tökərəm göz yaşı çün dirhəmi-dinar,
Bu kəsbdən öz mərhəmətinlə məni qurtar,
Cərmayəsi qəm, kəsbi ölüm, sudi ziyandır.

* * *

Olmusan can verməyə amadə, xoş gəldin, oğul,
Get boyun qurbanı, ey şəhzadə, xoş gəldin, oğul.

Yatmadım on səkkiz il, bir sən kimi can bəslədim,
Xuni-dil sərf eylədim, ləli-Bədəxşan bəslədim,
Mən səni, əlhəq, bu gündən ötrü qurban bəslədim,
Yaxşı vaxtımda yetişdin dadə, xoş gəldin, oğul.

Zəhmətin çəkdim, yetirdim mən səni bu həddivə,
İmdi var bir xahişim, verrəm qəsəm öz cəddivə,
Bir qabağımda yeri, eylim tamaşa qəddüvə,
həsrətim ta qalmaya dünyadə, xoş gəldin, oğul.

Bəs ki, cami-eşq ilən sərməstü mədhuş olmusan,
Şahidi-bəzmi-məhəbbətlən həmağuş olmusan,
Durma, get çün zövqü şövq ilən kəfənpuş olmusan,
Razıdır bu getməyə Leyla de, xoş gəldin, oğul.

Varsa gər başında sövdayi-bəla cəmiyyəti,
Ver başın başdan, Əli, kəs dərdi-sərdən ülfəti.

Bəs ki, əbruyi-kəci-canan ilə var nisbəti,
Aşina ol xəncəri-fuladə, xoş gəldin, oğul.

Çəkmə zəhmət, bir belə alati-cəngə olma bənd,
Qaşların üryan qılıncdır, zülfi-pürçinin kəmənd.
Qəm yemə doğransa cismin rizə-rizə, bənd-bənd,
Gəlmə hərgiz ney kimi fəryadə, xoş gəldin oğul.

Daim istərdim ola feyzi-şəhadət hasilin,
Lüləhülhəmd, oldu hasil aqibət kami-dilin.
Xəncəri-xunriz əlində müntəzirdir qatilin,
Rəhm qıl, rəhm etməyən cəlladə, xoş gəldin, oğul.

Tut əlində nəqdi-can, bazari-eşqə qoy qədəm,
Can ilən al hər tərəfdən gəlsə kalayi-sitəm,
Baxma, al hər qiymətə olsa mətai-dərdi-qəm,
Yox ziyanın bir belə sevdadə, xoş gəldin, oğlum.

Gərçi bu qürbət vilayətdə qəribi-bikəsəm,
Qalmışam avvarə, girdab üzrə bir xarü xəsəm,
Razıyam bundan belə bu canıva olsun qəsəm,
Peykərin başsız qala səhradə, xoş gəldin, oğul.

Səbt olub çün adıma, ruzi-əzəl tumari-qəm,
Görmədim aləmdə hərgiz dərdi-qəmdən fariqəm,
Tut əlimdən, qəddimi axır bükübdür bari-qəm,
Olmuşäm zülfun kimi üftadə xoş gəldin, oğul.

Afərin bu təbivə, Sərraf, əcəb sərşardır,
Sözdü bu, ya löləyi-tər, ya dürj-şəhvardır,
Bəs ki, şirindir, dəmadəm qabili-təkrardır,
Olmusan can verməyə amadə, xoş gəldin oğul.

## MƏHƏMMƏD HİDƏCI

*Məhəmməd Mövsuməli oğlu Hidəci 1853-cü ildə Zəncanm tüdəc kəndinda anadan olmuş, ilk təhsilini kənd məktəbində almışdır. 1879-1887-ci illərdə o, Qəzvində və Tehranda oxumuş, sonra müctəhid adını almaq üçün Nəcəf şəhərində təhsilini davam etdirmişdir.*

*1892-ci ildə təhsilini bitirib vətənə qayıdan Hidəci Tehrana köçmüş və ömrünün axırına kimi mədrəsədə müəllimlik etmişdir. Məhəmmad Hidəci 1928-ci ildə Tekranda vəfat etmişdir.*

*Hidəci üç dildə - Azərbaycan, fars və ərəb dilində əsərlər yazmışdır. Onun "Külliyyatt-divani-Hidəci" kitabı Zəncan şəhərində, sonralar isə şeirlər külliyyatı Təbrizdə üç dəfə çap olunmuşdur. Şaırin burada verilən əsərləri vs haqqında məlumat "Cənubi Azərbaycan ədəbiyyatı antologiyası" (I cild, 1981) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Danışma, zahid, əgər söz eşitmədim, - sənə nə?
Mən öz xudamə günah etdim, etmədim, - sənə nə?

Xuda behişti-bərini sənə verib, - mənə nə?
Sənin gümanıma, mən kamə yetmədim, - sənə nə?

Neçün səni söyərəm, getmişəm kəlisayə,
Deyildi Kəbə nəsibimdə, getmədim, - sənə nə?

Mənə əgər dedilər: Gəl qılaq dalıda namaz,
Baxıb səlahıma, bu əmrə bitmədim, - sənə nə?

Dedin: Mən eyləmərəm, iltifat dünyayə,
Yeritdim öz sözümü, ya yeritmədim, - sənə nə?

* * *

Xuda bilir ki, mən, ey dust, bivəfa deyiləm,
Yoxum xilafü xəta, dusti-bisəfa deyiləm.

Vəfavü mehr əgər özgələrdə az tapılar,
Mən özgələr kimi bimehrü bivəfa deyiləm.

Deməm "cəfa eləmə" mən, cəfayə təbıb var,
Vəli, bu qədri də müstövcibi-cəfa deyiləm.

Sənə nə etmişəm, ey dərdimin devası, bü gün,
Uzanmışam ölürəm, layiqi-şəfa deyiləm?!

Əlac yox, məni bu dərd öldürər, bilirəm,
Dur ey təbib ki, mən qabili-dəva, deyiləm.

Rizayəm ölməyə ta qurtulum, mənə birisi –
Gər ağlaya mən öləndən sora, riza deyiləm.

Qocalmışam döşümün, başımın tükü ağarıb,
Yoxum ürəkdə həvəs, talibi-həva deyiləm.

Mənə deyillə: Demə xalq içində "mən dəliyəm",
Yalan niyə danışım, düşməni-xuda deyiləm.

Mən öymənəm özümü, kibrü naz yox məndə,
Xudayə şükr ki, bu dərdə mübtəla deyiləm.

Əqilliyəm dəliyəm, mən pisəm, əgər yaxşı,
Elə buyam ki, varam, adəmi-riya deyiləm.

* * *

Ey könül, son gəl bu yari-bivəfadan əl götür,
Qoy səni bu dərd öldürsün, dəvadən əl götür!

Yar-yoldaşdan ümid üz, qövm-qardaş istəmə,
Yumgilən biganədən göz, aşinadən əl götür!

Oxşadın gül üzləri, öydün bu qarə gözləri,
Hasili noldu? Həvəs bəsdir, havadan əl götür!

Fitnədir eşqi-məcazi, fitnədən qorxmaq gərək
Eşqi-nəfsani xətadır, bu xətadan əl götür!

Ey məni gözdən salan mehrü vəfasız sevdiyim,
Gər yoxun mehrü vəfa, barı cəfadan əl götür!

Vədə vermişdin necoldu? Əhd qılmışdın hanı?
Kim dedi, sən əhdini sındır, vəfadan əl götür?

Zahidi-biçarə, bəsdir bir belə qıldın namaz,
Səbhəvü səccadənı yığ, bu riyadan əl götür!

Bir belə, ey xacə, yığdım mali-dünya, doymadın?
Ta nə vaxta hirs? Bu fani səradən əl götür!

Taciri-bədnəfəs, xoşzahır, peyəmbərdən utan,
Bəsdir, ey namərd, tənzilü ribadan əl götür!

Ey dadaş, keçdi cavanlıq mövsimi-surü sürur,
Yığ büsati-işrəti, seyrü səfadan əl götür!

Ta bilirsən, əqlə qulluq eylə, nəfsin burnun ov,
Düş pərilər ardına, divi-dəğadən əl götür!

Öz gümanımda budur: Mən aqilü fərzanəyəm,
Laf vurma, Hidəci, bu iddiadən əl götür!

**TƏMSİL**

*İxtisarla*

Eşitdim ki, ləklək gedib bir günü,
Nahara qonaq istədi tülkünü.

Onunçün bişirdi əriştə aşı,
Məsəldir: "Qıyınmaz varından kişi".

Lüleynə töküb aşı qoydu öyə,
Dedi: "Özgə qab yoxdur aş tökməyə.

Çənağı uşaq sındırıbdır bu gün".
Qabaqca uzatdı özü dimdiyin -

Lüleynə, dedi tülküyə: Meyl edüz!
Bu halı görüb tülkü oldu quduz.

Vəli, istəməzdi gətirsin üzə,
Kişi beylə dəmlərdə, xoşdur dözə.

Dedi ləkləkə: "Ey mübarəkliqa,
Bu gün mən, ğəzaya yoxum iştəha.

Dəyibdir soyuq, xoş deyil halətim,
Canım çimçəşir, giz-giz eylər ətim.

Vəleykən budur, bəndə ərzini sizə,
Gəlin sübh çağı nahara bizə.

Mənim halətim də səhər çaği çaq –
Olur, bir-biriylən bir az goblaşaq".

Dedi tülkiyə ləklək: "Ey mehriban,
Sizə gəlməyə hazıram hər zaman.

Vəleykən bu oldu mənimçün düyün
Ürəkdə ki, sən içmədin aş bugün".

Dedi ləkləkə tülkü: "Olma məlul,
Bu zəhmət ki, çəkdin mənə var qəbul.

Mürəxxəs olum mən, gedim mənzilə,
Səhər tez gəlin, sürtməyin əl-ələ".

Nahara bişirdi bulamac aşı,
Süpürdü, təmiz eylədi bir daşı.

Caladı onun üstünə aşı o çağ,
Dedi ləkləkə: "Meyl ediz dağ-dağ!

Heyfdir bu cür aş olsun sovuq.
Buyur, ta sovuq olmayıb, ol yavuq".

Baxıb aşü daşə, işi anladı,
Peşiman olub öz-özün danladı.

Ki, "Vurdum mən əvvəldə yoldaşıma –
Bu rəngi, bu gun gəldi öz başıma.

Bu, türkəməsəldir: Gəlir başına,
Hər ol kəs edər hər nə yoldaşına.

Dedi: "Neççə gün bundan ön, gəldi, zağ,
Bizim mənzilə, biz çəkmişdik cinağ.

Kömək etdi tarı, onu udmuşam,
Bu gün nəzr edib mən, oruc tutmuşam.

Mən öz nəzrimi sındıra bilməzəm,
Cəhənnəm oduna başarmam dözəm".

Dilin saldı tülkü siyirdi aşı,
Yaladı yerin, pak qıldı daşı.

Dedi: "Ey qadan özgələr canıma,
Bu aş olmadı heç güvara mənə,

Dedi ləklək: "Ey dusti-pakizəhal,
Bu mətləb deyil olgilən bixiyal.

Əzizim, gətirdim səninçün məsəl,
Birin gər qonaq etdin, olma dəğəl.

Ərənlər deyiblir ki, "Ev sahibi,
Qonağım qabağına qoysun qabı.

Yeməkdə qonağı gərək gözləyə,
Yeyim gər az oldu, özü az yeyə.

Uşağı qonaq yanına qoymasın,
Qonaq gər deyər "qoy gələ" uymasın.

Əgər üzdə hər qədr oxşar, öyər,
Ürəkdə uşağın atasın söyər.

Özü gər uşağın çox istər kişi,
Gorəkməz gələ özgələr də xoşi".

Bırı mən, uşaqdan gəlır çox bədım,
Uşaq sahibi anlamaz, mən nedim?

Uşağı pis öyrətmə, öydürmə çox,
Hər ol kim, uşağın öyər, ağlı yox.

Bu sözdən darılma, gərək ey dədə,
Uşağa gərək atası ədəb öyrədə,

Hər ol kəs ki, öz oğlunu öydürür.
Atasın, öləndən sora, söydürür.

Atadan, o xoşdur əgər anlaya.
Uşaq boş duranda döyə, danlaya.

Uşağa ol ustad verdi əmək,
Ki: söydü, acıqlandı, vurdu kötək.

Daş istər gəc olsun, gərəkdir pişə,
Geci döyməsən, bilmə gəlsin işə...

Səni gər döyər, dostdur Hidəci,
Ki, gəlməz işə döyməsinlər gəci.

## ƏBDÜLXALIQ YUSİF

*Mirzə Əbdülxalıq Yusif 1853-cü ildə Bakıda doğulmuşdur. O əvvəllər Aşqabadda ticarətlə məşğul olmuş, sonra köçüb ömrünün axırına kimi Bakıda yaşamışdır.*

*Atasının adı Yəqub olduğu üçün özünə "Yusif" təxəllüsünü götürən şair müasirlərindən Seyid Əzim, Molla Ağa Bixud, Əbdülxalıq Cənnati, Mirzə Səməndər və başqaları ilə dostluq etmiş, onlarla şeirləşmişdir. Əbdülxalıq Yusif 1924-cü il noyabrın 2-də vəfal etmişdir.*

*Onun Füzuli və digər sənətkarların təsirilə yazılmış aşiqanə qəzəllərdən ibarət kiçik divanı qalmışdır. Burada verilən şeirlər "Poetik məclislər" (1987) və "Deyliən söz yadigardır" (1990) kilablarından götürülmüşdür.*

### QƏZƏLLƏR

Taprmışam könlümü mən, türreyi-cananda imiş,
Ah, cəmiyyəti-dil zülfü-pərişanda imiş.

Nəzər et zülfü-rıxi-yarə ki, bir cənnətdir,
Laləvü sünbülü reyhan bu gülüstanda imiş.

Nitq şirinliyi ancaq o şəkər ləbdə əyan,
Kəbk rəfları tək ol sərvü xuramanda imiş.

Vədeyi-vəsl hara, söhbəti-hicran demə kim,
Ləzzəti sübhi-visalın şəbi hicranda imiş.

Yox imiş hiç tərəfdə sifəti-elmü kamal,
Ədəbü elmü kamal aləmi ürfanda imiş.

Gördüm ol mah liqa hüsıüni, fəhm etdim kim
Şövkətü şənü şərəf-cümləsı insanda imiş.

Surəyi-Yusifə get diqqət ilə eylə nəzər,
Yusifa, eşqü məhəbbət sözü Quranda imiş.

* * *

Çəməndə naləni ögrəndi mürğani-çəmən məndən,
Qəmalud olmağı kəsb etdi bərgi-yasəmən məndən.

Zi bəs ki, eylədim hicrində nalə, ey kəmanəbru,
Sərasər təngə gəldi hər nə var əhli-vətən məndən.

Qəmi-hicrinlə var, ey laləruyum, dağ sinəmdə,
Gərək təlim ala adabi-eşqi kunkən məndən.

Gəl, ey hicranı könlüm xanəsin viran edən dilbər?
Şikayət etməyək hərgiz nə mən səndən, nə sən məndən.

Cəfa səndən, əziyyət səndən, afati-bəla səndən,
Vəfa məndən, məhəbbət məndən, izhari-həzən məndən,

Daha bəsdir, bu qədri eyləmə ahü fəğan, ey dil,
Məbadə incisin ol Yusifi-şirinsüxən məndən.

* * *

Ta cəmalın rütbəsin, ey şux, idrak eylədi,
Rəşkdən gülşəndə gül pirahənin çak eylədi.

Ləlinin ta qönçeyi-noxiztək rəngin görüb
Yar yüzin ruxsari-pakın rəşk əflak eylədi.

Əşkim ol gündən gözümdən düşdü kim seylan edib
Tutiyayi-xaki-payın didədən pak eylədi.

Könlüm ol gündən bənə düşməndi kim səndən səva,
Gül tamaşası ani gördüm fərəhnak eylədi.

Olmasaydı vəslin öldürmüşdi hicranın məni,
Səmmi-hicri zövq-vəslin məhz-tiryak eylədi

Yusifin ta kim yetirsin kuyinə badi-səba,
Atəşi-eşqin vücudin yandırıb xak eylədi.

* * *

Hər kəsdə kəmal olmasa ürfanlığa dair,
Nitq edə gərək bisərü samanlığa dair.

Bidanişü ürfan necə hikmətdən urar dəm,
Ta olmasa xasiyyəti loğmanlığa dair.

Gər xatəmi bir əhrimən eylərsə də sirqət,
Onda tapılar canmı Süleymanlığa dair.

Öz-özünə bir şəxs müsəlman desə olmaz,
Gər olmasa ətvari müsəlmanlığa dair.

Tac ilə deyil səltənətü təxtilə dövlət,
Soltanda gərək baş ola soltanlığa dair.

Hər surəti insan olan olmaz özü insan,
İnsanda gərək fəhm ola insanlığa dair.

Sözdən bilinir gövhəri-əsliyyeyi-insan,
Dana danışırmı sözü nadanlığa dair?

Bəs fərq nədir adəmü heyvan arasında,
Hər gah ki, danışasan sözü heyvanlığa dair.

Bu əsrdə, gəl sən də pərişan sölə, Yusif,
Əsbab fərahəmdə pərişanlığa dair.

* * *

Sirri-eşqi demək olseydi, nihan etməz idim,
Dəxi gizlin bu qədər ahu fəğan etməz idim.

Göz yaşın saxlamaq olsaydı kəsərdim güzərin,
Dəxi ruxsarıma, ey sərv, rovan ettməz idim.

Dözmək olsaydı əgər dərdü qəmi-hicranə,
Gizlədərdim, onu xəlq içrə əyan etməz idim.

Hasil olsaydı əgər qeyrilə cəmiyyəti-dil,
O səri-zülfti-pərişanda məkan etməz idim.

Dolmasın əşk ilə çeşmim, edə bilsəydim əgər,
Özümü boş yerə rüsvayi-cahan etməz idim.

Baxa bilsəydim əgər qönçəyə sənsiz, bu qədər,
Fikri-ləlinlə dəxi bağrımı qan etməz idim.

Bilməsəydim var əgər tiri-məlamət Yusif,
Könlümü talibi-əbruyi-kaman etməz idim.

* * *

Ey güli-tər, məni xar eyləmədinmi? Elədin.
Şöhreyi-xürdü kübar eyləmədinmi? Elədin.

Salmadınmı yüzünə zülfl-siyahı? Saldın.
Günümü çün şəbi-tar eyləmədinmi? Elədin.

Almadınmı dili-sədparəmi əldən? Aldın.
Bir nigahilə şikar eyləmədinmi? Elədin.

Olmadımmı səri-kuyində mücavir?
Oldum məni sən hicrə düçar eyləmədinmi? Elədin.

Nalə bulbül kimi mən eylər ikən gül kimi sən,
Xəndə, ey laləüzar, eyləmədinmi? Elədin.

Tutmadınmı gedib əğyar ilə ülfət? Tutdun.
Məni əğyar ilə yar eyləmədinmi? Elədin.

Dustü biganəni yox, aləmi, ey mahliqa,
Mənə düşmən nə ki, var eyləmədinmi? Elədin.

Demədinmi ki, nigahımla səni qətl edərəm?
Mən ilə böylə qərar eyləmədinmi? Elədin.

Yusifi, ey guli-xoşbuyi-məhəbbət, hər dəm
Gülşəni-eşqə həzar eyləmədinmi? Elədin.

## SƏDİ SANİ QARABAĞİ

*Sədi Ocaqqulu oğlu Sani 1854-cü ildə Qarabağın Cinli kəndində doğulmuşdur. Təhsilini Şuşada və Türkiyənin Amasiya şəharində Hacı Mir Həmzə Seyid Nigarinin yanında almışdır. "Məclisi-fəramuşan" şairləri xüsusilə Həsənəli xan Qaradaği ilə yaxınlıq və dostluq etmişdir.*

*Klassik üslubda, Azərbaycan və fars dillərində yazmış, bədii irsinin bir hissəsi qalmışdır*

*İtedadlı və məhsuldar şaır Sadi Sani 25 yaşında, 1879-cu ildə vəfat etmişdir. Burada verilen örnəklər və şair haqqında məlumat "Poetik məclislər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Sən güllər ilə gül, gözəlim, gülşən içində,
Bülbüllər ilə mən də gəzim şivən içində.

Bir mərtəbədir kəsrəti-tirin ciyərimdə,
Guya görünür mərdü-şəci cövşən içində.

Çak etdin giribanını qönçə həsədindən,
Gördü məgər əndamını pirəhən içində?

Sinəm sitəmi-navəki-qəmzənlə dəmadəm,
Bir kürəyə bənzər ki, yanar ahən içində.

Zülffindən ol İsanəfəsin oylə zəifəm,
Bir riştəyə bənzər bədənini suzən içində.

Haşa ki, qoyam damənin əldən yerə, bəlkə,
Kəssən əlimi bil ki, gedər damən içində.

Bir güzgüdür aləm ki, anın əksi fənadır,
Sədi, nə bəqa istərəm anın mən içində?.

* * *

Saqiya, bir şur ilən gəl, şurləndir məclisi,
Bu xumarı rəf edib məxmurləndir məclisi.

Abi-tiğin təşnəsidir Kərbəlayi-sinələr,
Qana çalxa aləmi, aşurləndir məclisi.

Can edir çoxdan təcəllayi-camalın arzu,
Məhv qjl Musayi-əqli, Turləndir məclisi.

Hər "ənəlhəq" naləsi bir tari-zülfündən gəlir,
Eylə bir dar aləmi, Mənsurləndir məclisi.

İxtilat et cami-Cəmdən, kaseyi-Kavusdan,
Xələti, xaqani göy, fəğfurləndir məclisi.

Gəl, gəl ey ruhi-mücəssəm, məclisə bir ruh ver,
Zülməti rəf et aradan, nurləndir məclisi.

Gəh ləbinlə qıl xitabı, gah gözünlə qıl itab,
Gəh şəfa bəxş eylə, gəh rəncurləndir məclisi.

Qoy dağılsın zülfün üzrə, qoy yığılsın cəmini,
Marlandır sehr ilə, gəh murləndir məclisi.

Mütrüb, Allahı sevirsən, bir sürudi-eşq ilə,
Hər kəsə bir ruh nəfx et, surləndir məclisi.

Bülbüli-gülzari-Cəfərdir xülusi-sidqimiz,
Türfətül-eynilə bir teyfurləndir məclisi.

Saqi, ol meydən ki, ol mey kafərə olsun həram,
Hər kəsə bir kasə sun, kafurləndir məclisi.

Gəlməsə bu məclisə zahid, cəhənnəm, gəlməsin,
Sən qədəm bas, cənnət olsun, hurləndir məclisi.

Daş atar, məclis şikəst olmasın istər, Sədiya,
Zahidi-bədbin gözündən durləndir məclisi.

* * *

Gəldi bir qaşı kaman yanıma göyçək-göyçək,
Atdı müjgan oxunu canıma göyçək-göyçək.

Kirpiyin çaldı, nəzər eylədi süzgün-süzgün,
Batdı tiri-müjəsi qanıma göyçək-göyçək.

Dağılıb daireyi-arizə zülfün, zülfün,
Baisi-səbri-pərişanıma göyçək-göyçək.

Dəstə-dəstə tökülüb gül yüzə tellər, tellər.
Çəkdi ləşgər dili-viranıma göyçək-göyçək.

Nola insafa gələ ol şəhi-xuban, xuban,
Tutub ərzim, yetə divanıma göyçək-göyçək.

İstərəm bir şəhi-zərtəxt Qarabağ üzrə,
Basmağa möhrünü fərmanıma göyçək-göyçək.

Gövhəri-şerə mütəlla edərəm mədh içrə,
Gəlsə kim, təbi-gühərkanıma göyçək-göyçək.

Ey səba, eylə güzər töhfeyi-canı, canı,
Ərz qıl xidməti-cananıma göyçək-göyçək.

Bir şəhin dərgəhi-kuyində gəda olmağım,
Verdi artıqlıq əcəb şanıma göyçək-göyçək.

Küfri-zülfün məni zünnarpərəst qıldı, qıldı,
Saldı qəm rəxnəsnı imanına göyçək-göyçək.

Ruzi-əvvəldə fəda eyləmişəm, ey Sədi,
Canımı boylə gözəl xanima göyçək-göyçək.

* * *

Əvvəla şərti-gözəllikdə kamal olmalıdır,
Saniyən qaideyi-hüsnü camal olmalıdır.

Almağa al ilə bülbüllərin əqlin əldən,
Gül yanağında qızıl gül kimi al olmalıdrr.

Adəmin əqlini aldatmağa cənnət quşu tək,
Danə-danə ağ üzündə qara xal olmalıdır.

Əli nazik, beli nazik, dili nazik gözəlin,
Ozü şirin, sözü şirin, ləbi bal olmalıdır.

Kimə rast olsa edə əqli başından zail,
Qüvveyi-qəmzədə bir Rüstəmi-Zal olmalıdır.

Bu gözəllikdə kimin olsa gözəl məşuqu,
Ona dünyada nə dərdü, nə məlal olmalıdır,

Deyirəm: - Doğrusu, dünyadə o ev cənnətdir,
Onda kim, bir sənəmi-hurimisal olmalıdır.

Vaiza, boş yerə hökm eyləmə, biz bildiyimiz
Aşiqə busi-ləbi-yar həlal olmalıdır.

Yetər, ey tuti, nəbati bu qədər etmə tələf,
Çox danışdım, dəxi bir ləhzə də lal olmalıdır.

Sədiya, eydi-səadət sənə bir dilbərdir,
Adəm olsan, sənə nə mülk, nə mal olmalıdır.

# MƏHƏMMƏD TAĞI SİDQİ

*XIX əsrin ikinci yarısında yaşayib-yaratmış Məhəmməd Tağı Sidqi 1854-cü ildə Ordubad şəhərində doğulmuş, ilk təhsilini molla məktəbində almışdır. Gənclik illərində Cənubi Azərbaycana gedərək, orada ticarətlə məşğul olmuşdur. XIX əsrin 80-cı illərində Ordubada qayıdan M.T.Sidqi çayçı dükanı açaraq, bir müddət çayçılıq etmiş, sonra maarifçilik faaliyyəlinə başlamışdır. O 1892-ci ildə Hüseyn Sultan Kəngərlinski ilə birlikdə Ordubadda "Əxtər" adlı yeni üsulla məktəb açmış, buradakı fəaliyyəti naticəsində gözəl bir müəllim kimi məşhurlaşmışdır.*

*1894-cü ildə Naxçıvana köçən M.T.Sidqi buruda yeni bir məktəb açmışdır. Ədib "Tərbiyə" adlandırdığı bu məktəbdə ömrünün axırına qədər müəlimlik etmişdir. O, 1903-cü ilin dekabr ayında Naxçıvanda dünyasını dəyişmiş va orada dəfn olunmuşdur.*

*M.T.Sidqi bədii yaradıcılığa gənclik illərində başlamış, o zaman Ordubadda fəaliyyət göstərən "Əncüməni-şüəra"ədəbi məclisinin fəal iştirakçılarından və rəhbərlərindən biri olmuşdur. İlk şeirlərini klassik üslubda, qəzəl janrında yazan ədib sonralar da bu üslubu davam etdirmiş, lakin maarifçilik ideyalarının təbliğinə üstünlük verərək, əxlaqi-dıdaktik mənzumələr yaratmışdır. Bu şeirlərin bəziləri hələ XX əsrdə mətbuat səhifələrində, yaxud ayrı-ayrı kitabçalarda dərc olunmuşdur. Akademik İsa Həbibbəyli M.T.Sidqinin əldə olan əsərlərini, o cümlədən şeirlərini toplayaraq 2004-cü ildə Bakıda çap etdirmişdir. Buradakı nümunalər həmin kitabdan götürülmüşdür.*

## QƏZƏLLƏR

Tutiya eyləmişəm çeşmimə xaki-dərini,
Gözüm insaf eləsin, tökməsin əşki-tərini.

Mən nə bədbaxt idim, axtardı münəccim neçə ay,
Bürci-əqrəbdə tapıb taleyimin əxtərini.

Çeşmi-məstan, səfi-müjgan, iki əbruyi-kaman,
Bu alar can, o tökər qan, bu çəkər xəncərini.

Sındırıb dirbəri-məhparə könül şişəsini,
Qorxuram nazikdi, paralaya əllərini.

Deməyin, Sidqi neyçün yazmadı keyfiyyəti-hal,
Neyləsin, göz yaşı yazdıqca yuyar dəftərini.

* * *

Bir bəzm ola ki, bir mən olam, bir də yar ola,
Gülzar ola, çəmən ola, fəsli-bahar ola.

Hargiz o bəzmə olmaya biganənin yolu,
Əğyarlar, rəğiblər ondan kənar ola.

Saqi o bəzmdə döşəyə mey büsatını,
Mən məst olanda yar içə, məndən xumar ola.

Bır yanda cami-mey ola, bir yanda həm kabab,
Bir əldə stəkan ola, bir əldə tar ola.

Gəh qollarım həmayil ola yar boynuna,
Gahi üzüm üzündə, gözüm əşkbar ola.

Gahi əlin mən əlimə alam, gah zülfünü,
Gahi düşəm ayağına, cismin qubar ola.

Gahi çəkəm kənarıma, ləli-ləbin öpəm,
Biganələr kənara gedib, şərmsar ola.

Çoxlar yazıbdı şeri-dilvazi, inanmaram,
Sidqi kimi zamanədə mətləbi-nigar ola.

* * *

Xoşa o gün ki, mənim qəm günümdə yarım idin,
Ənisü munisü qəmxarü qəmgüsarım idin.

Gözümdə nur, könüldə sərvər, cismdə can,
Qərarü tabü təvan, səbrü ixtiyarım idin.

Kəməndi-ahımla damı-eşqə salmışdım,
Qəribə seyd eyləmişdim, əcəb şikarım idin.

Təfaxürüm var idi tacirani-eşq içrə,
Mətai-hüsnlə aləmdə bir etibarım idin.

Adın dilimdə, üzüm xaki-asitanmda,
Sərir nazda, bir şahi-tacidarım idin.

Na bais oldu vüsalə mübəddəl oldu fəraq?
Xoşa o gün ki, mənim eyşi-ruzigarım idin.

Nədəndi lale sifət bağrıma çəkibsən dağ?
Üzari-la ilə bir türfə laləzarım idin.

Ümidim özgəyə yox, ey səba, səni tar!
Söylə o yarə ki, axır ümidvarım idin.

Deyir fəğanla gülzari-hicrdə Sidqi,
Xoşa o gün ki, mənim yari-gülüzarım idin.

* * *

Xoşa sənilə həmavaz olduğum günlər,
Həmişə həmdəmü həmraz olduğum günlər.

Düşəndə yada könül suzla güdazə düşər,
Nəvayi-sazla dəmsaz olduğum günlər.

Başımda şuri-sər, zülf bəzm vəslində,
Hasari-qəleyi-şahnaz olduğum günlər.

Rəqiblər səri-kuyində xaksarımdı,
Sənin yanında sərəfraz olduğum günlər.

Edib təfəül, oxurdum qəzəl hüzurunda,
Lisani-Hafizi-Şiraz olduğum günlər.

Olurdu navəki-peykanına hədəf sinəra,
Qəbili-çəşmi-çəpəndaz olduğum günlər.

Qolumu boynuna hər dəm həmayil eylərdim,
Şikari-busəyə şəhbaz olduğum günlər.

Sürudi-şeirlə şairliyi şüar eylədim,
Qəmində qafıyəpərdaz olduğum günlər.

Həmişə tutmuşdun Sidqinin sözün mənzur,
O gülüzarə nəxərbaz olduğum günlər.

## QƏSİDƏ

Yenə fəsli-bahar oldu, gedib vəqti-xəzan, saqi,
Gətir tök cami-zərrinə şərabi-ərğəvan, saqi.

Ayaqdan saldı bu rənci-xumar, əldən qərar aldı,
Əlim tut bir ayaq ilə, aman, səd əlaman, saqi.

Xərabə könlümü bir bədayi-nab ilə abad et,
İçə piri-zəif ondan, olur bıllah cavan, saqi.

Tərəhhüm qıl, bu gün mey ver, məni qəmdən xilas eyle,
Diyari-eşqdə üşşaqə sənsən mehriban, saqi.

Hər iki nəşədə, hər nəşədən məqsudumuz meydir,
Bizə bu mətləbi kəşf eyləyib piri-muğan, saqi.

Alıbdır qönçeyi-qəmmazın qərar-ixtiyar əldən,
Kəsibdir işvəvü nazm, əcəb tabü-təvan, saqi.

Gəhi işvə, gəhi şivə, gəhi nazü gəhi qəmzə.
İmani-ixtiyarım getdi əldən, bir iman, saqi.

Telin vermə səbayə, şanə vurma, bəsdir, insaf et,
Xəmi-zülfündə dili-mürği qalıbdır aşiyan, saqi.

Ətayın can alır hər dəm, xətayin can əta eylər,
Dəhanın dürfəşandır, söhbətin arami-can, saqi.

Cavabın nüzhətəfzadır, camalın məhfilaradır,
Dişin dürri-müsəffadır, sözün arami-can, saqi.

Çəkilmiş guşeyi-bağə bu gün hər arifi-aşiq
Fərəh əfza olub, bəh-bəh, fəzayi-gülüstan, saqi.

Gülüstan bəzmi-xəlvətdir, zamani-eyşü işrətdir,
Çəməndə yar, yar ilə olubdur həmzəban, saqi.

Qonubdur sərv şax üstə, təranə başlayıb qümri,
Olubdur bülbüli-şeyda əcayib nəğməxan, saqi.

Açıb göz nərgisi-şəhla, edər nəzzarəyi gülşən,
Səba dəydikcə bağ içrə, açar qönçə dəhan, saqi.

Görüb yaquti-rəmmal tək şərabi-nabı cam içrə,
Həsəddən laləyi-həmra olubdur bağrı qan, saqi.

Bu gün könlüm kimi sünbül pərişan eyləyib zülfün,
Verər gusiyu-yari-nazəniniidən nişan, saqi.

Oxur bülbül, açıb gül, ...xürrəm. qönçələr xəndan,
Olubdur səbni-gülşən əşki-gülzari-cinari, saqi.

Nəvayi-bülbül, qümri, sədayi-mürği-xoşəlhan,
Edib zaği-siyahı bağdan damənkəşan, saqi.

Xarabat əhlinə daim münacat əhli tən eylər,
Olubdur zahidi-bədkiş bizdən bədgüman, saqı.

Gəlib meyxanəyə öz xirqəsin rəhni-şərab eytəm,
Nə fıkr ilə həmişə məscidi eytəyib məkan, saqi?

Ümidin bağlayıb mövlasına bu Sidqiyi-nalan,
Yetişsin dadə məhşərdə Əmirəlmöminin, saqi.

## AĞƏLİ BƏY NASEH

*Ağəli bəy 1856-cı ildə Şamaxıda doğulmuşdur. Təhsilini doğulduğu şəhərdə almış, ərəb, fars, rus dillərini mükəmməl bılmişdir. "Beytüs-səfa " ədəbi məclisinin gənc və fəal iştirakçısı olmuşdur. Bir müddət Şamaxıda məhkəma katibi vəzifəsində itmişdir.*

*M.Ə.Sabir və A.Səhhətin yaxın dostu, hətta şeir-sənətdə onların xeyirxah məsləhətçisi olmuşdur. A.Naseh 1914-cü ildə vəfat etmişdir. Əsərlərindən örnəklər F.Köçərlinin "Azərbaycan ədəbiyyatt" (II cild, 1981) və "Poetik məclisər" (1987) kitabından götürülmüşdür.*

### QƏZƏLLƏR

Görüm, ey zülfı-girehgir, pərişan olasan,
Mən tək aşüftələnib bisərü saman olasan!

Əridib könlünü gözdən tökən, ey çeşmü-ğəzal,
Müttəsil dideyi-aşiq kimi giryan olasan!

Ey ləbi-ləl, dodağım kimi qanın qaçsın,
Qanə dönmüş cigərim tək dönəsən qan olasan!

Düşəsən atəşə, ey xal, olasan xakistər,
Məcməri-sinədə bağrım kimi büryan olasan!

Ey səri-kuy, görüm zövqü səfasız qalasan,
Cülşəni-nüzhət ikən külbeyi-ehzan olasan!

Mənzil oldu manə duzəx, görüm ey gülşəni-hüsn,
Sərsəri-hadiseyi-dəhr ilə viran olasan!

Ey qədü qaməti-mövzün, əyilib incələsən,
Atəşi-eşqdə cismim kimi suzan olasan!

Ey dili-sadə, bu sövdadə sənindir təqsir,
Yanasan, odlanasan, xak ilə yeksan olasan!

Naseha, sən də fəğan eyləmə, canın çıxsın,
Kim dedi aşiq olub, hicrdə nalan olasan!

* * *

Nə meylim bağə, nə camü, səbuyə ehtiyacım var,
Cəmalın gülşənindən rəngü buyə ehtiyacım var.

Həvayi-zülf ilə dil mürği tərki-aşiyan etmiş,
Səbadən sormaq ilə cüstücuyə ehtiyacım var.

Hədisi-ləblərin təvizi-can etmək dilər könlüm,
O zülfi-pürxəmindən tari-muyə ehtiyacım var.

Nigarım bivəfa oldu, fənadən qeyri yox çarəm,
Əlaci-dərd üçün ol tündxuyə ehtiyacım var,

Şəhidi-navəki-müjkanın olmaqçun kəfənləndim.
Könül qanilə təğsilü vüzuyə ehtiyacım var.

Rəhi-eşqitıdə pamal olmadım, bietibar oldum,
Qübari-məqdəmindən abruyə ehtiyacım var.

Məni mən etmə, Naseh, gor qılam dilbər tamaşasın,
Nedim, hal əhliyəm, ruyi-nikuyə ehtiyacım var.

* * *

Varımdı sinədə dərdü qəmi-nihan, ölürəm,
Bu sirri eyləmədim kimsəyə bəyan, ölürəm.

Bacardığımca qəmi-eşqi-gizlədim, axır
Kəsildi taqətü səbrü qərari-can, ölürəm.

Səfayi-vəsldir aləmdə gərçi məqsudim,
Bəlayi hicrin ilə bağrım oldu qan, ölürəm.

Açılmamış gül idim gülşəni-nəzakətdə,
Bahari-ömrümü eşq eylədi xəzan ölürəm.

Başım bənəfşə kimi qəm dizində çox qaldı,
Vüsalın olmadı üstümdə sayəban, ölürəm.

Şikayət eyləmədim möhnəti-fəraqından,
Zəlilü xarü diləfkarü bizəban ölürəm.

Ümid idim çəkərəm dərdi-eşqi Naseh tək,
Qırıldı rişteyi-ümmid nagəhan, ölürəm.

**MURƏBBE**

Gözün qurbanı, ah etmə, qəmi-hicranə səbr eylə,
Əgər könlün dönə hicran əlindən qanə, səbr eylə,
Qəmi-eşq eyləyibdir çoxların divanə, səbr eylə,
Məhəbbət əhlisən, yan atəşi-suzanə, səbr eylə.

Qərar et, gözlərin abi-vüsal ilə pürab etmə,
Mükəddər xatir olma, ağlama qəlbin kabab etmə,
Yetərsən aqibət məqsudə, bunca iztirab etmə,
Olar kamınca axir, gərdişi-dövranə səbr eylə.

Məhəbbət aləmində agiqə daim vüsal olmaz,
Bu yolda aşiqi-biçarə hərgiz biməlal olmaz,
Fəraqə düşməyincə vəsli-dildarə macal olmaz,
Sitəmlər çəkməyə mötad olub mərdanə səbr eylə.

Gözüm, əhli-vəfalar yarın hicranından inciməz,
Əgər min nişə vursa növki-müjganından inciməz,
Qəmi-firqətlə canın versə canından inciməz,
Bəlayi-eşqi çək, bu dərdi-bidərmanə səbr eylə.

Dağıtma arizi-nəsrinə ol zülfı-mütərranı,
Dürəfşan eyləmə, ağlatma bunca çeşmi-şəhlanı,
O şəhla çeşminə olsun fəda min nərgisin canı,
Gəlir, əlbəttə, bir gün dərdü qəm payənə, səbr eylə.

Məhəbbət əhli, Naseh tənəyi-əğyardan qaçmaz,
Xətalar gəlsə güldən bülbülə gülzardan qaçmaz,
Yanar hicran ilə pərvanələr tək, nardan qaçmaz,
Vəfa göstər, nisar et canına canənə, səbr eylə!

## MÜNACAT

Xudavənda, yazarkən nəzmü nəsrü dəftəri-inşa,
Zəbanü fikrü təbü nitqim öz həmdinlə qıl guya.

Dəhan içrə zəbani, dildə təbi, başda övhami,
Hürufı-ləfzü mənani edibdir qüdrətin peyda.

Zəban gər həmd söylərsə, olur Məhmuddən tövfiq,
Kəlami təb tövlid etsə təbin xaliqi mövla.

Əgər olmazsa feyzin rəhnüma, daniş cəhalətdir,
Vücudi-elmü fəhmü əql verməz mənfəət əsla.

İnayətlər edib qıldın ədəmdən zatımı icad,
Gətirdin aləmi-nasutə batəşrif "kərrəmna".

Təcəlla etdi nurin mətləbi-qeybi-hüviyyətdən,
Bu nurin məzhəri olmaqla etdin cismimi əhya.

Cəhalətdən çıxıb kəsbi-kəmal etməkdə imdadım,
İlahi, səndən oldu, eylədin sən vaqifi-məna,

Bəşər növündən etdin, əhli-islam oldu əcdadım,
Lisanü qəlbimə nuri-hidayət eylədin ilqa.

Edib təftiş ədyanı, götürdüm dini-islamı,
Qəbuli-hökmi-Quran ilə tapdım neməti-üzma.

Şüur ilə müsəlmanəm, nə təqlidən əbu ümmə,
Dəlili-əqlü nəql ilə tutub qəlbimdə iman ca.

Könüldə şəkkü şübhəm yox yəqinən əhli-tövhidəm,
Həmişə söylərəm sidq ilə "amənna" səddəqna".

Übudiyyətdə, ğəffara, əgərçi çox qüsurum var,
Vəli göz yaşım ilə eylərəm qüfranın istida.

Kərıma, rusıyahəm, acızəm, ası, gunəhkarəm,
Məni rədd etmə dərgahından, eylə məğfırət əta.

Mənə qəlbi-səlini ənam edib taətdə sai qıl,
Sirati-müstəqim üzrə edim ehkami-din icra.

Kəlami-ləğvdən hifz et zəbanü təbimi, ya rəb,
Məni ətbai-ğavun etmə, çəşnü-qəlbimi əma.

Bu, rövşəndir ki, təbi-şair, əlbəttə, fəsad eylər,
Məni bu zümrədən öz lütfun ilə eylə istisna.

Muradım çün nəsihətdir, kəlamım dilpəzir eylə,
Süluki-şeirdə Nasehliyimdir məqsədi-əqsa.

## MƏŞƏDİ ƏYYUB BAKİ

*Məşədi Əyyub Hacı Ocaqqulu oğlu Baki 1866-cı ildə Şuşada anadan olmuşdur. Mollaxana təhsilindən sonra dövrünün müqtədir alimlərindən hesab edilən Mirzə Kərim Hacı Məhəmməd oğlu Qarabağidən yeddı ilə yaxın ədəbiyyatdan xüsusi dərs almışdır. O, Şərq poeziyasının qayda-qanunlarını mükəmməl öyrənmişdir. Baki 1909-cu ildə vəfat etmişdir.*

*"Məclisi-fəramuşan"ın üzvlərindən olan Baki əsərlərini Azərbaycan və fars dillərində, həm klassik, həm da xalq şeri üslubunda yazmışdır. Onun "Riyazül məhəbbət" ("Məhəbbət bağçası") adlı divanı Respublika Əlyazmaları İnstitutunda saxlanır.*

*Şairin burada verilən əsərləri "Poetik məclislər" (1987) kitabından və Mir Möhsin Nəvvabin "Divan"ından (1999) götürülmüşdür.*

### QƏZƏLLƏR

Viran olu könlüm evi viranə görəndə,
Viranə virantər olu viranə görəndə.

Billahi, tutub od, yanaram şəm tək axir,
Hər yerdə ki, xakistəri-pərvanə görəndə.

Aşüft oluram zülfi-pərişan kimi hər dəm,
Könlüm kimi hər yerdə sınıq şanə görəndə.

Qəmnak olu hər kim məni, ya şerimi görsə,
Aqil olu divanə çü divanə görəndə.

Yüz hiylə ilə zahidi-xudbinin əlində
Kafər oluram səbheyi-səddanə görəndə.

Yox məndə nə mey rəğbəti, nə cəzbeyi-saqi,
Qan ilə dolar çün məni peymanə görəndə.

Dərd əhü oturub bir neçəsi badə içəndə,
Çox dərd olumuş onlara biganə görəndə.

Nəvvab, Qaradaği, deyəin Növrəsə bari,
Kəc fikrə ki, o düşməyə meyxanə görəndə.

Baki gözü peyvəstə tökər əşki-xunalud,
Hər yerdə ki, yox təxtəpuşi xanə görəndə.

* * *

Deyin o yara, edir aşiqin səfər, gəlsin,
Şikənci-əqrəb ara gizlədib qəmər, gəlsin.

Ölüm yetibdi, səba, az qalıb fədası olam,
Söylə ki, başımın üstə o didə tər gəlsin.

Gülüzlülər nə ki, var, dövrəmə urub halə,
Gözəllər içrə o yan gözüm gəzər, gəlsin.

Nə Kəbə qiblə bilib döndəriblə üzümü,
O taqi-qaşını, billah, üzüın görtər, gəlsin.

Şəhadətin yerinə adın əzbər eyləmişəm,
Təğafül eyləməsin, vəqt kim, keçər, gəlsin.

Bu həsrət etməyimə olmasın deyin razı,
Görüm üzünü, verim can, yenə gedər, gəlsin.

Gərək məni öz əlilə bu gün məzara qoya,
Şikəstə Baki Ölür, eyləyin xəbər, gəlsin.

* * *

Məni eşq əhlinin divanına divanə yazmışlar,
Könül mülkün, əziziın, dərdi-eşqə xanə yazmışlar.

Könül xaki-bəladan, abi-qəmdən çün xəmir oldu,
Bu viran olmuşu ol vəqtdən viranə yazmışlar.

Qədim nun, taleim dun, həm sirişkim xun, özüm məhzun
Görən dibaçeyi-ömrümdə, aya ta nə yazmışlar?

Müsəlmanam, məni bidin edən bır türfə tərsadır,
Çıxardın adəmi yoldan, bəli, bir danə yazmışlar.

Dağılmış mubəmu, hər riştəsi bir nalə saz eylər,
Əzəl gündən könlümü pürpiçi-tarə şanə yazmışlar.

Üzündə ayeyi-mövtü həyatı görməyib guya?
Qədər katibləri ol ayəni Quranə yazmışlar.

Yanar, cana, vücudum, dudi əsla aşikar olmaz,
Deyən şəmi-bəlaya Bakinin pərvanə yazmışlar.

**ŞİKƏSTƏLƏR**

Qalmışam pərvanə tək,
Odlanə-odlanə mən.

Rəhm et məni-müztərə,
Yığılmış dərd bir yerə,
Deyim ya bir kafərə,
Ya bir müsəlmanə mən.

Bilmişəm qəm çarasın,
Yarım telin darasın,
Qanlı ciyərparasın
Eyləmişəm şanə mən.

Deyiz, töküm qanımı,
Faş olsun imanımı,
Tapşırmışam canımı,
Zülfii pərişanə mən.

Qudurmusan, azmısan,
Ölüm hökmün yazmısan,

Qəbrimi gen qazmısan,
Gedim qəbristanə mən.

Aşqi məhəbbət basıb,
Boynumdan zünnar asıb,
Nahaq yerə əl basıb,
And içim Quranə mən?

Kafər olma, dinə gəl,
Dinsizsən, ayinə gəl,
Xətanı, qoy, Çinə gəl,
Qoy gedim İranə mən.

Pozuldu can gülşəni,
Öldürdü bu dərd məni,
Vəfasızsan, get, səni,
Tapşırdım Quranə mən.

Gül, çəməndə gül kimı,
Günüm keçsin il kimi,
Həsrətlə bülbül kimi,
Baxım gülüstanə mən.

Peygəmbərsən, tarısən,
Dındırmə əğyarı sən,
Qoyma, əgər yar ısən,
Qalım yanə-yanə mən.

Çərxi-fələk mahisən,
Çox böyük dərgahisən,
Əgər sən Allah isən,
Səcdə edim hayanə mən?

Gah ağlayıb, gah gülüb,
Gahi göz yaşım silib,
Baki tək həsrət ölüb
Yetmədim cananə mən.

## BAYATILAR

Düz dağlar, əyri dağlar,
Düzəlməz əyri dağlar,
Gözün dağı düz çəkər,
Qaşların əyri dağlar.

Bülbül evi qəfəsdir,
Di gəl, axır nəfəsdir,
Bir gözüm sənə qurban,
Bir gözüm mənə bəsdir.

Yar getdi, ağla dağlar,
Aləmi dağla dağlar,
Yar getdi, can da getdi,
Gözlərim bağla, dağlar!

Mən aşiqəm, göz yara,
Könül yara, göz yara,
Nə xoşdur can verəydim,
Baxa-baxa göz yara.

Bağ verər arzum barı,
Əl yetmir üzüm barı,
Nə can çıxır, qurtarır,
Nə görür gözüm yan.

Dərdlilər hər dəm ağlar,
Həm sızıldar, həm ağlar,
Gör nə günə qalmışam,
Əhvalıma qəm ağlar.

İşim düşüb bəndə yar,
Canım qalıb səndə yar,
Məni Allah öldürsün,
Sən də qurtar, mən də yar.

Gözlərin qara dağlar,
Dağ çəkib qara dağlar,
Həsrət ölüb Əyyubun,
Geyib göy, qara dağlar.

**NÖVHƏ**

Şiələr, qanə batıb ol şəhi-lövlak bu gün,
Fatimə başın açib, sinə elər çak bu gün.

Düşdü atdan yerə çün padşəhi-Kərbübəla,
Əmri-İlahi yetişib cümlə mülk geydi qarə,
Lərzəyə düşdü, bəli, küngireyi-ərşi-Xuda,
Tirə-tar oldu hava, titrədi əflak bu gün.

Şiələr etdi imam əhdinə peyman, axır,
Verdi yüz şövq ilə yetmiş iki qurban, axır,
Bir həya eyləmədi Şümri-bədərkan, axır,
Başını kəsdi susuz, eyləmədi bak, bu gün.

Ya Hüseyn, hansı peyğambər belə fərman verdi?
Oğlunu, qardaşını ümmətə qurban verdi?
Gün qabağında, qum üstündə susuz can verdi,
Ağladı halətinə pak ilə napak bu gün.

Əhli-Quran eylədi hörmət əcəb Quranə,
Rükni-məzbəb pozulub, rəxnə yetib imanə.
Od düşüb bargəhi-dinə, olub viranə,
Yandı dibaçeyi-şər içrə o əmlak bu gün.

Kərbəla vaqiəsi etdi qədər qəddini xəm,
Tarmar oldu qəza mülkü, pozuldu aləm.
Məhv olub lövh xətti, ah ki, süst oldu qələm,
Qursi-xurşid edər seyrdən imsak bü gün.

Kərbəlayə baş açıq həzrəti-İsa gəldi,
Başın əldə gətirib, həm Zəkəriyya gəldi,
Yusif, Yunis, Əyyub ilə Yəhya gəldi,
Ənbiyalar başına tökdü fələk xak bu gün.

Dəmbədəm başə vurub nalə edər Mikayil,
Ağlayır sübhü məsa şivən ilə İsrafıl.
Əli qoynunda qalıb həşrə kimi Cəbrayil
Bəski Peyğəmbər olub ərşdə qəmnak bu gün.

Naləvü şurə dəxi kulli-cəmadət gəlib,
Va Hüseyn, zikri ilə dərdə nəbatat gəlib,
Həm nəvayə dil açıb, cümleyi-zərrat gəlib,
Ağıl matəmzad olub, ağladı idrak bu gün.

Qisseyi-Kərbübəladan qəmər olmuş münşəq,
Qara xətt ilə yazılmış o səbəb kəlmeyi-həqq.
Qüsseyi-Kərbübəlanı yaza bilməz mütləq,
Nitqi-Baki nə qədər kim ola çalak bu gün.

## MOLLA ZEYNALABDİN SAĞƏRİ

*XIX əsr şairlərindən olan Sağərinin tərcümeyi-halı haqqında məlumat olduqca azdır. Seyid Əzim Şirvani öz təzkirəsində onun adını çəkmiş va bir şerini vermişdir. M.Müstəhidzadə isə "Riyazül-aşiqin" kitabında Sağərinin Şuşada doğulduğunu, Axund Molla Sadıqdan dərs aldığını, ömrünün axırına qədər müdərrislik və şairlik etdiyini, divan yaratdığım bildirir. O, öz təzkirasində Sağərinin həm türkcə, həm də farsca şeirlərindən yerləşdirmişdir ki, buradakı nümunələr onun əsasında verilir.*

### QƏZƏLLƏR

Ey könül, məhv eylə dildən vəsli-canan surətin,
Nəqş qıl qəlbində bundan böylə hicran surətin.

Adət eylə, ey könül, hicranü dinə yanmağa,
Gəl fəramüş eylə ol mehri-dirəxşan surətin.

Yox vəfası dilbərin, hərgiz vəfa etməz sənə,
Eyləmə hərgiz təmənna mehri-canan surətin.

Kafır oldun zülfı-pürçinindən, ey dil, tövbə qıl,
Gəl çıxar dildən bu gün zülfi-pərişan surətin.

Ey könül, eşqi-həqiqətdən dəm ur, bir həqqi tap,
Xatirindən məhv qıl ol mahi-Kənan surətin.

Yandı pərvanə tək balü-pərin hicr oduna,
Etməyə hər kəs cahanda şəmi-suzan surətin.

Gəl həyatından götür əl, Sağəri, xoşdur məmat,
Arizü qılma ləbü ləli-zənəxdan surətin.

Tərəhhüm eyləməz hərçənd gülrüxi-yarə yalvarram,
Nedim, bir güldən ötrü hər zaman min xarə yalvarram.

Vüsalından olub məhrum, hicran atəşi üzrə,
Fəğan, nalə ilə yaş töküb əğyarə yalvarram.

Səni görmək mənə mümkün deyil, bir rəhm yox səndə,
Səri-kuyində hər ləhzə dəri-divarə yalvarram.

Salıbdır əqrəbi-zülfün qəmər dövründə seyr eylər,
Qılıb könlüm pərişan, zülfi-ənbərbarə yalvarram.

Könül mürğini seyd etdi iki cəllad cadusu,
Xilas etməz, nədim, ol qəmzeyi-xunxarə yalvarram.

Səbahü şamımı qılmış bərabər zülfü rüxsan,
Gəhi ol sübhə, gahi türreyi-tərrarə yalvarram.

Doyubdur Sağəri cana deyin dərdini cananə,
Olubdur xanə viranə, gedib küffarə yalvarram.

* * *

Könül mürğini mən ol türreyi-tərrarə tapşırdım,
Dili-divanəni ol zülfi-ənbərbarə tapşırdım.

Ze bəs fəryad qıldı, mürği-dil sinəmdə qan oldu,
Könül pərgaləsin ol qəmzeyi-xunxarə tapşırdım.

Mənim cani-dilim hərgiz cahanda görmədi rahət,
Təriqi-eşqdə canü-dili mən yarə tapşırdım.

Könül, gəl tövbə qıl kim, bütpərəstlikdən səmər yoxdur,
Dəxi bəsdir səni mən neçə il dildarə tapşırdım.

Mənə müşkil ki, bundan belə qalmaq dari-dünyadə,
Gülimi öz əlimlə mən verib bir xarə tapşırdım.

Atanda qəmzə oxun sinəmə min naz ilə canan,
Xədəngi-tiri-peykanın dili-bimarə tapşırdım.

Alıbdır dini-imanımı əldən, Sağəri, ol büt,
Edib qəflət, əcəb, imanı küffarə tapşırdım.

* * *

Gözün tək, gözlərim nuru, mənim bimardır könlüm,
Camalın gülşənində əndəlibi-zardır könlüm.

Həzər qıl, vurma şanə zülfı-pürçinə sən, ey Leyli,
Müsəlsəl zülfı-pürçinində Məcnun vardır könlüm.

Ləbi-çeşmin xəyali qanə döndərmiş könül mülkün,
Əyaği-badə tək qandan dolub, sərşardır könlüm.

Xəyali-türreyi-pürçin ilə şamım səbah olmaz,
Qəsəm ol türreyi-mişkinə, daim tardır könlüm.

Səri-ku itlərimə hər nə var təqsim qıldım raən,
Təsəvvür eyləmə, ey dilrüba kim, vardır könlüm.

Gözümdə xabilə bir istirahət yox mənə hər dəm,
Sənin fikri-xəyalınla əcəb bıdardır konlüm.

Qocalıq yayə döndərdi qədin, ey Sağəri, likən
Könül hərgiz qocalmaz, aşiqi-didardır könlüm.

* * *

Vur şanəni ol zülfı-pərişanə dağılsın,
Tellər tökülüb cümlə biyabanə dağılsın.

Gəl vermə mənə vədeyi-vəsli, həzər eylə,
Qorxum budu kim, xalqa əfsanə dağılsın.

Çak eyləmə qətlimdə giriban üzarım,
Açma o qədər ruyini, biganə dağılsın,

Cəm eyləmə zülfü üzünə, eylə pərişan,
Qoy əbr kimi mehri-dirəxşəndə dağılsın.

Beyti-məhəni-hicridə yandı dili-zarım,
Ey vəsl, mədəd qıl ki, bu kaşanə dağılsın.

Min dil cəm olub zülfı-pərişanına mənsiz,
Qoy ah çəkim, hər biri bir yanə dağılsın.

Hicran ələmi qıldı fəramuş vüsalı,
Ey Sağəri, ah eylə bu viranə dağılsın.

* * *

Vay o gündən kim, nəzərdən mahrüxsarım gedə,
Vəsl evin viran edib qəhr ilə dildarım gedə.

Beylə kim yoxdur qərarım bir zaman dildarsız,
Qət olur, biliah, həyatım tərk edib yarım gedə.

Çıxsa canım cismidən müşkül deyil hərgiz mən,
Bir qiyamətdir mənə gər zülfı-zünnarım gedə.

Ey könül, kam al vüsalından, məqami-vəsldir,
Qorxuram dövri-fələkdən yari-qəmxarım gedə.

Dur, qənimətdir, dolan başına, ey dil, dilbərin,
Xofum ondandır, könül, bu sərvi-rəftarım gedə.

Ey gözüm, eylə nəzər rüxsari-yarə, qorxuram
Kim, məni tənha qoyub ol çeşmi-xümmarım gedə.

Sağari oldu kabab hicran evində atəşə,
Tərsim ondandır könüldən naleyi-zarım gedə.

## QAYNAQLAR


1. Aşiq Məhəmməd bəy. Şeirlər. Toplayanı və tərlib edəni Ənvər Çingizoğlu. Bakı, "Şuşa" nəşriyyatı, 2000, 48 s.
2. Azərbaycan Klassik Ədəbiyyatı Kitabxanası. 20 cilddə. VII cild. Tərtibedənlər: R.Qənbər qızı, M.İsmayılzadə. Bakı, "Elm" nəşriyyatı, 1988, 568 s.
3. Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir. I cild. Tərtibedəni Hüseyn əfəndi Qayıbov. Çapa hazırlayanı Cahangir Qəhrəmanov. Bakı,"Elm" nəşriyyatı, 1986, 360 s.
4. Bakıxanov Abbasqulu ağa. Bədii əsərlər. Tərtib edəni Məmmədağa Sultanov. Bakı, Azərbaycan Dövlət Nəşriyyatı, 1986, 360 s.
5. Bakı Məşədi Əyyub. Riyazül-məhəbbət. Tərtibçi: Raqub Kərimov.Bakı, "Şuşa" nəşriyyatı, 2000, 192 s.
6. "Cənub ulduzları". Şeirlər və poemalar. Tərtib edənlər Əbülfəzl Hüseyni, Yolçu Piriyev. Bakı, "Yazıçı" nəşriyyatı, 1924, 272 s.
7. Cənubi Azərbaycan ədəbiyyatı antologiyası. 3 cilddə, I cild. Tərtib edənlər: Mirəli Mənafı, Zahid Əkbərov, Rəfıqə Qasımova. Bakı, "Elm" nəşriyyatı, 1981, 384 s.
8. "Dahilərin göz yaşı. Mərsiyələr". Tərtib edənlər: M.Əliyev, A. Ramazanov. Bakı, "Elm" nəşriyyatı, 1990, 112 s.
9. "Deyilən söz yadigardır". Toplayanı və tərtib edəni: Cəfər Rəmzi İsmayılzadə. Bakı, "Yazıçı" nəşriyyatı, 1981, 332 s.
10. "Deyilən söz yadigardır". Toplayam və tərtib edəni: Cəfər Rəmzi İsmayılzadə. Bakı, "Yazıçı" nəşriyyatı, 1987, 352 s.
11. Didə Mirzə Nəsrullahbəy. Bahariyyə. Çapa hazırlayan: Rəşid Qurbanbəyov. Bakı, "Azərbaycan Universiteti" nəşriyyatı, 2004, 86 s.
12. Heyran xanım. Seçilmiş əsərləri. Bakı, Azərbaycan Dövlət nəşriyatı. 1961, 224 s.
13. Xəzani Mir Mehdi. Əsərləri. Tərlib edənlər; Nəcəf Quliyev, Raqub Kərimov. Bakı, Azərnəşr, 1989, 128 s.
14. Kəminə Fatma xanım. Şeirlər. Toplayanı: Əzizə Cəfərzadə. Bakı, "Gənclik" nəşriyyatı, 1971, 97 s.
15. Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı. 2 cilddə. 1 cild. Transliterasiya edəni: Ruqiyyə Qənbər qızı. Bakı, "Elm" nəşriyyatı, 1978, 599 s.
16. Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı. 2 cilddə. 1ci cild. Transliterasiya edəni: Ruqiyyə Qənbər qızı. Bakı, "Elm" nəşriyyatı, 1981, 460 s.

17. Qarabaği Mirzə Həsən Yüzbaşov. Seçilmiş əsərləri. Tərtib edəni: Nəsrəddin Qarayev. Bakı, "Şuşa" nəşriyyatı, 2000, 184 s.

18. Qaradağı Xan Həsənəli ağa. Fələyin bir belə dövrü olacaqmış... Şeirlər, tərcümələr, tarixi salnamə. "Azərbaycan Milli Ensiklopediyası" NPB, 2003, 280 s.

19. Qasir Mirzə İsmayıl. Şeirlər. Toplayanı: İslıaq Axundov. Tərtib edənlər: T.Nurəliyeva, P.Kərimov. Bakı, "Yazıçı" nəşriyyatı, 1988, 198 s.

20. Məxfi Məhəmmədəli bəy. Qəzəllər. Tərtib edəni: Raqub Kərimov. Bakı, "Şuşa" nəşriyyatı, 2001, 216 s.

21. Müctəhidzadə Məhəmmədağa. Riyazül-aşiqin. Çapa hazırlayan: Əkrəm Bağırov. Bakı, "Azərbaycan" nəşriyyatı, 1995, 248 s.

22. Natəvan Xurşidbanu. Əsərlər. Tərtib edəni: Bəylər Məmmədov. Bakı, "Yazıçı" nəşriyyatı, 1984, 100 s.

23. "Necə qan ağlamasın daş bu gün". Mərsiyə, qəsidə və sinəzənlər. Tərtibçi: İ.Qəribli. Bakı, "Yazıçı" nəşriyyatt, 1993, 144 s.

24. Nəbati Seyid Əbülqasim. Əsərləri. Tərtib edəni: Əbülfəzl Hüseyni. Bakı, Azərbaycan EA nəşriyyatı, 1968, 334 s.

25. Nəvvab Mir Möhsün. Təzkireyi-Nəvvab. Çapa hazırlayanı: Əkrəm Bağırov. Bakı, "Azərbaycan" nəşriyyatı, 1998, 560 s.

26. Nəvvab Mir Möhsün. Divan. Çapa hazırlayanlar: Əli Məmmədbağır-oğlu, Arif Ramazanov, Raqub Kərimov. Bakı, "Şuşa" nəşriyyatı, 1999, 192 s.

27. Növrəs Mirzə Əlasgər. Şeirlər. Tərtibçilər: Şamil Cəmşidov, Növrəs Növrəsli. Bakı, "Yazıçı" nəşriyyatı, 1985, 158 s.

28. Ordubadi Fəqir. Ağlar qələnı əlimdə. Tərtib edəni: Əsgər Qədimov. Bakı, "Yazıçı" nəşriyyatı, 1989, 232 s.

29. "Poetik məclislər". Toplayanı və tərtib edəni: Nəsrəddin Qarayev. Bakı, "Yazıçı" nəşriyyatı, 1987, 528 s.

30. Raci Hacı Əbülhəsən. Seçilmiş əsərləri. Tərtib edəni: Hafız Abıyev. Bakı, "Sabah" nəşriyyatı, 1992, 214 s.

31. Seyid Nigari. Xaki-paynı taci-sərim. Tərtib edən: Yəhya Çələbi. Bakı, "Azərbaycan" nəşriyyatı, 2004, 336 s.

32. Şakir Baba bəy. Seçilmiş əsərləri. Tərtib edəni: Fərhad Yəhyayev. Bakı, "Yazıçı" nəşriyyatı, 1985, 72 s.

33. Şirvani Seyid Əzim. Əsərləri. 3 cilddə. I cild. Tərtib edəni: Süleyman Rüstəmov. Bakı, Azərbaycan EA Nəşriyyatı, 1967, 742 s.

34. Şirvani Seyid Əzim. Əsərlori. 3 cilddə. III cild. Tərtib edəni: Süleyman Rüstəmov. Bakı, "Elm" nəşriyyatı, 1974, 500 s.

35. Tərbiyət Məhəmmədali. Daneşməndani-Azərbaycan. Bakı, Azərbaycan Dövlət nəşriyyatı, 1987, 464 s.

36. Vaqif Əbülhəsən Kamranzadə. Şeirlər. Tərtib edəni: Cənnət Nağıyeva. Bakı, 2000, 55 s.
37. Vardani Mücrim Kərim. Sünbülüstan. Toplayanı və tərtib edəni: Əzizə Cəfərzadə. Bakı, "Gənclik" nəşriyyatı, 1978, 80 s.
38. Vazeb Mirzə Şəfı. Nəğmələr. Bakı, Uşaqgəncnəşr, 1961, 126 s.
39. Vazeh Mirzə Şəfı. Şeirlərməcmuəsi. Tərtib edəni: H.Məmmədzadə.Bakı, "Elm" nəşriyyatı, 1987, 240 s.
40. Zakir Qasım bəy. Əsərləri. Tərtib edəni: S.Rüstəmov, Bakı, Azərbaycan EA nəşriyyatı, 1964, 564 s.

# MÜNDƏRİCAT

## KAZIM AĞA SALİK



## QASIM BƏY ZAKİR



## MİRZƏ BAXIŞ NADİM

## MİRZƏ İSMAYIL QASİR



## MÜCRİM KƏRİM VARDANI



## ƏNDƏLİB QARACADAĞİ

## MİRZƏ MEHDİ NACİ



## AŞIQ PƏRİ



## MİR MEHDİ XƏZANİ



## MƏHƏMMƏD XƏLİFƏ ACİZ

## ƏBÜLQASIM NƏBATİ



## MƏHƏMMƏD ƏMİN DİLSUZ



## MİRZƏ MƏHƏMMƏD TAĞI QUMRİ

## MİRZƏ MEHDİ ŞÜKUHİ



## MOLLA AĞA BİXUD



## ƏBÜLHƏSƏN RACİ

## XURŞİDBANU NATƏVAN



## MİR MÖHSÜN NƏVVAB



## MİRZƏ MƏHƏMMƏD KATİB

## MƏMO BƏY MƏMAİ

Q ə z ə l l ə r



M ü x ə m m ə s



## MİRZƏ NƏSRULLAH BƏY DİDƏ

Q ə s i d ə



M u x ə m m ə s



## BAHAR ŞİRVANİ

Q ə z ə l l ə r



## SEYİD ƏZİM ŞİRVANİ

Q ə z ə l l ə r

## İBRAHİM BƏY AZƏR



## MİRZƏ ƏLƏSGƏR NÖVRƏS



## HACI AĞA FƏQİR ORDUBADİ

## FATMA XANIM KƏMİNƏ



## ABDULLA BƏY ASİ



## İSMAYIL BƏY NAKAM

## MİRZƏ RƏHİM FƏNA

Q ə z ə l l ə r



## ŞAHNİGAR XANIM RƏNCUR

Q ə z ə l l ə r



G ə r a y l ı



## MOLLA MƏHƏMMƏD ZÖVİ

Q ə z ə l l ə r



## MİRZƏ ƏLİ XAN LƏLİ

Q ə z ə l l ə r



## ƏBÜLHƏSƏN VAQİF

Q ə z ə ll ə r

## SEYİD RZA SABİR



## MİRZƏ İSA XƏYALİ



## MƏHƏMMƏDAĞA CÜRMİ



## AĞADADAŞ SÜRƏYYA

## HƏSƏNƏLİ XAN QARADAĞİ



## ŞƏHRİYAR ŞİRVANİ



## HACI RZA SƏRRAF

## MƏHƏMMƏD HİDƏCİ



## ƏBDÜLXALIQ YUSİF



## SƏDİ SANİ QARABAĞİ



## MƏHƏMMƏD TAĞI SİDQİ



## AGƏLİ BƏY NASEH

**MƏŞƏDİ ƏYYUB BAKİ**



**MOLLA ZEYNALABDİN SAĞƏRİ**

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səhifələyicisi: *Rəşad Həmidov*

Korrektor: *Pərinaz Səmədova*

Yığılmağa verilmişdir 08.11.2004.Çapa imzalanmışdır 12.05.2005.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 26,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 117.

Kitab "PROMAT" mətbəəsində çap olunmuşdur.